**Azərbaycan MEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutu elmi şurasının 23-24 noyabr 2012-ci il tarixli 10 №-li iclasının qərarı ilə nəşr edilir.**

**Nəşrə hazırlayan və elmi redaktoru:**

**Vüsalə MUSALI**

*filologiya üzrə fəlsəfə doktoru*

**Qarayev N.S. XIX əsr Azərbaycan ədəbi məclisləri. Bakı, Nurlan, 2012, 325 s.**

Monoqrafiyada XIX əsrdə Azərbaycanın müxtəlif şəhərlərində fəaliyyət göstərmiş «Divani-hikmət», «Gülüstan», "Əncümənüş-şüəra», «Fövcül-füsəha», «Beytüs-səfa», «Məclisi-üns», «Məclisi-fəramuşan», "Məcməüş-şüəra» kimi ədəbi məclislərin fəaliyyəti təhlil olunmuş və bu məclislərin iştirakçılarının həyat və fəaliyyəti öyrənilmişdir. Kitab müəllifin namizədlik dissertasiyası əsasında nəşrə hazırlanmışdır.

## XIX əsr ədəbi məclisləri Nəsrəddin Qarayevin tədqiqatlarında

*XIX əsrdə Azərbaycanda təşkil olunmuş ədəbi məclislərin fəaliyyəti ilk dəfə sistemli şəkildə AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun mərhum əməkdaşı, şərqşünas alim, filologiya elmləri namizədi Nəsrəddin Qarayev (1926-1982) tərəfindən tədqiq olunmuşdur.*

*N.Qarayev Azərbaycan Dövlət Universitetinin (indiki BDU-nun) şərqşünaslıq fakültəsini bitirmiş, 1960-1966-cı illərdə Respublika Əlyazmalar Fondunda (indiki Əlyazmalar İnstitutunda), 1966-1972-ci illərdə Nizami adına Ədəbiyyat İnstitutunda, sonra yenidən, ömrünün sonunadək Respublika Əlyazmalar Fondunda işləmişdir. 1971-ci ildə «XIX əsr Azərbaycan ədəbi məclisləri» mövzusunda namizədlik dissertasiyası müdafiə etmişdir. O, elmi fəaliyyətinin əsas hissəsini XIX əsr ədəbi məclislərinin və onların fəal üzvlərinin tədqiqinə sərf etmişdir. İndiyə qədər alimin hazırladığı Mirzə Həsən Qarabağinin «Seçilmiş əsərləri» və (ölümündən sonra) «Poetik məclislər» kitabları işıq üzü görmüşdür. Bundan əlavə, N.Qarayev çoxsaylı dəyərli məqalələrin də müəllifidir.*

*N.Qarayevin işıq üzü görməmiş kitabları da vardır. Belə ki, o, Həsənəli xan Qaradağinin yaradıcılığını araşdırmış, onun şeirlərini toplamış, kitab şəklində tərtib etmiş, Zöv'i «Divan»ını çapa hazır vəziyyətə gətirmişdir. Hazırda bu kitablar AMEA Əlyazmalar İnstitutunun elmi arxivində mühafizə olunmaqdadır.*

*Şərqşünas ailm f.ü.f.d.* ***Nəsrəddin Qarayevin*** *təzkirələr üzərində apardığı araşdırmalar və nəşrə hazırladığı* ***"Təzkireyi-Nəvvab"*** *da bu baxımdan diqqətəlayiqdir. Belə ki, N.Qarayev Nəvvab təzkirəsini Azərbaycan dilinə* ***tərcümə edərək*** *tam şəkildə çapa hazırlamışdır. Mərhum alimin nəşrə hazırladığı bu iri həcmli təzkirənin mətni AMEA* ***Əlyazmalar İnstitutunun elmi arxivində*** *mühafizə olunmaqdadır*[*]*. Əsər* ***1980-ci*** *ildə tamamlanaraq elmi arxivə təhvil verilmişdir. Kitabın redaktoru iranşünas alim f.ü.f.d.* ***Məmmədağa Sultanovdur****. Təzkirə çapa hazırlandıqdan sonra f.ü.f.d.* ***Şaməddin Xəlilov*** *tərəfindən də təkrar gözdən keçirilmiş və bəzi düzəlişlər edilmişdir. Ancaq bu abidənin nəşrini görmək N.Qarayevə nəsib olmamışdır. Ömür vəfa etmədiyindən əsər uzun illər alimin Əlyazmalar İnstitutundakı elmi arxivində qalmışdır. Nəhayət, "Təzkireyi-Nəvvab"* ***1998-ci ildə***[1] *Azərbaycan nəşriyyatında işıq üzü görmüşdür. Təzkirənin N.Qarayev tərəfindən hazırlanmış (1980) nüsxəsi ilə 1998-ci il nəşri tərəfimizdən tam şəkildə müqayisə olunmuş və maraqlı faktlar aşkarlanmışdır. Xoşbəxtlikdən onun çapa hazırladığı əsərin həm əlyazması, hə də makinə çapı arxivdə saxlanılır.*

*Təəssüf ki, uzun illər bu əsəri nəşrə hazırlayan mərhum N.Qarayevin adı* ***mütərcim*** *kimi deyil, sadəcə türkcə mətnləri transfoneliterasiya edən şəxs kimi qeyd edilmişdir. Bundan*

---

[*] AMEA Əlyazmalar İnstitutu elmi arxiv. **Nəsrəddin Qarayevin arxivi**. Təzkirənin N.Qarayevin öz xətti ilə olan əlyazması **175** və **176** şifrələri altında iki qovluqda saxlanılır. Eyni əlyazmanın makina çapı isə (1058 səhifə həcmində) 4 qovluqda 152, 153, 154, 155 şifrələri ilə mühafizə olunmaqdadır. Qovluqların hər birinin üzərində yazılmışdır:
"Nəvvab Mir Möhsün Ağamirzadeyi-Qarabaği. Təzkireyi-Nəvvab". **Tərcümə edəni: N.S.Qarayev.** Redaktoru: M.Sultanov. Bakı: 1980.

[1] Bu kitabın titul vərəqində əsərin 1998-ci ildə çap olunduğu yazılmışdır. Ancaq titul vərəqinin arxasında yer alan məlumatda 1995-ci il qeyd olunmuşdur. Yəqin ki, bu texniki qüsurdur - V.M.

*əlavə, kitabın ön sözündə oxuyuruq: "Əsərin türkcə mətnlər[*] olan hissələrini mərhum tədqiqatçımız Nəsrəddin Qarayev çevirib qurtarmaq üzrə idi. Ancaq bu əsərin yubiley nəşrini planlaşdıranlar unutmuşlar ki, Nəvvab XIX əsr ikidilli ədib-alimlər sırasında gedir... təzkirənin bütün nəsr hissəsi, şeirlərin böyük bir qismi fars dilində idi"[2]. Təzkirənin 1998-ci il nəşrini çapa hazırlayan və ön sözün müəllifi faktiki olaraq N.Qarayev nüsxəsini* ***əsas*** *götürsə də, mərhum alimin yalnız təzkirənin kiçik bir hissəsini əhatə edən türkcə mətnləri çevirdiyini dönə-dönə qeyd edir. Halbuki təzkirənin tərcüməsi bütünlüklə (yəni həm fars, həm də türkcə olan hissələr – V.M.) on səkkiz il öncə (1980) N.Qarayev tərəfindən tamamlanmış, tanınmış iranşünas alim M.Sultanov tərəfindən ciddi redaktə olunaraq nəşrə hazır şəkildə elmi arxivə təhvil verilmişdir.*

*Bizim burada təzkirənin N.Qarayev tərəfindən çapa hazırlanmış nüsxəsi haqqında geniş məlumat verməyimizin məqsədi "Təzkireyi-Nəvvab" kimi iri həcmli əsər üzərində işləyərək onu tam şəkildə çapa hazırlayan mərhum tədqiqatçının xidmətini uzun illərdən sonra obyektiv şəkildə qiymətləndirmək, bu barədə elmi ictimaiyyəti bilgiləndirmək və Nəsrəddin Qarayevin adını Azərbaycan təzkirəşünaslıq tarixinə daxil etməkdən ibarətdir.*

*N.Qarayevin namizədlik dissertasiyası əsasında hazırlayıb oxucuların ixtiyarına təqdim etdiyimiz bu monoqrafiya giriş, 8 fəsil, nəticə, ədəbiyyat siyahısı və əlavədən ibarətdir.*

*Monoqrafiyada XIX əsrdə Azərbaycanda fəaliyyət göstərmiş «Divani-hikmət», «Gülüstan», "Əncümənüş-şüəra», «Fövcül-füsəha», «Beytüs-səfa», "Məclisi-üns», "Məclisi-fəramuşan», "Məcməüş-şüəra» kimi ədəbi məclislərin*

---

[*] Təzkirənin türkcə hissələrinin çevrilməsi məsələsi absurddur. Çünki əsərdəki bəzi şeirlər türkcədir və N.Qarayevin bu hissələri transfoneliterasiya etməkdə məqdəsi nə idi? – V.M.

[2] Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. – Bakı: 1995, s. 3.

*fəaliyyəti təhlil olunmuş və bu məclislərin iştirakçılarının həyat və fəaliyyəti öyrənilmişdir.*

*Monoqrafiyanın birinci fəslində «Divani-hikmət» ədəbi məclisinin fəaliyyəti təhlil olunmuşdur. Bu məclis təxminən 1820-1825-ci illərdə Gəncədə Mirzə Şəfi Vazeh tərəfindən təşkil edilmiş, həm Gəncədə, həm də Tiflisdə fəaliyyət göstərmişdir. Mirzə Şəfi Tiflisdə yaşadığı illərdə «Divani-hikmət»in Gəncədəki fəaliyyətinə onun yaxın dostu Mirzə Mehdi Naci rəhbərlik etmişdir.*

*N.Qarayev «Divani-hikmət»in Gəncədə fəaliyyət göstərdiyi müxtəlif dövrlərdə Mirzə Şəfi Vazeh, Mirzə Mehdi Naci, Mirzə İbrahim Naseh (Qüdsi), Molla Abdulla, Hacı Abbas Şölə və başqalarının onun müntəzəm iştirakçıları olduğunu yazır. Fəaliyyətinin Tiflis dövründə «Divani-hikmət»in iştirakçılarının sayı daha da çoxalır. O zaman Tiflisdə yaşayan Mirzə Həsən Ordubadi, Hacı Yəhya Müztər, Mirzə Yusif Vidadi, Hacı Yusif Qane kimi şairlər «Divani-hikmət»in iştirakçılarından olmuşlar. «Divani-hikmət»in yığıncaqlarında F.Bodenştedt və Q.Rozen də iştirak etmişlər ki, bu haqda «Şərqdə min bir gün» kitabında ətraflı məlumat verilmişdir.*

*Müəllif müxtəlif mənbələr əsasında «Divani-hikmət»in Gəncə və Tiflis dövrlərində onun iştirakçılarının təxminən aşağıdakılardan ibarət olduğunu göstərir: Mirzə Şəfi Vazeh, A.Bakıxanov Qüdsi, Mirzə Mehdi Naci, Şeyx İbrahim Naseh (Qüdsi), Ağa İsmayıl Zəbih, Hacı Seyid Ziyadxanzadə, Hacı Abdulla, Molla Abdulla, Hacı Abbas Şölə, Mirzə Həsən Ordubadi, Mirzə Məhəmmədtağı, M.F.Axundov, Hacı Yəhya Müztər, Mirzə Yusif Vidadi, Hacı Yusif Qane, İ.A.Slivitski, L.Z.Budaqov, Q.Rozen, F.Bodenştedt və b.*

*Monoqrafiyada Mirzə Mehdi Nacinin həyat və yaradıcılığı əlyazmalar əsasında geniş şəkildə təhlil olunmuşdur.*

*Kitabın ikinci fəslində «Gülüstan» ədəbi məclisinin yaranması, fəaliyyəti, rəhbəri və üzvləri haqqında məlumat verilir. Belə ki, «Gülüstan» ədəbi məclisi XIX əsrin birinci ya-*

*rısında təşkil edilmiş ilk ədəbi məclislərdəndir. Bu məclisin əsasını zəmanəsinin görkəmli alim və şairi Abbasqulu ağa Bakıxanov Qüdsi qoymuşdur. Bu fəslində Abbasqulu ağa Bakıxanov və Mirzə Möhsün Xəyalinin həyat və yaradıcılığı tədqiqata cəlb olunmuşdur.*

*Üçüncü fəsildə "Əncümənüş-şüəra» ədəbi məclisinin fəaliyyəti təhlil edilir. Müəllif "Əncümənüş-şüəra»nın 1838-ci ildə Ordubadda Şıxəli Naib tərəfindən təşkil olunduğunu, təşkil edildiyi ilk vaxtlara nisbətən, sonralar məclisin fəaliyyətinin zəiflədiyini, lakin 1860-70 illərdə Hacağa Fəqirin Ordubad şairlərini ətrafına toplayaraq, məclisi canlandırdığını yazır. Həmin məclisə daha sonra M.T.Sidqi rəhbərlik etmişdir.*

*N.Qarayev mənbələr əsasında "Əncümənüş-şüəra»nın fəaliyyətdə olduğu müddətdə Naxçıvan və Ordubadda yazıb-yaradan M.T.Sidqi, H.Fəqir, Cani Ordubadi, Hacı Mirzə Ağarəhim Qüdsi Ordubadi (Vənəndi), Möhtərəm Ordubadi, Molla Məhəmməd Ordubadi, Əhmədağa Şəmi, Usta Zeynal Nəqqaş, Molla Hüseyn Bikəs, Məşədi Həsən Dəbbağ, Salik Ordubadi, Nadim Naxçıvani, Mirzə Mehdi Naxçıvani və başqalarının bu məclisin üzvü olduğunu müəyyənləşdirmişdir.*

*Burada "Əncümənüş-şüəra»nın fəal üzvlərindən olan Mirzə Ağarəhim Qüdsi, Hacağa Fəqir Ordubadi və Məmmədtağı Sidqinin həyat və yaradıcılığı təhlil olunmuşdur.*

*XIX əsrin ikinci yarısında yaranmış ilk ədəbi məclis Lənkəran şəhəri və onun ətraf yerlərində yaşayan şair, alim və şeir-sənət həvəskarlarını təmsil edən «Fövcül-füsəha» olmuşdur. Monoqrafiyanın dördüncü fəsli bu ədəbi məclisə həsr edilmişdir. «Fövcül-füsəha»da Mirzə İsmayıl Qasir, Molla Fəttah Səhban, Ağababa Bixud, Usta Məhəmmədhəsən Nəccar, Mirzə İsa Xəyali, Hüseynqulu Şuri, Mirzə Mütalib Ərcivani, Molla Ələkbər Aciz, Molla Məhəmməd Mücrüm və b. kimi müxtəlif peşə sahibləri iştirak etmişlər.*

*Monoqrafiyanın bu fəslində məclisin fəaliyyəti təhlil olunmuş və Mirzə İsmayıl Qasir, Mirzə İsa Xəyali, Mir Həsən Se-*

yidzadə Səyyad, Mirzə Ələkbər Mühəqqir, Molla Məhəmməd Mücrüm və Mirzə İsrafil Mahir kimi məclis üzvlərinin həyat və yaradıcılığı araşdırılmışdır.

Beşinci fəsil 1867-ci ildə Şamaxıda təşkil olun «Beytüs-səfa» ədəbi məclisi və üzvləri haqqındadır. N.Qarayev «Beytüs-səfa» məclisinin üzvlərinin Seyid Əzim Şirvani, Mirzə Nəsrullah Bahar, Ələkbər Qafil, Qafar Rağib, Məhəmməd Səfa, Molla ağa Bixud, Ağababa Zühuri, Molla Mahmud Zöv'i, Naseh, Salik, Mirzə Nəsrullah Didə, Ziya, Füruği, Nəcəf bəy, Mirzə Məhəmməd Həsən Nalə və b. ibarət olduğunu göstərir. Burada Mirzə Məmmədhəsən, Molla Ağa Bixud, Mirzə Nəsrullah Didə, Ağaəli bəy Naseh, Molla Mahmud Zöv'i və Məhəmməd Səfa kimi şairlərin yaradıcılığına daha dərindən işıq salmışdır.

Monoqrafiyanın altıncı fəslində "Məclisi-üns»ün yaranma tarixi, fəaliyyəti və üzvləri haqqında məlumat verilmişdir. Belə ki, XIX əsrin ikinci yarısında təşkil edilən ədəbi məclislər içərisində həm iştirakçılarının sayına, həm də başqa ədəbi məclislərlə əlaqələrinə görə "Məclisi-üns» xüsusi yer tutur. Məclisin üzvləri arasında Xurşidbanu Natəvan, Mirzə Rəhim Fəna, Mirzə Ələsgər Növrəs, Mirzə Həsən Yüzbaşov, Məmo bəy Məmai, Hacı Abbas Agəh, Məhəmmədəli bəy Məxfi və s. şairlərin adlarını çəkmək mümkündür. Monoqrafiyada "Məclisi-üns» üzvlərindən Natəvan, Mirzə Həsən, Məhəmmədəli bəy Məxfi və Məmo bəy Məmainin yaradıcılığı geniş şəkildə tədqiqata cəlb olunmuşdur.

1872-ci ildə Şuşada ikinci bir ədəbi məclis – "Məclisi-fəramuşan» təşkil olunmuşdur. Kitabın yeddinci fəsli məhz bu məclisə həsr olunmuşdur. N.Qarayev müxtəlif sənədlərdən aşağıdakıların "Məclisi-fəramuşan»ın iştirakçıları olduqlarını müəyyən edə bildiyini yazır: Mir Möhsün Nəvvab, Abdulla bəy Asi, Həsənəli xan Qaradaği, Mirzə Əbdül Şahin, Məşədi Əyyub Baki, Fatma xanım Kəminə, Abdulla bəy Abış, Baxış bəy Səbur və qardaşı Bəhram bəy Fədai, Mirzə Muxtar,

Məşədi Məhəmməd Bülbül, Molla Xəlil Şaki, Mirzə Məhəmməd Katib və b.

Monoqrafiyanın səkkizinci fəslində Bakıda təşkil olunmuş "Məcməüş-şüəra» ədəbi məclisinin yaranması və fəaliyyəti də təhlil olunmuşdur. Burada məclis üzvlərindən Məhəmməd Ağa Cürmi, Ağa Kərim Salik, Mirzə Bağır, Mirzə Məhəmməd Müsəvvir, Məşədi Azər Buzovnalı, Seyid Zərgər, Məşədixanım Leyli, Mirzə Əbdülxalıq Yusif, Əbülhəsən Vaqif, Mikayıl Seydi və Cənnəti kimi şairlərin həyat və yaradıcılığı tədqiqata cəlb olunmuşdur. Müəllif kitabda heç bir yerdə çap edilməmiş «Türk səsi» adlı şairlər cəmiyyətinə mənsub məramnamənin mətnini ilk dəfə olduğu kimi vermişdir.

Öz əsərini sovet dövründə yazmasına baxmayaraq, N.Qarayev bəzi cəsarətli fikirlər də irəli sürmüşdür. Belə ki, müəllif 1905-1906-cı illərdə baş vermiş «erməni – müsəlman davası»ndan bəhs edərkən şuşalı şair Məmainin dili ilə bu münaqişənin təqsirkarının erməni daşnakları olduğunu bəyan edir. Tədqiqatçı hətta Cənnətinin bir müsəddəsini təhlil edən zaman sovet hakimiyyətinin ilk illərində Azərbaycan ədəbiyyatında azad fikir söyləməyin çətinləşdiyinə eyham vurur. Etiraf etmək lazımdır ki, N.Qarayev bu ifadələri yazan zaman, yəni qırx il bundan öncə bu cür açıqlamalarla çıxış etmək xüsusi cəsarət və qətiyyət tələb edirdi. Alimin marksizm-leninizm klassiklərinin əsərlərinə müraciət etməməsi də diqqətimizi cəlb edən faktlardandır. Lakin bu cəhətlərə baxmayaraq, kitabın müəyyən yerlərində dövrün tələbləri duyulur.

Tədqiqatçının bu əsəri tamamladığı tarixdən qırx ilə yaxın zaman keçmiş, ancaq onun araşdırması öz aktuallığını itirməmişdir. Onun indiyədək elmi arxivdə mühafizə olunan dissertasiyası bu illər ərzində XIX əsr ədəbiyyatımızı, xüsusilə də ayrı-ayrı ədəbi məclis şairlərinin həyat və yaradıcılığını öyrənən bir çox elm adamının istinad yeri olmuşdur.

Bu önəmli əsər indiyə kimi işıq üzü görməmişdir. Bu isə onun oxucu dairəsini məhdudlaşdırmış, ədəbiyyatşünasların

*ondan daha asan və səmərəli istifadə etməsinə əngəl törətmişdir.*

*Oxucuların istifadəsinə verilən monoqrafiya N.Qarayevin AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun arxivində saxlanan dissertasiya işinin iki nüsxəsi əsasında çapa hazırlanmışdır. Əsər nəşrə hazırlanarkən müəllifin işlətdiyi bəzi qəliz ifadələr sadələşdirilmiş, hal-hazırda dilimizdə işlənməyən bir sıra kəlmələr (təqaza, tizfəhm, göftar, səraməd, həzlyanə, mərizxana) müasir sözlərlə əvəz olunmuş, dövrümüzlə səsləşməyən müəyyən fikirlər və bir neçə təhqiramiz şeir parçası ixtisar edilmişdir. Bundan əlavə, monoqrafiyanın qələmə alınmasından sonra mövzuya dair aparılmış araşdırmalar, nəşr olunmuş əsərlər və müdafiə olunmuş dissertasiyalar haqqında əlavə məlumatlar səhifəaltı istinad şəklində kitaba daxil edilmişdir.*

***Vüsalə Musalı,***

*filologiya üzrə fəlsəfə doktoru*

# GİRİŞ

XIX əsrin 30-cu illərindən sonra Azərbaycanın ictimai-iqtisadi həyatında olduğu kimi, mədəniyyət və maarif sahəsində də bir yenilik nəzər çarpır. Əsrin ikinci yarısında məktəb və mədrəsələrdə təlim-tərbiyənin ərəb və fars dilləri əvəzinə doğma ana dilində aparılması qabaqcıl ziyalılarımızı daha çox düşündürürdü. XIX əsrin ikinci yarısında yeni tipli məktəblərin yaranması ilə Azərbaycanda tədricən ictimai-pedaqoci hərəkat formalaşmağa başladı. Tədrisdə yeni üsul (üsuli-cədid) ideyası ortaya çıxdı. Mollaxanalarla yanaşı yeni tipli məktəblərin açılması, ərəb və fars dilləri ilə bərabər Azərbaycan dilinin tədris edilməsi bu dövrün əlamətdar hadisələrindən idi.

Bu dövrdə A.Bakıxanov, M.Kazımbəy, M.C.Topçubaşov, M.F.Axundov və H.Z.Şirvani kimi mütəfəkkir, tarixçi, səyyah və alimlər yetişir, tarixşünaslıq elmi xüsusilə inkişaf edir. Tarix, coğrafiya, etika, eləcə də pedaqogika sahəsində elmi əsərlər meydana çıxır, yeni-yeni ədəbi canrlar yaranır.

1845-ci ildə Mirzə Adıgözəl bəy Azərbaycan dilində «Qarabağnamə» əsərini yazır. Mirzə Camalın «Tarixi-Qarabağ» əsəri 1855-ci ildə «Qafqaz» qəzetində rusca nəşr olunur. Hələ bundan çox əvvəl, 1829-cu ildə Kərim ağa Fateh «Şəki xanlarının tarixi»ni yazmışdı ki, bu da 1858-ci ildə çap olunmuşdur. Hacı Seyid Əbdülhəmidin «Şəki xanları və onların nəsilləri» əsəri də bu dövrün məhsuludur. A.Bakıxanovun «Gülüstani-İrəm» əsəri isə özünün elmiliyi və əhatə dairəsinə görə XIX əsrdə Azərbaycan tarixinə dair yazılmış əsərlər içində xüsusilə fərqlənir.

M.C.Topçubaşov hələ XIX əsrin birinci yarısında tədris sahəsində qabaqcıllıq edərək, Azərbaycan mədrəsələrində əsas

dil kimi tədris edilən fars dilinin qrammatikasını tərtib edir. M.Kazımbəy Azərbaycan dilinin elmi əsaslarını işləyib hazırlayır ki, bu kitabdan sonra M.Ş.Vazehin İ.Qriqoryevlə birgə hazırladığı Azərbaycan dili dərsliyi meydana çıxır.

XIX əsrin birinci yarısında coğrafiya sahəsində əsər yazmaq təşəbbüsü «Gülüstan» əbədi məclisinin təşkilatçısı A.Bakıxanov Qüdsiyə nəsib oldu. O, «Kəşfül-qəraib» və «Ümumi coğrafiya» əsərlərini yazdı. Hacı Zeynalabdin Şirvani (1780-1837/38) Azərbaycan, İran, Türkiyə, Ərəbistan, Hindistan, Misir, Sudan və başqa Şərq ölkələrinə səyahət etmişdir. Qırx ilə yaxın çəkən bu səfər zamanı o, gəzdiyi yerlərin xalqlarının mədəni və iqtisadi həyatı haqqında qiymətli məlumatlar toplamışdır. A.Bakıxanov nücum (astronomiya) elmindən bəhs edən «Əsrarül-mələkut» əsərini də bu dövrdə yazmışdır.

1832-ci ildə «Tiflisskiye vedomosti» qəzetinə əlavə olaraq, qısa müddətli olsa da, Azərbaycan dilində həftəlik «Tatarskiye vedomosti» («Tatar xəbərləri») çıxmağa başladı. Bu işdə A.Bakıxanovun xüsusi rolu olmuşdur. 1841-1846-cı illərdə «Zakavkazskiy vestnik»ə əlavə olaraq, Azərbaycan dilində vərəqələr buraxılırdı. Onu da qeyd etmək lazımdır ki, bir qrup Azərbaycan ziyalısının müxtəlif vaxtlarda «Tiflisskiye vedomosti»də iştirakı sonrakı dövrdə milli mətbuatın inkişafına və publisistikaya qüvvətli təsir etmişdir.

Bütün bu tərəqqi ədəbiyyatda da özünü göstərməyə başladı. XIX əsrdə ədəbiyyatda mövzu, ideya, məzmun əlvanlığı və ədəbi cərəyanların müxtəlifliyi diqqəti cəlb edir. Azərbaycanda maarifçilik və demokratik ideyaların güclənməsi ictimai şüurun inkişafına böyük təsir göstərir. Beləliklə, tənqidi realizm qüvvətlənir. İctimai həyatın güzgüsü olan ədəbiyyat zamanın tələbinə uyğun olaraq, yeni-yeni mövzu və keyfiyyətlər kəsb edir. İctimai satira həyatın eyblərini əks etdirən bədii ayna kimi məhz bu dövrdə daha da büllurlaşır, saflaşır, özünün əksetdirmə dairəsini genişləndirir.

Eyni zamanda, aşiqanə və dini məzmunlu qəzəl, qəsidə, növhə, minacat kimi əsərlərlə yanaşı, yeni ədəbi forma və buna müvafiq olaraq yeni məzmun yaranmağa başlayır. İsmayıl bəy Qutqaşınlının «Rəşid bəy və Səadət xanım» hekayəsində, M.F.Axundovun hekayə və komediyalarında, Qasım bəy Zakirin, Seyid Əzim Şirvaninin satiralarında ictimai ziddiyyətlərin əksi daha qabarıq şəkildə özünü göstərir.

Bu dövrdə tərcümə ədəbiyyatına meyil artır. Mustafa ağa Nazir, Nizaminin «Xosrov və Şirin» poemasını məhz bu dövrdə tərcümə etməyə başlamışdır. Bu haqda məlumat verən Firudin bəy Köçərli arzu edirdi ki, Nazirin başladığı və yarımçıq qoyduğu bu işi Mirzə Rəhim Fəna, Mirzə Ələkbər Sabir, Məşədi Əyyub Baki, Mirzə Həsib Qüdsi, İbrahim Tahir davam etdirsinlər[3]. Ədəbi məclis üzvlərindən A.Bakıxanov, H.Yüzbaşov, M.Azər, H.Qaradaği, Ə.Cənnəti və başqaları Firdovsi, Nizami, Sədi, Cami, Nəvai, Krılov kimi şairlərin əsərlərindən tərcümələr etmişlər. Klassiklərin yaradıcılığındakı humanizm, didaktik, əxlaqi-tərbiyəvi, bəzən isə vəhdəti-vücud ideyaları həm şəxsi mütaliə, həm də tərcümə yolu ilə bu şairlərə qüvvətli təsir göstərmişdir.

Rusiyanın böyük şəhərlərində təhsil alan, eləcə də rus ordusunda zabit kimi qulluq edən azərbaycanlıların sayı da getdikcə çoxalırdı. Onların dünyagörüşü genişləndiyi kimi, təbii olaraq, şüurlarındakı mütərəqqi ideyalar da qüvvətlənir, vətənə qayıtdıqdan sonra onlar xalqın məişətinə, ictimai həyatına müsbət təsir göstərirdilər. Bundan əlavə, A.Bakıxanov, M.F.Axundov, M.Ş.Vazeh və başqaları Rusiyanın yazıçı, şair və ictimai xadimləri ilə yaxından dostluq edir, onların qabaqcıl ideyalarından bəhrələnirdilər. Öz növbəsində bu azərbaycanlı ziyalıların da rus şair və yazıçılarına təsiri olmuşdur. Bu qarşılıqlı təsir M.Y.Lermontovun «Aşıq Qərib»,

---

[3] Köçərli F. Azərbaycan ədəbiyyatı tarixi materialları, II c., II h.issə, Bakı, 1925, s. 53. M.Nazir vəfat etdiyi üçün bu işi başa çatdıra bilməmişdir (N.Q).

B.Marlinskinin «Molla Nur», «Amalat bəy» və s. əsərlərində əksini tapmışdır.

XIX əsrin birinci yarısından başlayaraq həcviyyatla yanaşı, həyatın zəruri tələbindən doğan ictimai məzmunlu satira da güclənir. Cəmiyyətdəki naqis cəhətlərin ədəbiyyatda əksi və tənqidi hətta qəzəl canrında da özünə yer tapır. Qadın simvolik təşbih qəlibindən çıxaraq, bəşəri xarakterə çevrilir, cəmiyyətin vacib və ləyaqətli üzvü kimi tərənnüm və vəsf edilir. Xüsusilə Mirzə Şəfinin poeziyasında qadın öz ləyaqəti ilə kişilərə bərabər olan, cəmiyyətə və həyata gözəllik gətirən bir varlıq dərəcəsinə yüksəldilir.

Bu dövrdə təriqət ədəbiyyatında da bir canlanma hiss edilir. Əsrin birinci yarısında Ə.Nəbati, S.Nigari, ikinci yarısında Qumri, Şüai və başqaları təriqət ədəbyyatının başında dururdular. Onların yaradıcılıq mövzuları dini xarakter daşısa da, sənətkarlıq cəhətdən qüvvətli qələmə malik idilər.

XIX əsrdə Azərbaycanda qəzəl ədəbiyyatına güclü bir axın yaranır və əsrin ikinci yarısında hər şəhər və kənddə şairlərin və şeir həvəskarlarının sayı çoxalır. «Riyazül-aşiqin», «Təzkireyi-Nəvvab» əsərlərindən, həmçinin cüng və fraqmentlərdən məlum olur ki, XIX əsrdə təkcə Qarabağ mahalında yüzə qədər şair yazıb-yaratmışdır. Əlbəttə ki, sənətkarlıq baxımından bunların hamısı eyni səviyyədə ola bilməzdilər. Lakin Qubada A.Bakıxanov (Qüdsi), Gəncədə M.Ş.Vazeh, M.M.Naci, İ.Zəbih, Lənkəranda M.İ.Qasir, M.İ.Xəyali, Şamaxıda S.Ə.Şirvani, M.H.Bahar, M.A.Bixud, M.Ə.Qafil, Şuşada X.Natəvan, M.M.Nəvvab, A.Asi, M.Məmai, M.H.Yüzbaşov, N.X.Qaradaği, M.Ə.Növrəs, H.A.Agəh, Şəkidə M.İ.Nakam, Ordubadda H.Fəqir, M.T.Sidqi, Bakıda Ə.Cənnəti, M.Azər, A.Müniri, A.Sürəyya, Qazaxda A.Nazir, M.Arif və başqaları xüsusilə ustad şair kimi şöhrət tapmışdılar.

Hələ XIX əsrin əvvəllərindən ayrı-ayrı şəhərlərdə yeni şairlər və şeir həvəskarları görkəmli şairlərin ətrafına toplanaraq, mədrəsələrdə və ya evlərdə ədəbi müzakirə və mübahi-

sələr keçirərdilər. Belə yığıncaqlara gələndərin sayı getdikcə çoxalırdı. Şairlərin tez-tez bir yerə toplaşıb müşairələr keçirməsi, ayrı-ayrı şəhərlərdə xüsusi məclislərin yaranması üçün bir zəmin oldu.

Bahar Şirvani hələ Şamaxıdan getməmiş şeir məclisləri təşkil edir, həvəskarları oraya toplayırdı. Naseh Şirvani, Hacı Səftər kimi şairlər onun məclisində iştirak edirdilər.

Beləliklə, Azərbaycanın bir çox yerlərində ədəbi qüvvələr tədricən dərnəklər şəklində birləşməyə başladı. Getdikcə çoxalan belə dərnəklər müntəzəm şəkil aldığı üçün onlara toplandığı yerinə, şəraitinə yaxud iştirakçıların tərkibinə görə müvafiq adlar verilirdi.

Ümumiyyətlə götürdükdə, Azərbaycan ədəbiyyatında məclislərin tarixi qədimdir. XIX əsrdə yaranmış ədəbi məclislərdən çox-çox əvvəl şah saraylarında şairlər məclisi olmuşdur ki, bunlar öz dövrünə görə ədəbiyyat tarixində mühüm rol oynamışdır.

XII əsrdə Azərbaycanda Eldəgizlər (Təbriz) və Şirvanşahlar (Şamaxı və Bakı) sarayındakı ədəbi məclislərdə dövrün məşhur şairləri iştirak etmişlər. Şirvanşahlar sarayındakı ədəbi məclisə dövrünün məliküş-şüərası Əbülüla Gəncəvi başçılıq edirdi. Xaqani, Fələki və başqa görkəmli şairlər həmin ədəbi məclisin üzvləri idilər[4]. Bu məclisə Azərbaycanın başqa yerlərində yaşayan şairlər də gəlirdilər. Məsələn, Mücirəddin Beyləqani bir zaman Şamaxıya gəlmiş və həmin məclisdə öz biliyini təkmilləşdirmişdi.

Azərbaycan ədəbiyyatının sonrakı dövrlərində də ədəbi məclislərə təsadüf edilir. Şah İsmayıl Xətainin öz sarayında təşkil etdiyi ədəbi məclis bunların ən məşhurlarından sayılır. Dövrünün qabil hökmdarı, bacarıqlı dövlət xadimi olan Xətai təkcə Azərbaycan dövlətinin möhkəmləndirilməsi ilə kifayətlənməmiş, Azərbaycan ədəbiyyatı və incəsənətinin in-

---

[4] Araslı H. VII-XII əsrlərdə Azərbaycan ədəbiyyatı // Azərbaycan ədəbiyyatı tarixi, I c., Bakı, 1960, s. 67.

kişafına da xüsusi diqqət yetirmişdir. O, həmin ədəbi məclisə nəinki azərbaycanca yazan şairləri, hətta rəssamları, heykəltəraşları və incəsənətin başqa sahələrində çalışan sənətkarları da toplayaraq, milli ədəbiyyat və incəsənətimizin tərəqqisinə çalışmışdır. Onun təşkil etdiyi ədəbi məclisin fəal üzvləri Sürури, Şahi, Matəmi, Tüfeyli, Qasimi dövrün görkəmli şairləri olmuşlar. Həmin məclisə «məliküş-şüəra» ləqəbi daşıyan göyçaylı Həbibi başçılıq etmişdir[5]. Həbibi əvvəllər Sultan Yaqubun sarayındakı şairlər məclisinin üzvü olmuşdur. Şah İsmayıl Xətai Ağqoyunlu dövlətini dağıtdıqdan sonra onu öz sarayına apararaq «Məliküş-şüəra» təyin etmişdir[6].

Akademik H.Araslı orta əsr ədəbi məclislərinin fəaliyyətinin ümumi səciyyəsini verərək yazır: «Şairlər… özlərinin məclislərində ədəbi mübahisə düzəldir və müxtəlif ədəbi əyləncələr təşkil edirdilər. Bu ədəbi və yarıməyləncə məclisləri tacirlərin və bəzi hakimlərin evində də təşkil edilirdi. Belə ədəbi məclislərdə qədim məruf şairlərdən nümunələr seçilir və bütün məclis əhli tərəfindən nəzirələr yazılırdı. Eyni zamanda bu yazılan nəzirələr məclisdə müzakirə edilib, hansının daha müvəffəqiyyətli olduğu müəyyənləşdirilirdi. Bu cəhətdən məclisin işi bir növ ədəbi müzakirə səciyyəsi alırdı. Lakin bu müzakirələr əsasən əsərin üzərində deyil, şəkil xüsusiyyətləri ətrafında gedirdi… Bu məclislərdə ən çox müəmmalara fikir verilirdi»[7]. Doğrudan da, ədəbiyyatda müəmmaları açmaq xüsusi bilik, hərtərəfli məlumat tələb edir.

Şah saraylarındakı ədəbi məclislərə toplaşan şairlər əsərlərini əsasən fars dilində yazır, öz hökmdarlarını mədh edir, onların şərəfinə qəsidələr deyir, yaxud məzhəb və təriqətləri təbliğ edirdilər.

---

[5] Araslı H. XV-XVI əsrlərdə Azərbaycan ədəbiyyatı // Azərbaycan ədəbiyyatı tarixi, I c., s. 308.
[6] Quluzadə M. Həbibi // Azərbaycan ədəbiyyatı tarixi, I c., s. 341.
[7] Araslı H. XVII-XVIII əsrlər Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 1956, s. 94-95.

Lakin saray şairlərinin heç də hamısı eyni mövqedə durmamışlar. Onların bir qisminin yaradıcılığında zalım hökmdarlara dərin nifrət, əməkçi xalqa böyük məhəbbət, insanları xeyirxah əməllərə dəvət, humanizm, ədalətli hökmdar və sair kimi mütərəqqi görüşlər öz əksini tapmışdır. Nizami, Xaqani kimi klassiklərimizin yaradıcılığı buna parlaq sübutdur.

Saraylarda ədəbi məclis təşkil etmək ənənə şəklini alaraq XIX əsrə qədər davam etmişdir. Kərbəlayi Allahi Arif bir zaman Şamaxıda Mustafa xanın sarayındakı məclisdə olmuş, sonra xandan inciyərək, İrəvana, Hüseyn xanın sarayına getmişdir. Qarabağda Cəfərqulu xan öz sarayında şair, xanəndə və sazəndələrdən ibarət xüsusi məclis təşkil etmişdi.

Lakin ədəbi məclislərin mütəşəkkil şəklə düşməsi və yaradıcılıq təşkilatı kimi ədəbiyyat tariximizdə daha böyük rol oynaması dövrü XIX əsrə təsadüf etmişdir[8].

XIX əsrdə yaranmış ədəbi məclislər əvvəlki dövrlərin saray məclislərinə nisbətən müstəqil idi. Belə ki, saraylarda təşkil olunmuş ədəbi məclislərə şairlər şahlar və ya onların təyin etdikləri məliküş-şüəralar tərəfindən seçilib qəbul edilirdilər. XIX əsrdə isə mənsub olduğu sinifdən, varlı və ya kasıb olmasından asılı olmayaraq, hər bir şair, şeir-sənət həvəskarı rəğbət bəslədiyi, yığıncaqlarında iştirak etmək imkanına malik olduğu məclisin üzvü ola bilirdi. Buna görə XIX əsr ədəbi məclisləri bir növ demokratik, kütləvi yaradıcılıq ittifaqları səciyyəsi daşıyırdı.

XIX əsrdə «Divani-Hikmət» (Gəncə-Tiflis), «Gülüstan» (Quba), "Əncüмənüş-şüəra» (Ordubad-Naxçıvan), «Fövcülfüsəha» (Lənkəran), «Beytüs-səfa» (Şamaxı), "Məcməüş-şüəra» (Bakı), "Məclisi-üns» və "Məclisi-fəramuşan» (Şuşa) adlı məclislər yaranmışdı. Lakin bu məşhur məclislərlə yanaşı, Dərbənd, Şəki şəhərlərində, həmçinin Qazax və Ağdaşda da kiçik ədəbi dərnəklər fəaliyyət göstərirdi. Bu şəhərlərin alim,

---

[8] Şairlər məcmuəsi. Təbriz, 1945.

şair və arifləri tez-tez bir yerə toplaşar, şeirə və ədəbiyyata, maarif və mədəniyyətə dair arifanə söhbətlər keçirərdilər.

XIX əsrin ortalarında Şəkidə İsmayıl bəy Nakam, Mustafa ağa Şuxi, Molla İbrahimxəlil Doduvi, Hacı Mahmud Nafe, Rəsul ibn Kərim, Molla Məhəmməd Hüzni, Məhəmməd Şəməmduz və başqa onlarca şair yaşayırdı. Onlar tez-tez İsmayıl bəy Nakamın və ya başqa bir Şəki şairinin yanına toplaşar, ədəbi arifanə söhbətlər edərdilər. F.Köçərli M.Şuxidən bəhs edərkən yazır: «Əksər övqat məclisini ürəfa və şüəralar ilə təzyin edirmiş»[9]. Bu qeyd göstərir ki, Şəkidə ziyalılar, şair və ariflər Şuxinin ətrafına toplaşaraq məclis keçirərmiş.

XIX əsrdə Qazaxda Abbas ağa Nazir, Kazım ağa Salik, Əbdürrəhman ağa Şair (Dilbazi), İsgəndər ağa Şair, Hacı Rahim Vəhidi Dilbazov kimi şairlər yaşamışdır. F.Köçərlinin bir qeydindən görünür ki, orada da şair və alimlərin məclisi olmuşdur: «Hacı Rəhim ağanın üləma və füzəla və şüəra sinifləri ilə beyni (arası – N.Q.) xoş olmağa görə onlar ilə söhbət edərmiş və onlara riayət və hörmət və bəzli-mərhəmət göstərərmiş və onların məclisində vaxtlarını şeir və imlayi-nəzmə sərf və bəzl qılarmış»[10]. Müəllif başqa bir qeydində də Qazaxda şairlər məclisi olduğunu göstərir və məclisin nümayəndəsi kimi Kazım ağa Salikin adını çəkirdi[11].

1880-ci illərdə Ağdaşın Zeynəddin kəndindəki mədrəsənin nəzdində də kiçik bir şeir məclisi təşkil edilmişdi. Məclisin əsas iştirakçıları burada təhsil alan tələbələr idi. Lakin Göyçay, Qəbələ, Xaldan, Zərdabdan da şeir həvəskarları bu məclisdə iştirak edərmiş. Bir zamanlar bu məclisin rəhbəri qocaman müəllim Muxtar Əfəndizadənin atası şair İsmayıl Əfəndizadə

---

[9] Köçərli F. Azərbaycan ədəbiyyatı tarixi materialları. II c., II h., Bakı, s. 97.

[10] Йеня орада, II ж., II щ. с. 58.

[11] Кочарлинский Ф. Литература Азербайджанских татар. Тифлис, 1903, с. 43.

olmuşdur. Qəbələ rayonunun Vəndam kəndindən Yusif əfəndi, Zərdabın Bıçaqçı kəndindən Qədir əfəndi, sonralar Göyçayın Qarabaqqal və Ləkçılpaq kəndlərindən Məhəmməd Talıb və Məhəmməd Zakir, həmçinin görkəmli yazıçı Qafur Əfəndizadə Faiz (Qantemir) bu məclisdə iştirak etmişlər. Hətta bu da məlumdur ki, bir dəfə vəndamlı Yusif əfəndi bıçaqçılı Qədir əfəndiyə bir put şabalıd göndərəcəyini vəd etmiş, lakin payız və qış turtarsa da, şabalıddan bir xəbər gəlib çıxmamışdı. Odur ki, Qədir əfəndi iki beytini verdiyimiz şeiri yazıb, Yusif əfəndiyə göndərir:

*Şabalut necə gör xoş yaraşır aş üstə,*
*Bu da çox xoş yaraşır: «Göndərərəm, baş üstə».*
*Şabalut ola bir put, bu kifayət eylər,*
*Bir yüz alma da qoyaydın sən onun kaş üstə*[12].

XIX əsrin 70-ci illərində Ərdəbildə əllidən artıq şair yazıb-yaradırdı. «Təzkireyi-Ziyai»də Cigərçi, Rövşən, Ünqa, Sağəri, Raci və başqaları haqqında verilən məlumatdan aydın olur ki, orada yaşayan şair və alimlər də tez-tez bir yerə toplaşar, şeir və sənətdən söhbət açar, ədəbi mübahisələr və müşairələr keçirərmişlər[13].

Bu dövrdə təriqət ədəbiyyatının nümayəndələri də xüsusi məclislər təşkil edir, öz ətrafına tərəfdarlar toplayırdılar. XIX əsrin əvvəllərində Hacı Mir Həmzə Seyid Nigarinin şagirdləri xüsusi məclislər düzəldərək öz ustadlarının şeirlərini oxuyub öyrənirdilər. «Nigarinin şeir və qəzəlləri onun müridləri arasında mütədavül olub, əzbərdən öz məclislərində cəzm olunana qədər oxunurdu»[14].

---

[12] Mümtaz S. El şairləri. Bakı, 1928, s. 129.
[13] Təzkireyi-Ziyayi. AMEA Əlyazmalar İnstitutu, D-269, vər. 74 b, 75 a, 76 a, 77 a-b, 78 b.
[14] Köçərli F. Materiallar. II c., I h., s. 201.

Süpehri, Şüai, Fazil, Xəlil, Bülbül, Səməndər, Şuxi və başqa Dərbənd şairləri mərsiyə ədəbiyyatının görkəmli nümayəndəsi Mirzə Məmmədtağı Qumrinin ətrafına toplaşaraq dini məzmunlu şeirlər-mərsiyə və növhələr oxuyub müzakirə edərdilər.

Ədəbi məclislərdə müşairələr çox vaxt gözəllərin vəsfindən, şərabdan, musiqidən, bəzən də həcvlərdən getdiyi üçün burada (Dərbənd məclisi nəzərə alınmazsa) dini məzmunlu şeirlər az oxunurdu. S.Əzim, M.M.Nəvvab, X.Natəvan kimi şairlərin rəhbərlik etdiyi məclislərin, həmçinin "Məcməüşşüəra»nın yığıncaqları isə təsadüfi hallarda musiqisiz keçirdi. Hətta «Beytüs-Səfa»da şərab da içilirdi. Bu səbəblərə görə qatı dindar şairlər belə məclislərdə təsadüfi hallarda iştirak edirdilər.

Doğrudur, məclis şairləri mərsiyə və növhələr də yazırdılar. Lakin bu qisim şeirlər həmin məclislərdə nadir hallarda müzakirə olunurdu. "Məclisi-üns»lə "Məclisi-fəramuşan» arasında dini mahiyyətli sual-cavablar, mənzum yazışmalar olsa da, bunlar dini-fəlsəfi xarakter daşıyırdı.

Məclis üzvlərinin əksəriyyəti mədrəsə və mollaxanalarda fars və ərəb dillərində təhsil almış savadlı şairlər idi. Məhz buna görə də onlar əsərlərini əsasən iki dildə – Azərbaycan və fars dillərində yazırdılar. Lakin özbək şairi Əlişir Nəvainin bu məclislərdə, xüsusən "Məclisi-üns» və "Məclisi-fəramuşan»da böyük həvəslə və maraqla öyrənilməsi nəticəsində H. Yüzbaşov, A.Asi və başqaları özbək dilində də gözəl qəzəllər yazmışlar.

Yeri gəlmişkən, qeyd etmək lazımdır ki, Azərbaycanda Nəvai təsiri ilə özbək dilində şeir yazmaq təkcə məclis üzvləri ilə məhdudlaşmayırdı. Qazaxda Kazım ağa Salik[15] və şirvanlı Hacağa bəy Zülali[16] cığatay dilində gözəl şeirlər yazmışlar.

---

[15] Köçərli F. Materiallar. I c., I hissə, s. 250
[16] Yenə orada, II c., II hissə, s. 154.

Dərbənd şairi Mirzə Cəbrayıl Süpehri Nəvainin şeirlərinin çoxunu əzbər bilirdi[17].

Lakin bu dövrdə Azərbaycan dilində yazmaq meyili çox qüvvətlənmişdi. Məclis şairlərinin, demək olar ki, hamısı öz şeirlərini əsasən Azərbaycan dilində yazırdılar. Bu, o demək idi ki, orta əsrlərdən adət şəklini almış fars dilində yazmaq artıq öz əvvəlki mövqe və əhəmiyyətini itirmişdi. Məclis şairlərinin klassik üslubda yazmaq məsələsinə gəlincə, demək lazımdır ki, bunun əsas səbəbini onların fars və ərəb dillərində təhsil aldıqları məktəb-mədrəsələrdə axtarmaq lazımdır. Bütün məşğələləri ərəb-fars dillərində keçən şagirdlər Sədi, Hafiz, Cami və başqalarının əsərlərini orijinaldan oxuyur, hətta həmin dillərdən tərcümələr edirdilər. Buna görə də mədrəsə təhsili görmüş şairlərin yaradıcılığında istər-istəməz klassik Şərq poeziyasının ənənəvi xüsusiyyətləri öz əksini tapmalı idi.

Ədəbi məclislərin bir çox üzvləri yeni mövzu, yeni ideyaya meyil edir, öz əsərlərində məişət, maarif, azadlıq məsələlərinə toxunur, din xadimləri əleyhinə çıxışlar edirdilər. S.Əzim, M.M.Nəvvab, M.T.Sidqi, H.Qaradaği, Ə.Cənnəti, H.Y. Yüzbaşov və s. bu kimi şairlər aşiqanə qəzəlləri ilə bərabər, yeri gəldikcə mövcud qayda-qanunun əleyhinə çıxır, haqsızlığı, özbaşınalığı tənqid, maarifi, elm sənəti təbliğ edirdilər, hətta imperialist dövlətlərin Afrika və Yaxın Şərq ölkələrində apardığı işğalçılıq siyasətini pisləyirdilər. Xüsusən XIX əsrin 70-ci illərindən sonra məclis üzvlərinin şeirlərində sosial ədalətsizliyin tənqidi daha da genişləndi. Realizm cərəyanının getdikcə güclənməsinə baxmayaraq, ədəbi məclislərin bir sıra üzvləri qəzəl ədəbiyyatının təqlidçiləri olaraq qalmış, səthi aşiqanə qəzəlçilikdən, təriqətçilikdən uzaqlaşa bilməmişdilər. Məclis şairlərinin heç biri dindən uzaq olmamışdır. Lakin onların dindarlığı iki cür idi. Bəziləri geridəqalmış dünyagörüşünə malik olan, dövrün ictimai

[17] Yenə orada, II c., II hissə, s. 154.

problemlərinə laqeyd yanaşan və hər bir mövhumata kor-koranə inanan fanatiklər idi. Bəziləri isə dindar olsalar da, dünyaya ağıl və düşüncə gözü ilə baxan, həyat həqiqətlərini götür-qoy edən, xalq və vətən təəssübü çəkən, millətin maariflənməsi yolunda can yandıran, insanları ədalətə, haqq tərəfdarı olmağa, humanizmə, zəmanə ilə ayaqlaşmağa çağıran şairlər idi.

Məlum olduğu kimi, orijinal əsərlərlə yanaşı, Şərq ədəbiyyatına daha çox xas olan, özünəməxsusluğu ilə seçilən nəzirəçilik XIX əsrdə, xüsusən ədəbi məclislərin qızğın fəaliyyət göstərdiyi dövrdə xeyli güclənmişdi. Bu dövrdə Saib Təbrizi, Cami, Hafiz, Sədi, Nəvai, Nabi, Füzuli kimi şairlərin əsərlərinə çoxlu nəzirələr yazılırdı. Bəzən belə nəzirələr bir məclis dairəsindən çıxır, qiymət qoyulmaq üçün başqa məclisə göndərilirdi. Məlum olduğu kimi, Füzulinin «Olmaz» rədifli qəzəlinə nəzirə yazdıqdan sonra qiymət qoyulmaq üçün «Beytüs-Səfa» şairləri onu Şuşaya – "Məclisi-fəramuşan»a göndərmişdilər. Bundan sonra Şuşadakı hər iki ədəbi məclisin üzvləri həmin qəzələ nəzirələr yazmışdılar. Həm də bir qəzələ bu qədər nəzirə cəmi bir ayın içərisində yazılmışdı. Beləliklə, nəzirəçilik hər bir şairin sənətkarlıq qüdrətini bildirmək üçün bir növ ədəbi yarış xarakteri almışdı. Nəzirələr təkcə klassiklərin şeirlərinə yox, məclis üzvlərinin qəzəllərinə də yazılırdı. Bu cəhətdən Natəvan və S.Əzimin qəzəlləri daha çox tənzir edilirdi. Şuşa şairləri Natəvanın, demək olar ki, bütün qəzəllərinə nəzirə demişlər. Əgər ayrı-ayrı divan, cüng və fraqmentlərdən Natəvan və S.Əzimin qəzəllərinə deyilmiş nəzirələr bir yerə toplanarsa bu, irihəcmli bir divana bərabər olar.

Lakin bu dövrdə nəzirəçiliyin gücləndiyini etiraf etməklə onu da göstərmək lazımdır ki, qafiyəcə eyni olan qəzəllərin heç də hamısına nəzirə kimi baxmaq düzgün deyildir. Bəzən müəyyən bir münasibətlə eyni rədif və eyni qafiyəli bir neçə qəzəl yazılırdı. Bunların yazıldığı konkret dövr və səbəblər

öyrənildikdə aydın olur ki, həmin qəzəllər həm də nəzirəçilik yolu ilə deyilməmişdir. Məsələn, “Məclisi-üns» şairlərindən bir neçəsinin «Ağlama», «Getmə», «Ölmə» kimi qəzəlləri vardır ki, bunları nəzirə hesab etmək olmaz (irəlidə bu barədə danışılacaqdır).

Mətbu ədəbiyyatda XIX əsr məclislərinin adlarına ilk dəfə F.Köçərlinin rus dilində yazdığı «Azərbaycan türklərinin ədəbiyyatı» əsərində rast gəlirik. Köçərli bu kitabçasında ədəbi məclislər haqqında oxuculara belə məlumat verirdi: «… Zaqafqaziyanın bir çox şəhərlərində müxtəlif poetik adlar altında, məsələn, «Beytüs-səfa», «Beyti-xamuşan» (“Məclisi-fəramuşan»nın digər adıdır – N.Q.), «Darüs-sürur» və sair bu kimi ədəbiyyat dərnəkləri olmuşdur. Ayrı-ayrı dərnəklər arasında dostluq əlaqələri mövcud olmuş, bu dərnəklər bir-biriləri ilə məktublaşmışlar. Bu dərnəklərin nümayəndələri: Şuşada-Abdulla bəy Asi, Şamaxıda – Hacı Seyid Əzim, Yelizavetpolda (Gəncədə – N.Q.) Mirzə Mehdi Naci, İrəvanda – Mirzə İsmayıl Bəzmi, Qazaxda – Kazım bəy Salik olmuşdur»[18].

Həmin əsərində F.Köçərli XIX əsrin 60-cı illərində Azərbaycan ədəbiyyatını «ən səmərəli və xoşbəxt bir dövr» kimi səciyyələndirmiş, “Məclisi-fəramuşan»ın üzvlərindən A.Asinin yaradıcılığından, onun Şirvan şairləri ilə məktublaşmasından bəhs etmiş, Mehdiqulu xan Vəfa, M.Ə.Növrəs, M.R.Fəna və s. şairlərin adlarını çəkmişdir. Daha sonra Köçərlinin «Azərbaycan ədəbiyyatı tarixi materialları» kitabında haqqında məlumat verdiyi 83 şairdən on yeddisi (A.Bakıxanov, S.Əzim, M.M.Naci, A.İ.Zəbih, A.Asi və başqaları) bu və ya digər ədəbi məclisin üzvü olmuşdur. Lakin Köçərli bu şairlərdən ancaq bir-ikisinin bu və ya digər məclisin üzvü olduğunu göstərmişdir.

---

[18] Кочарлинский Ф. Литература Азербайджанских татар. Тифлис, 1903, с. 43.

F.Köçərlidən sonra tarixçi Rəşid bəy İsmayılov «Müxtəsər Qafqaz tarixi» adlı kitabında ədəbi məclislər haqqında belə bir məlumat vermişdir: «Hər şəhərdə məclislər təşkil olunub ədəbiyyatı vüsətləndirməyə səy edirdilər. Hətta bu maarif firqələri bir məkana cəm olub təhrirat və təlifata məşğul olurdular. Məcmə etdikləri məkanların hər birinin məxsus adları var idi. Məsələn: «Beytüs-səfa», «Beyti-xamuş», «Darüs-sürur»[19]. Məlumatdan görünür ki, o, bu faktları F.Köçərlinin yuxarıda adı çəkilən əsərindən almışdır.

Ədəbiyyatşünas Hənəfi Zeynallı 1928-ci ildə yazdığı «Azərbaycanda Mirzə Fətəli əsri» məqaləsində ədəbi məclislərdən də bəhs etmişdir. Orta əsrlər ədəbi məclis şairlərinin səciyyəvi xüsusiyyətlərini göstərən müəllif yazırdı ki, onlar mədhlər, qəsidə mərsiyə, qəzəl və həcvlər yazırdılar. Qarabağ, Şamaxı və Bakı məclisləri isə «bir tərəfdən onların öz yazıları üzərində işləmələrinə imkan verirsə, o biri tərəfdən də nəzirəçiliyi bir az da irəli sürümüş olur. Böylə şeir yazanlar əksəriyyətlə özlərindən sonra o qədər qüvvətli parçalar buraxmış adamlardır ki, vaxtlarını işrətlə keçirmək, qələm, dəvat… və bu kimi mücərrəd və mənasız məsələlər üzərində tükənməz beytlər və qafiyələr yaradarlardı»[20].

H.Zeynallının məclis şairlərinə verdiyi bu qiymət birtərəflidir. Çünki onların heç də hamısı «yalnız lirik parçalar ilə ancaq söz üzərində sənət göstərməklə»[21] məhdudlaşmamışdılar. Ədəbi məclislərin təşkilatçılarından və fəal üzvlərindən olan A.Bakıxanov, Mirzə Şəfi, S.Əzim, M.T.Sidqi, H.Qaradaği, M.İ.Qasir, M.H.Didə, Ə.Cənnəti və başqaları qiymətli, orijinal əsərlər yazmış, Azərbaycan poeziyasının inkişafında mühüm rol oynamışlar. Bundan əlavə, onlar elmi əsərlər yazmış, məktəbdarlıq etmiş, özləri ana dilində dərsliklər hazır-

---

[19] İsmayılov R. Müxtəsər Qafqaz tarixi. Tiflis, 1904, s. 50.
[20] Zeynallı H. Azərbaycanda Mirzə Fətəli əsri // «İnqilab və mədəniyyət» məcmuəsi, 1928, № 3, s. 10-11.
[21] Yenə orada.

lamış, uşaqlar üçün mənalı, tərbiyəvi kiçik şeirlər, mənzum hekayələr qələmə almışlar. Ümumiyyətlə, məclis üzvlərinin bir çoxu xalq ilə qırılmaz surətdə bağlı olan ziyalılar idi. Onlar xalqın savadlanmasını, maariflənməsini, iqtisadi-mədəni tərəqqisini arzulamış, bu sahədə müəyyən xidmət göstərmişlər.

H.Zeynallıya görə, məclis üzvləri, həm də onların hamısı ancaq sözçülüklə məşğul olmuş, məzmuna fikir verməmişlər, toplanış və mübahisələri isə heç bir məqsəd güdməmişdir. Bu, ola bilsin ki, həmin ədəbi məclislərin ilk dövrlərində belə olmuşdur. Ancaq məclislərin sayı artdıqca, iştirakçıları çoxaldıqca, səs-sədası yayıldıqca bir növ kortəbiilik aradan qalxmış, hətta şairlər xarakterinə görə öz məclislərinə xüsusi adlar qoymuşlar. Belə olan təqdirdə boş-boşuna, bekarçılıq üzündən heç kəs oraya toplaşmazdı. Xüsusilə XIX əsrin ikinci yarısında məclis üzvlərinin bir çoxunu ictimai-siyasi, həyati məsələlər, hətta beynəlxalq aləmdə baş verən hadisələr daha artıq düşündürməyə başlamışdı. Əsrin sonlarında isə onların yaradıcılığında zəmanədən narazılıq, «yaman əsr»dən şikayət, fırıldaqçı mollaların və mənsəb sahiblərinin tənqidi hissediləcək dərəcədə nəzərə çarpırdı. Əgər əvvəllər belə motivlərə tək-tək şairlərin qəzəllərindəki ayrı-ayrı beytlərdə rast gəlinirdisə, sonralar Şamaxı, Şuşa, Bakı, Lənkəran, Ordubad məclislərinin bir çox üzvlərinin yaradıcılığında bu cəhət daha qabarıq şəkildə özünü göstərir. Qasirin «Əskinas», «Pul», Xəyalinin «Elədi», «Uzaq», Yüzbaşovun «Qarabağ vilayətinin adətləri», S.Əzimin şeirləri və onlarca başqalarının əsərləri buna misal ola bilər.

Yazılı mənbələrdə heç də məclis iştirakçılarının hamısı qeyd edilməmişdir. İstər M.Nəvvab və M.Müctəhidzadə, istərsə də onların təzkirələrindən istifadə edən F.Köçərli o dövrün şairlərindən ancaq bəzilərinin hansı məclisin iştirakçısı olduqlarını qeyd etmişlər. Tədqiqat zamanı müxtəlif fraqment, cüng və təzkirələrdəki şeir nümunələri bu və ya digər şairin hansı ədəbi məclisin üzvü olduğunu müəyyən etməyə imkan

verir. Misal üçün belə faktlardan birinə müraciət edək. A.Asi X.Natəvanı həcv etdikdən sonra Şamaxıdan S.Əzim, Gəncədən isə M.Naci ona tənqidi cavab yazırlar. Bu zaman Kərbəlayi Qulu Xarrat Yusifi və M.Ə.Növrəs cavab təriqi ilə bir həcv yazıb, Naciyə göndərirlər. Yusifinin həcvində oxuyuruq:

*Yusifi, Asivü Növrəs, biri Mahmud, Fəna,*
*Biri Salarü biri Sadiqi-gürgi-kühən əst.*
*Dəxi Agəhü Qara, Nazimü Məhzunü Şəhid,*
*Fənni-əşaridə hər birisi bir əhrimən əst.*
*Katibü Aşiqü Məxfivü Həkimü Müznib,*
*Azərü Sabitü Hicrivü Vəfa-ra hünər əst.*
*Ol xəbərdar, yəqin «Beyti-xamuşan» əhli,*
*Hər biri həcv yazıb, qulluğuna göndərən əst*[22].

Başqa həcvlər kimi bu cavabın da yersiz və nahaq yazıldığını qeyd etməklə yanaşı, şübhəsiz, burada adları çəkilən Yusifi, Asi, Növrəs, Mahmud bəy Kazım bəy oğlu, M.R.Fəna, Salar MİrzəHüseyn, Mirzə SAdıq Lətif oğlu, H.A.Agəh, H.Qara, Nazim, Mirzə İsmayıl Məhzun, Ə.Şəhid, M.Katib, Mirzə Məhəmmədəli Aşiq, M.Məxfi, Mirzə Məhəmmədqulu Həkim, Müznib, İ.Azər, Sabit, Mirzə Sadıq İmanxan oğlu Hicri, Mehdiqulu xan Vəfa müxtəlf dövrlərdə Şuşa ədəbi məclislərinin iştirakçısı olmuşlar.

1945-ci ildə Təbrizdə təşkil edilmiş ədəbi məclislə əlaqədar olaraq «Şairlər məclisi» adlı xüsusi bir məcmuə buraxılmışdır. Burada XIX əsrdə mövcud olmuş ədəbi məclislərdən də bəhs edilmişdir.

Filol. e. n. K.Mirbağırov öz məqalələrinin birində[23] ədəbi məclislərin adını çəkir və məclis şairlərini Füzuli təsirindən

---

[22] Köçərli F. Materiallar, II c., I h., s. 184.
[23] Mirbağırov K. Füzuli və XIX əsr Azərbaycan ədəbiyyatı // «Azərbaycan» curnalı, 1958, № 12.

yaxa qurtara bilmədiklərinə görə təqsirləndirir. Füzuli böyük söz ustasıdır. Əsrlər boyu hər bir xalq öz dahi sənətkarlarından öyrənmişdir. Zaman keçdikcə dahilərə maraq daha da artır, onlar daha dərindən tədqiq olunurlar. Bu cəhət nə qədər öyrənilənin şöhrətini artırırsa, bir o qədər də öyrənəni təkmilləşdirir, kamilləşdirir. Müxtəlif cüng və əlyazmalardan görünür ki, ədəbi məclislərdə nəzirələr fars dilində yazıldıqda şairlər daha çox Hafizin, Azərbaycan dilində olduqda isə Füzulinin qəzəllərinə müraciət edirdilər. Bizcə, azərbaycanca yazılan nəzirələrdə Füzuliyə bu qədər çox müraciət edilməsinin bir səbəbi onun qüdrətli sənətkar olması ilə əlaqədardırsa, digər səbəbi də bu qəzəllərin ana dilində yazılmasındadır. Doğrudan da, elə Azərbaycan şairi tapılmaz ki, onda Füzuli təsiri özünü göstərməsin. Lakin bu təsir məclis üzvlərində daha qüvvətli olmuşdur. Çünki məclis üzvləri bədahətən şeir dedikdə, nəzirə yazdıqda və yaxud sadəcə olaraq beytləşdikdə bu, bir növ bədii yarış şəklini alırdı. Belə kollektivdə yetişən şairdə, təbiidir ki, Füzuli şeirinin təsiri məclislərə daxil olmayan şairlərə nisbətən daha qüvvətli olacaqdı.

Bizcə, Füzuli sənətkarlığını izləyən məclis şairlərinin XIX əsr Azərbaycan ədəbiyyatındakı rolunu tamamilə yerə vurmaq, heçə endirmək düzgün olmazdı. Füzuli elə böyük şairdir ki, onun bədii ifadə vasitələrindən, dərin məzmunlu lirikasından, bir sözlə, insanı heyran edən sənətkarlığından öyrənmək, ondan yaradıcılıqda istifadə etmək böyük müvəffəqiyyət sayılmalıdır.

Akademik F.Qasımzadənin «XIX əsr Azərbaycan ədəbiyyatı tarixi» əsərində və «Azərbaycan tarixi» (II cild) kitabında da məclislərdən bəhs olunmuşdur. Hər iki əsərdə «Divani-hikmət», «Gülüstan», "Əncümənüş-şüəra», «Beytüs-Səfa», "Məcməüş-şüəra», "Məclisi-üns», "Məclisi-fəramuşan», «Fövcül-füsəha» («Azərbaycan tarixi» kitabında bu məclisin adı çəkilməyir – N.Q.) ədəbi məclislərinin təşkil olunması

barədə yığcam məlumat verilmiş, onların bir neçə üzvünün adı çəkilmişdir[24].

Filol. e. n. B. Məmmədov «Xurşidbanu Natəvanın həyat və yaradıcılığı» adlı əsərində şairənin rəhbərlik etdiyi “Məclisi-üns»dən də bilavasitə bəhs etmişdir.

Yuxarıda göstərilən mənbələrdən başqa, ədəbiyyatşünas Ə.Ə.Səidzadənin «Mirzə Şəfi Vazeh» əsərində ədəbi məclislərdən «Divani-hikmət» haqqında müfəssəl məlumat verilir[25].

XIX əsr ədəbi məclislərində iştirak etmiş şairlərdən yalnız bəzilərinin haqqında tədqiqat işi aparılmışdır. Lakin ədəbi məclislərin yığıncaqlarında fəal iştirak etmiş, onların gedişinə qüvvətli təsir göstərmiş Mirzə Həsən Yüzbaşov, Həsənəli xan Qaradaği, Məmo bəy Məmai, Məhəmmədəli bəy Məxfi, Mirzə İsa Xəyali, Mirzə Mehdi Naci, Mikayıl Seydi, Mir Möhsün Nəvvab, Molla Ağa Bixud və başqaları kimi onlarca şairlər vardır ki, onların ayrı-ayrı tədqiqat əsərlərində sadəcə adları çəkilir. S.Əzim, X.Natəvan, A.Bakıxanov, M.Şəfi, M.T.Sidqidən başqa, məclis üzvlərindən heç birinin əsəri toplanıb nəşr edilməmişdir[*].

Halbuki, belə bir iş, rəngarəngliyi ilə seçilən və buna görə də diqqəti cəlb edən XIX əsr ədəbi məclislər dövrünün ətraflı öyrənilməsi baxımından çox faydalı olardı. Geniş oxucu kütləsi məclis şairlərinin əsərləri ilə az tanışdır. Tədqiqat əsərlərində isə ədəbi məclislərin görkəmli üzvləri, eləcə də məclislərin yarandığı və davam etdiyi müddətlər, toplanışları, məşğələlərinin gedişi, xarakter və tərkibi haqqında az məlumat vardır.

---

[24] Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 1966, 116, 153, 384-386; История Азербайджана, II том, Баку, 1960, с. 120, 392.

[25] Сеидзаде А. Мирза-Шафи Вазех. Баку, 1969, с. 84-100.

[*] Qeyd: Monoqrafiyanın йазылмасындан сонракы дюврдя məclis üzvlərini bir çoxunun həyat və yaradıcılığı tədqiqat obyektinə çevrilmiş və işıq üzü görmüşdür. Bax: Ədəbiyyat siyahısı **(red. – V.M.)**

Həmin mövzu üzərində tədqiqat işi apararkən yuxarıda adları çəkilən mənbələrdən əlavə, AMEA Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunda mühafizə olunan S.Mümtaz, H.Səmədzadə, M.S.Ordubadi, M.T.Sidqi, M.Ə.Sidqi, M.Azər, M.R.Fəna və başqalarının arxiv materiallardan, həmçinin bəzi məclis üzvlərinin avtoqraf, yaxud üzü köçürülmüş əsərlərindən, XIX əsrin sonunda Tiflis və Bakıda nəşr olunmuş dövri mətbuatdan, yüzlərlə cüngdən, mindən yuxarı fraqmentdən istifadə edilmişdir. Bunlardan əlavə, Bakı, Şamaxı, Şuşa, Göyçay, Quba, Ağdam və sair rayonlarda yaşlı adamların söhbətləri nəzərə alınmış, xüsusi evlərdə olan şəxsi arxivlər, keçmişdə məscid və mədrəsə olmuş bir sıra binalarda qalan saysız-hesabsız fraqment və müxtəlif kağızlar araşdırılmışdır.

Bütün bu mənbələrdə olan XIX əsr şairlərinin, xüsusən məclis iştirakçılarının şeirləri seçilib müəyyən edilmişdir. Gətirilən faktlar və çıxarılan nəticələr məclis şairlərinin əldə olan şeirləri və XIX-XX əsr təzkirələrində verilmiş çox qısa məlumatlara istinad edir.

Tədqiqat zamanı məlum olmuşdur ki, XIX əsrdə və XX əsrin əvvəllərində bəzən eyni şairlər müxtəlif təxəllüslə (məsələn: Ə.Cənnəti – Vasifi, Əttar, Daşkəsənoğlu; M.R.Fəna – Aşiq; Cəfərqulu xan Nəva – Arif, Xan), bir neçə müxtəlif şair isə eyni təxəllüslə (məsələn: Abbasqulu ağa Bakıxanov Qüdsi, Mirzə Ağarəhim Qüdsi, İbrahim bəy Qüdsi Naseh) yazmışlar

Ədəbi məclislərdə iştirak edən şairlərin bir çoxunun adı, yuxarıda deyildiyi kimi, hələ də nəinki geniş oxucu kütləsinə, hətta elmi ictimaiyyətə belə məlum olmadığı kimi, elələri də vardır ki, ədəbiyyat tarixində bu və ya digər münasibətlə onların ancaq adları çəkilmiş, haqqında heç bir tədqiqat işi aparılmamışdır. Sənətkarlıq baxımından və mövzu cəhətdən o qədər də fərqlənməyən bu şairlərin həyatı haqqında ancaq bəzi təzkirələrdə çox qısa məlumat verilmişdir. Doğrudur, hələ S.Əzim, Mirzə İsa Ziyai, M.M.Nəvvab, M.Müctəhidzadə,

H.Qaradaği və başqaları öz təzkirələrində yaşadığı rayonlarda müasiri olduqları şairlərdən bir neçə cümlə ilə bəhs etmiş və əsərlərindən cüzi nümunələr vermişlər ki, S.Əzimin təzkirəsi nəzərə alınmazsa, bunlar sırf məhəlli xarakter daşıyır.

Məhəlliçilikdən uzaq, müxtəlif dövrlərdə yazıb-yaratmış Azərbaycan şairləri haqqında məlumat verən daha iki mənbədən də istifadə edilmişdir. Bunlardan biri Zaqafqaziya müftisi Hüseyn əfəndi Qaibovun «Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir» və F.Köçərlinin «Azərbaycan ədəbiyyatı tarixi materialları» əsərləridir. Hər biri dörd cilddən ibarət olan bu əsərlər çox böyük zəhmət və ciddi axtarışlar nəticəsində yazılmışdır. H.Qaibovun «Məcmuə»si «məşhur olan şüəra»nın şeirlərindən başqa, ədəbiyyat tarixində hələ adı çəkilməmiş bir çox şairlərlə də bizi tanış edir. Çox təəssüf ki, müəllif şeirlərindən nümunələr verdiyi şairlərin şəxsiyyəti, həyatı, təhsili və s. haqqında məlumat verməmiş və yaxud bu məqsədi qarşısına qoymamışdır. F.Köçərlinin «Material-lar»ında isə Qarabağ, Dərbənd, Quba, Şəki, Şirvan, İrəvan, Gəncə şairlərinin bir çoxu haqqında məlumat verilir, onların əsərləri təhlil edilir, imkan dairəsində XIX əsrdə Azərbaycan şairləri arasında olan əlaqələrdən də danışılır.

Bəzi nöqsan cəhətlərinə baxmayaraq, nəinki adları çəkilən təzkirə və mənbələr, hətta adi bir fraqment belə mənəvi sərvətimiz kimi xüsusi əhəmiyyətə malikdir.

XIX əsrdə Azərbaycanda, xüsusən Şuşa və Şamaxıda musiqiçilərin də xüsusi məclisi olduğu məlumdur. Lakin tədqiqat göstərir ki, “Məclisi-üns», “Məclisi-fəramuşan», «Beytüs-Səfa», “Məcməüş-şüəra» «Fövcül-füsəha» ədəbi məclislərində şairlərlə yanaşı, dövrün görkəmli xanəndə və sazəndələri də iştirak etmişlər.

Ədəbi məclislərdən «Divani-Hikmət», «Gülüstan», “Əncümənüş-şüəra» və onların üzvləri haqqında materialın azlığı üzündən geniş bəhs etmək, onların iştirakçılarından ətraflı danışmaq çətindir. Odur ki, XIX əsrin birinci yarısında

yaranmış bu məclislər və onların üzvləri haqqında müxtəsər məlumat verilmişdir. XIX əsrin ikinci yarısında təşkil edilmiş «Fövcül-füsəha», «Beytüs-Səfa», “Məclisi-üns», “Məclisi-fəramuşan», “Məcməüş-şüəra» və onların iştirakçıları haqqında materialın nisbətən çox olması həmin məclislərdən və onların üzvlərindən bir qədər geniş məlumat verməyə imkan yaratmışdır. Bütün bu məlumatlar, yuxarıda deyildiyi kimi, əsasən bu və ya digər məclis şairlərinin şeirlərindən alınmışdır. AMEA M.Füzuli adına Əlyazmalar İnstitutunda Nəvvab, Baki, Cənnəti, Yüzbaşov, Qasir, S.Əzim və başqalarının avtoqraf divanları və ya üzü köçürülmüş əlyazmaları, həmçinin vaxtilə S.Mümtazın, H.Zeynallının, Ə.Müznibin Bakı, Şamaxı, Şuşa və s. yerlərdə yazıb-yaratmış şairlərin əsərlərindən topladıqları nümunələr mühafizə edilir. Bütün bunlar XIX əsrin ikinci yarısında yaranmış ədəbi məclislər haqqında nisbətən geniş məlumat əldə etməyə imkan verir.

Maraqlıdır ki, ədəbi məclislər XIX əsrdə Azərbaycanda məşhur olmuş görkəmli şairlər tərəfindən təşkil edilmişdir. Bu şairlərin hər biri yaşadıqları şəhərin ədəbi qüvvələrini öz ətrafına birləşdirmiş, onların yaradıcılığına istiqamət vermişlər. Məsələn, Gəncə və Tiflisdə M.Ş.Vazeh, Qubada A.Bakıxanov Qüdsi, Ordubad və Naxçıvanda M.T.Sidqi, Lənkəranda M.İ.Qasir, Şamaxıda S.Əzim, Bakıda M.Cürmi, Şuşada X.Natəvan və M.M.Nəvvab belə şairlərdən olmuşlar.

Bu kitabda əldə olan materialın verdiyi imkan dairəsində «Divani-Hikmət», «Gülüstan», “Əncümənüş-şüəra», «Fövcül-füsəha», «Beytüs-Səfa», “Məclisi-üns», “Məclisi-fəramuşan», “Məcməüş-şüəra» ədəbi məclisindən, onların bir neçə görkəmli iştirakçılarından bəhs edilmiş, əsərin bütün fəsillərində xronoloci qayda gözlənilmişdir.

## I Fəsil

## «DİVANİ-HİKMƏT»

«Divani-Hikmət» ədəbi məclisi təxminən 1820-1825-ci illərdə Gəncədə Mirzə Şəfi Vazeh tərəfindən təşkil edilmişdir.

Məlumdur ki, Mirzə Şəfi ilk müəllimlik və şairlik fəaliyyətinə Gəncədə başlamışdır. O, hələ 1830-cu illərdə müəllim, şair və xəttat kimi bütün Zaqafqaziyada məşhur idi. Bu zaman Gəncədə Mirzə Məhəmmədtağı, Mirzə Mehdi Naci, Şeyx İbrahim Naseh (Qüdsi), Ağa İsmayıl Zəbih, Hacı Seyid Ziyadxanzadə və başqa şairlər yaşayırdılar. Onlar tez-tez Mirzə Şəfinin ətrafına toplaşar, elmin müxtəlif sahələrinə aid mübahisələr edər, şeir-sənətdən söhbət açar və müşairələr keçirərdilər. «Divani-Hikmət»in fəaliyyəti və onun üzvləri haqqında nisbətən müfəssəl məlumat verən Ə.Ə.Səidzadənin yazdığı kimi, fəaliyyətinin ilk illərində həmin məclisin xüsusi adı olmamışdır[26].

Mirzə Şəfinin yaradıcılığının son dövründə yazdığı əsərlərində, xüsusən farsca qəzəllərində fəlsəfi motivlər özünü göstərməyə başlayır. Çox güman ki, məclisin «Divani-Hikmət» (Hikmət evi) adlanmasının bir səbəbi məşğələlərinin məzmunu ilə əlaqədardırsa, bir səbəbi də elə buradan doğmuşdur. M.M.Nacinin bir qeydindən görünür ki, məclisin məşğələləri əsasən Mirzə Şəfinin dərs dediyi mədrəsədə keçirilmişdir. Naci belə toplanışlardan birinə işarə edərək yazmışdır:

"روزی چند نفر نشسته بودیم در هجره مرحوم میرزا شفیع. یك نظمی بود که عباسقلی آغا گفته است. ما هم خواستیم به همان سبك و قافیه چیزی درست بکنیم. اول مرحوم میرزا این فرد را فرمودند"

---

[26] Сеидзаде А. Мирза-Шафи Вазех. Баку, 1969, с. 91.

«Bir gün bir neçə nəfər mərhum Mirzə Şəfinin hücrəsində oturmuşduq. Abbasqulu ağanın dediyi bir şeir vardı ki, biz də istədik həmin səpgidə və həmin qafiyədə bir şey düzəldək. Əvvəl mərhum Mirzə bu fərdi dedi:

*Vazeh: Səbzpuş olmuş qədin ruxsari-atəşgunilə,*
*Musa-İmranə guiya Tur şəklin göstərir.*

*Naci: Tiğin almış dəstinə ol çeşmi-cəlladın sənin,*
*Canə qəsd etmək dilər, məxmur şəklin göstərir.*

*Naci: Cismi-zarımdan çıxar hicrin əlindən nalələr,*
*Böylə bir təndir tənim, zənbur şəklin göstərir.*

*Naci: Xətti-ruxsarın edib tarac hüsnün mülkünü,*
*Bir xərabə şəhr içində mur şəklin göstərir.*

*Şeyx: Göz sirişki mərdüminin nüktəsin bərbad edib,*
*Aqibət bir gün olur kim kur şəklin göstərir.*

*Şeyx: Tilbə könlüm tellər ilə asılıb, teldir səbəb,*
*Filməsəl baxqan kəsə Mənsur şəklin göstərir.*

*Şeyx: Kəhrübadik rəngi-zərdim sanmaqay bihudə kim,*
*Dərdi-eşqə uğramış, rəncur şəklin göstərir.*

*Şeyx: Dinü din nəqdin isar etsə Naseh tanq imas,*
*Bir mühəqqər töhfə ilə mur şəklin göstərir*

Mirzə Məhəmmədhəsən:

*İllər ilə müttəsil gər olsa bir kimsə əzub,*

*Bir qarı düşsə əlinə hur şəklin göstərir»*[27].

Yeri gəlmişkən qeyd etmək lazımdar ki, A. Bakıxanovun

*Gözlərin kim, aşiqə məxmur şəklin göstərir,*
*Əhli-fəqrə mərdümi-məğrur şəklin göstərir,*

-mətləli həmin qəzəlinə nəzirə olaraq Fazilxan Şeyda

*Mətləi-hüsnün, gözəl, kim nur şəklin göstərir.*
*Od urar afaqə Şirin, şur şəklin göstərir*[28].

Əsli qarabağlı olub sonralar köçərək Türkiyədə yaşayan Siraci Qarabaği[29] isə

*Kağızi-ruyində xəttün mur şəklin göstərir,*
*Ya ki, ol bir müshəfi-məstur şəklin göstərir.*

beytləri ilə başlanan qəzəllərini yazmışdır.

Nacinin başqa bir qeydində göstərilir ki, məclisin iştirakçıları Vazehin yanına toplaşar, iclası o özü açar və əvvəl öz şeirini oxuyardı, sonra həmin şeirin ətrafında qızğın yarışlar başlanardı[30].

Bəzən «Divani-Hikmət»in üzvləri bir-birilərinin evlərinə toplaşaraq orada da müşairələr keçirirdilər. Bu zaman iştirakçıların yemək-içmək xərcini ev sahibi ödəyirdi. Hətta bir dəfə növbə Hacı Seyidə çatır. Amma o, bu qonaqlıqdan boyun qaçırır. Yoldaşları M.M.Nacidən xahiş edirlər ki, Hacı Seyidi həcv etsin. Yoldaşlıq və hörmət həddini gözləyən Naci onu həcv etməyir. Bunun əvəzində Hacı Seyidi nəsihətamiz

---

[27] ƏYİ, M – 180, vər. 8 a-8b.
[28] ƏYİ, M – 180, vər. 27b-28a.
[29] Siraci Qarabağinin əsərlərinin fotosurəti prof. C.Qəhrəmanovun şəxsi arxivindədir.
[30] Сеидзаде А. Мирза-Шафи Вазех, с. 92.

sözlərlə məzəmmət edir[31]. Naci bu şeirində bütün Şərq hökmdarlarından, onların var-dövlətlərinin yer-yeksan olmasından danışır, Hacı Seyidi səxavətli, əliaçıq olmağa çağırır:

*Qaçasan gər bu ziyafətdən əzizim, hacı,*
*Gülər əhvalına vallahi sənin külli-cəhan.*
*Verəsən, vermiyəsən, sən bilisən, mən nə deyim,*
*Nacinin borcu idi, ta elədi şərhü bəyan*[32].

Məlum olduğu kimi, Mirzə Şəfi 1840-1846-cı illərdə və ömrünün son iki ilini (1850-1852) Tiflisdə yaşamışdır. O, Tiflisə getdikdən sonra məclisi orada davam etdirmişdir. Beləliklə, «Divani-Hikmət» həm Gəncədə, həm də Tiflisdə fəaliyyət göstərmişdir. Mirzə Şəfi Tiflisdə yaşadığı illərdə «Divani-Hikmət»in Gəncədəki fəaliyyətinə onun yaxın dostu Mirzə Mehdi Naci rəhbərlik etmişdir.

XIX əsrin birinci yarısında yaranmış ədəbi məclislərə nisbətən «Divani-Hikmət» daha tez şöhrət tapır. Bu da onun başqa şəhərlərlə daha çox iqtisadi, mədəni əlaqəsi olan Gəncə və Tiflisdə fəaliyyət göstərməsi ilə əlaqədardır. Az zamanda onun fəaliyyətinin sədası bu şəhərlərin hüdudundan kənara çıxır, Şəki, Şuşa, Şamaxı, Quba, hətta Təbriz və Ərdəbilə çatır. Şair-alim Mirzə Yusif Vidadi, şair və tacir Hacı Mir Yəhya Müztər, Fazil xan Şeyda, Zikri Ərdəbili onun üzvləri ilə, birinci növbədə məclisin ruhani rəhbəri Mirzə Şəfi ilə şeirləşirdilər. Hətta onlar Tiflisə gələrkən onun yığıncaqlarında bilavasitə iştirak edərdilər.

«Divani-Hikmət»in Gəncədə fəaliyyət göstərdiyi müxtəlif dövrlərdə Mirzə Şəfi Vazeh, Mirzə Mehdi Naci, Mirzə İbrahim Naseh (Qüdsi), Molla Abdulla, Hacı Abbas Şölə və

[31] ƏYİ, B – 71, vər. 19a-20a.
[32] Yenə orada, vər. 20 a.

başqaları onun müntəzəm iştirakçıları olmuşlar. Ə.Ə.Səidzadənin yazdığına görə, A.Bakıxanov Tiflisdə qulluqda olduğu vaxtlarda dövlət işi olduğu üçün tez-tez Gəncəyə gələrkən həmin məclisdə iştirak edərdi[33].

Fəaliyyətinin Tiflis dövründə «Divani-Hikmət»in iştirakçılarının sayı daha da çoxalır. O zaman Tiflisdə yaşayan Mirzə Həsən Ordubadi, Hacı Yəhya Müztər, Mirzə Yusif Vidadi, Hacı Yusif Qane kimi şairlər «Divani-Hikmət»in iştirakçılarından olmuşlar. Ə.Ə.Səidzadənin haqlı olaraq göstərdiyi kimi[34], M.F.Axundov də həmin məclisdə fəal iştirak etmişdir. Ə.Ə.Səidzadə hətta Q.Zakirin də «Divani-Hikmət»in yığıncaqlarında iştirak etdiyini güman edir ki[35], bu hələlik ehtimal olaraq qalır.

A.Bakıxanov dövlət qulluğundan istefaya çıxıb Qubada yaşadığı dövrdə ara-sıra müəyyən münasibətlə Tiflisə gəldiyi zaman «Divani-Hikmət»də iştirak edərdi. F.Bodenştedtin «Şərqdə min bir gün» adlı əsərində yazmasına görə, «Divani-Hikmət»də A.Bakıxanov ilə Mirzə Şəfi arasında qızğın elmi mübahisələr gedərmiş. O, kitabının bir yerində yazır: «Mübahisə onların hər ikisini vəcdə gətirərdi. Heyf ki, mən ondan rabitəli bir şey yaza bilmirdim. Mən Abbasqulu xandan xatirə olmaq üçün bir şey yazmağı xahiş etdim. O, «Fatma tar çalır» şeirini yazdı. Mirzə Şəfi şeirin gözəlliyini tərifləyib – «bu şeir müəllifinə yüksək şərəf və şöhrət qazandıracaqdır» - sözlərini dedi. Abbasqulu xan ayağa qalxdı və ertəsi gün tərtib etdiyi fars dilinin sərf kitabını gətirəcəyini vəd etdi[36].

Mirzə Şəfinin şəxsi həyatı haqqında olan məhdud məlumatlarla, eləcə də yaşadığı ədəbi mühitlə tanışlıq göstərir ki, azərbaycanlı şair və ədəbiyyat həvəskarları ilə birlikdə o zaman Tiflisdə yaşayan Qərbi Avropada alimləri Şərq ədəbiyyatı

---

[33] Сеидзаде А. Мирза-Шафи Вазех. Баку, 1969, с. 96.
[34] Yenə orada, s. 96-97.
[35] Yenə orada, s. 97.
[36] Ениколопов А. Поет Мирза Шафи. Баку, 1938, с. 50.

ilə yaxından tanış olmaq üçün «Divani-Hikmət»də iştirak edirdilər.

Tiflis dövründə «Divani-Hikmət»in iştirakçılarının milli tərkibinin dəyişməsi, beynəlmiləl xarakter alması təsadüfi deyildi. O zaman Tiflisdə yaşayan rus, gürcü, polyak və s. xalqların qabaqcıl elm, maarif və mədəniyyət xadimlərinin ədəbiyyat, fəlsəfə, hüquq və elmin başqa sahələri haqqında maraqlı mübahisələri, eləcə də Şərq ədəbiyyatına olan maraq onların beynəlmiləl bir məclisdə – «Divani-hikmət»də birləşməsinə səbəb olmuşdur.

Bunlardan Mirzə Şəfinin yaxın dostu İ.İ.Qriqoryevi (1826-1879) göstərmək olar. İ.Qriqoryev bir zaman Tiflis gimnaziyasında Şərq dilləri müəllimi işləmişdir. O, Mirzə Şəfi ilə birlikdə «Kitabi-türki» adlı dərslik yazmış, eyni zamanda rus ədəbiyyatı ilə yaxından tanış olmaqda dostuna əhəmiyyətli kömək göstərmişdir. Daha sonra, bir vaxt «Kavkaz» qazetinin redaktoru olan M.F.Axundovun dostu İ.A.Slivitski (1820-1874) də həmin məclisdə iştirak etmişdir. Tiflis gimnaziyasında Azərbaycan və fars dilləri müəllimi və «Turetsko-tatarski bukvar» adlı dərsliyin müəllifi L.Z.Budaqov «Divani-hikmət»in iştirakçısı olmuşdur. Məclisdə gürcü müəlliflərinin iştirakına gəldikdə, Ə.Ə.Səidzadə ancaq Rusiya coğrafiya cəmiyyətinin Qafqaz şöbəsinin üzvü İosif Xristoforoviç Mametsevin adını çəkir.

«Divani-hikmət»in yığıncaqlarında F.Bodenştedt və Q. Rozen də iştirak etmişlər ki, bu haqda «Şərqdə min bir gün» kitabında ətraflı məlumat verilmişdir[37]. F.Bodenştedt və Q.Rozenin «Divani-Hikmət»də iştirakının məclis üzvlərinin Qərb klassik şairlərinin, birinci növbədə alman şairlərinin əsərləri ilə az-çox tanış olmalarında müəyyən rolu olmuşdur[38].[2]

---

[37] Сеидзаде А. Мирза-Шафи Вазех. Баку, 1969, с. 99.
[38] Yenə orada, s. 99.

Beləliklə, «Divani-hikmət»in Gəncə və Tiflis dövrlərində onun iştirakçıları təxminən aşağıdakılardan ibarət olmuşdur: Mirzə Şəfi Vazeh, A.Bakıxanov Qüdsi, Mirzə Mehdi Naci, Şeyx İbrahim Naseh (Qüdsi), Ağa İsmayıl Zabih, Hacı Seyid Ziyadxanzadə, Hacı Abdulla, Molla Abdulla, Hacı Abbas Şölə, Mirzə Həsən Ordubadi, Mirzə Məhəmmədtağı, M.F.Axundov, Hacı Yəhya Müztər, Mirzə Yusif Vidadi, Hacı Yusif Qane, İ.İ.Qriqoryev, İ.A.Slivitski, L.Z.Budaqov, İosif Xristoforoviç Mametsev, Q.Rozen, F.Bodenştedt və b.

«Divani-hikmət»in Tiflis dövrü Mirzə Şəfinin vəfatına qədər davam etmişdir. Lakin məclis Gəncədə əvvəlki kimi qızğın olmasa da, M.Nacinin rəhbərliyi ilə onun mənzilində və ya onun həkimxanasında  təxminən şairin vəfatına qədər fəaliyyət göstərmişdir.

«Divani-hikmət»in əsas üzvləri haqqında məlumat yox dərəcəsindədir. Məclisin təşkilatçısı və rəhbəri Mirzə Şəfi Vazehə gəlincə, Ə.Ə.Səidzadənin uzun illər ərzində apardığı gərgin tədqiqatın məhsulu olan və yuxarıda adı çəkilən əsərindən sonra bir daha təkrara yol vermək yersiz olardı. Lakin məclisin digər üzvləri haqqında materialın azlığını nəzərə alaraq onun ikinci rəhbəri və görkəmli üzvü M.M.Naci haqqında qısa da olsa məlumat verməyi məqsədə uyğun bildik.

## Mirzə Mehdi Naci

XIX əsrdə yaşayıb-yaratmış Mirzə Mehdi Naci hələ sağlığında Gəncədə, həmçinin Qarabağ, Şirvan və Şəkidə istedadlı şair kimi şöhrət qazanmışdır. Şairin həyat və yaradıcılığı haqqında ilk məlumatı F.Köçərli vermişdir. O, şairin qəbir daşındakı yazıya əsaslanıb Mirzə Mehdinin 1882-ci ildə yetmiş yaşında vəfat etdiyini göstərir. Lakin şair hələ sağ ikən özü üçün hazırladığı qəbir daşında 1880-ci ilin iyun ayında

yetmiş beş yaşında olduğunu yazmışdır[39]. Bu tarixə əsaslanıb güman etmək olar ki, M.M.Naci təxminən 1805-ci ildə anadan olmuşdur. Şairin divanındakı bəzi qeydlər onun yetmiş səkkiz yaşında həyatda olduğunu sübut edir.

Nacinin həkkaklıq-xəttatlıq sənətindən bəhs edən M.X.Nemətovanın yazdığına görə, şair vəfat edərkən yetmiş səkkiz yaşı varmış. Deməк, Naci 1882-ci ildə Gəncədə vəfat etmiş və şəhərin İmamzadə qəbiristanında, özü üçün hazırladığı türbədə dəfn edilmişdir.

F.Köçərlinin qeydlərində Mirzə Mehdiyə, onun ədəbi irsinə dair faklar göstərir ki, hələ o zaman görkəmli tədqiqatçının səylərinə, axtarışlarına baxmayaraq, şairin həyatı və yaradıcılığı haqqında materialın azlığı ona müəyyən fikir söyləməyə imkan verməmişdir. Məhz buna görə də F.Köçərli yazmışdı: «Məcmuəsi var imişsə də, dağılıb tələf olubdur[40]».

Beləliklə, məlum olur ki, şairin əlyazmaları və divanı ilə F.Köçərli şəxsən tanış ola bilməmişdir.

Şərq mədəniyyətinə dərin bələd olan Naciyə öz dövründə şairlik istedadı ilə yanaşı mahir həkkak-xəttatlıq və həkimlik bacarığı da böyük şöhrət qazandırmışdı. M.X.Nemətovanın iki Gəncə xəttatına dair məqaləsində M.M.Naci həkkak-xəttatlıq sənətinin məharətli ustadı kimi səciyyələndirilmişdir. M.Nemətova bu məqaləsində Nacinin həkkak-xəttatlığı haqqında ilk dəfə tədqiqat işi aparmış, onun hazırladığı qəbir daşlarından bir neçəsinin fotosurətini də vermişdir. Tədqiqatçı yazır ki, Mirzə Mehdi Nacinin özünə, gəncəli Ələkbərə və Əli bəyə hazırladığı qəbir daşları üzərində zövqlə işlənmiş ornament və gözəl xətt nümunəsi vardır.[1]

Mirzə Mehdi Naci yaxın dostu «Qarabağnamə» əsərinin müəllifi Mirzə Adıgözəl bəy və onun oğlu Məmo ağanın qəbir

---

[39] Nemətova M. İki Gəncə həkkak-xəttatının işi haqqında // Azərb. SSR EA Xəbərləri, ictimai seriya, 1959, № 8, s. 29.
[40] Köçərli. Materiallar. II c., I hissə, s. 251.

daşlarını da xüsusi zövqlə işləmişdir[41]. Gəncə qəbirstanındakı baş daşlarına yazdığı kitabələr və ornamentlər aydın göstərir ki, Naci bu sənəti çox sevmiş, ömrünün sonuna kimi ondan ayrılmamışdır. Onun sənətkar əli adi daş parçalarını gözəl sənət əsərinə çevirmişdir.

Çox vaxt gözəl zövqlə yazılmış maddeyi-tarixi və yaxud ibrətamiz şeir parçasını daşa ayrı bir usta həkk edərdi. Mirzə Mehdi Naci belə ustalardan olmamışdır. Onun hazırladığı qəbir daşlarındakı «həkkəkə və hərrərə» sözlərindən görünür ki, o, həm həkkak, həm də xəttat olmuş, gözəl xəttini daşa məharətlə həkk etmişdir. O, ornamentlərlə bəzədiyi qəbir daşlarını Ömər Xəyyamın fəlsəfi rübailəri və ibrətamiz şeirləri ilə daha da məzmunlu, təsirli etmişdir.

Nacinin həkkaklıq sənətini tədqiq dən M.Nemətova onun AMEA Əlyazmalar İnstitutunda saxlanılan «Divan»ı ilə yaxından tanış olmuş, həmin əlyazmasını diqqətlə oxumuşdur. Gəncə qəbiristanındakı baş daşlarına yazdığı kitabələr və ornamentlər aydın göstərir ki, Naci bu sənəti çox sevmiş, ömrünün sonuna kimi ondan ayrılmamışdır. Onu sənətkar əli adi daş parçalarını gözəl sənət əsərinə çevirmişdir.

Mirzə Mehdi Naci təbibliyi ilə əlaqədar olaraq bəzən öz şeirlərini «Təbib» təxəllüsü ilə də yazmışdır. Şairin qəbir daş-larında olan imzaları bu cəhətdən diqqəti cəlb edir. Naci öz avtoqraf cüngündə də təbibliyinə işarə etmişdir. O, burada yazır ki, «1860-cı ildə Gəncə divanxanasının «sudyası» Limmerman, arvadı Məryəm (Mariya – N.Q.) və qızı ilə birlikdə bir gün mənim həkimxanama gəldilər. Mən qəzəl yazmaqla məşğul idim. Məndən xahiş etdi ki, onun arvadı və qızı haqqında bir neçə fərd qəzəl yazım. Buna görə də bu fərdləri yazıb ona verdim»[42].

---

[41] M.Nemətovanın adı keçən məqaləsi, c. 33. Nacinin Mirzə Adıgözəl bəyin oğlu Məmo ağanın qəbir daşına yazdığı beytlər şairin divanında da vardır. Bax: ƏYİ, B – 71, vər. 93 b-94a.
[42] ƏYİ, B – 71, vər. 31.

Mirzə Mehdi Naci köçüb Təbrizdə yaşayan həmyerlisi və dostu Ağa İsmayıl Zəbihlə daim əlaqə saxlamış, müntəzəm olaraq onunla məktublaşmışdır.

Ağa İsmayıl Zəbihin Naciyə göndərdiyi müxəmməslərdən birinin ilk bəndi belə başlayır:

*Ol təbibim lütfilə bu xəstəni yad eyləmiş,*
*Eyləmiş lütfü inayət, qəmdən azad eyləmiş,*
*Bu xərabə könlümün mülkünü abad eyləmiş,*
*Neçə əfrad ilə bu məcruhi dilşad eyləmiş,*
*Hikməti-Xaliq təmamən səndə icad eyləmiş*[43].

Buradakı «təbib» sözü həm məcazi mənada, həm də Nacinin həkimliyinə işarədir. Müxəmməsin başqa bir yerində isə deyilir:

*Eylərəm bir niknamın hadiyi-xeyrin sübhü şam,*
*Bu qəribü zarü məhzundan ona yüz min səlam!*
*Hüsni-əxlaqi-kərəm Allah ona vermiş təmam,*
*Bir təbibi-paknüsrət, xoş təbiət, niknam,*
*Bu sifat ilə onu Xaliq özü şad eyləmiş*[44].

Burada isə göründüyü kimi, «təbib» sözü müstəqim mənada işlədilmişdir.

Zəbih digər bir şeirində Nacidən aldığı məktuba işarə edərək yazırdı:

شاد باش ای دل مجروح که اینك ز طبیب
از ره لطف و کرم بهر تو درمان آمد
مژده ده ای دل که مرا نامه دلدار رسید

---

Nacinin səkkiz beytdən ibarət olan fars dilində yazdığı həmin qəzəllərini burada verməyi lazım bilmədik (N.Q).

[43] ƏYİ, M – 180, vər. 75b.

[44] Yenə orada, vər. 77a.

روح بر جان من آمد که ز جانان آمد[45]

*(Şad ol, ey yaralı könlüm, indicə təbibdən,*
*Lütfü-kərəm yolu ilə sənə dərman gəldi.*
*Mücdə, ey dil ki, mənə nameyi-dildar çatdı,*
*Cananımdan canıma sanki təzə can gəldi[*]).*

Avtoqraf təzkirəsinin sonunda Gəncə şairlərindən bir neçəsinin adını çəkən Mir Möhsün Nəvvab da Mirzə Mehdi Nacinin təbib olduğunu yazmışdır.

Başqa bir misal: Nacinin özünün tərtib etdiyi cüngdə belə bir qeydi vardır:

یکی از سیاهان به بنده نوشته بود بجهت خرج راه...

(Səyyahlardan biri yol xərci üçün bəndəyə yazmışdır)[46].

Bu qeyddən sonra yazılan şeirdən aydın olur ki, Gəncədə olan naməlum bir səyyahın yol xərci qurtardığı üçün Nacidən borc pul istəmişdir. Həmin şeirdə səyyah Naciyə «təbib» deyə müraciət etmişdir:

طبیب درد هر بیچاره ها هستی
خراباتی و رند می پرستی

*(Biçarələrin dərdinin təbibisən,*
*Xərabatisən, rindsən, mey həbibisən).*

Nacinin təbibliyindən danışarkən bir məsələnin üzərində xüsusi dayanaq. M.Tərbiyətin «Danişməndani-Azərbaycan» əsərində Təbib təxəllüslü bir şairin adı çəkilir[47]. Mirzə Əhməd Cəfərin «Məcmuətül-əşar» adlı kitabına istinad edən müəllif

---

[45] Yenə orada, vər. 72b.
[*] Kitabdakı farsca şeirlərin bədii tərcüməsi t.e.n. N.Musalıya aiddir **(red. – V.M).**
[46] Yenə orada, vər. 70a.
[47] Məhəmmədəli Tərbiyət. Danişməndani Azərbaycan. Bakı, 1987, s. 328.

həmin şairin farsca bir qəzəlini vermiş, şəxsiyyəti haqqında isə bir şey yazmayıb, ancaq gəncəli olduğunu qeyd etmişdir. Pənahi Makulu da «Danişməndani-Azərbaycan»a istinad edərək «Ədəbi məlumat cədvəli» adlı bioqrafik kitabında Gəncədə belə bir şairin olduğunu qeyd etmişdir[48]. Tədqiqat nəticəsində müəyyən edilmişdir ki, Təbib təxəllüslü həmin şair, haqqında danışdığımız gəncəli Mirzə Mehdi Nacidir.

Nacinin əlyazmalarındakı qeydlərindən aydın olur ki, onun xüsusi həkimxanası olmuşdur. O, xəstələri burada müalicə edər, onlara pulsuz dərman verərdi. Vaxtının çox hissəsini öz həkimxanasında keçirən Naci asudə vaxtlarını şeir yazmağa sərf edərdi. Bir dəfə dostu Mirzə Adıgözəl bəyin oğlu Məmo ağanı titrətmə tutmuş, dərman üçün Nacinin yanına adam göndərmişdi. Naci də dərmanla birlikdə aşağıdakı beyti yazıb dostuna yollamışdır:

*Al səhhətimi, qoy mərəzin canıma gəlsin,*
*Vallahi deməm hiç bu sevda zərər oldu*[49].

Naci bir təbib kimi təkcə Gəncədə yox, onun ətraf kəndlərində, hətta Qarabağ və Şəmşəddin mahallarında belə, məşhur olmuşdur. Bəzən onu həmin mahallara xəstə üstünə də aparardılar[50].

Nacinin təbibliyi haqqında olan faktlar ədəbiyyatşünaslardan çox Azərbaycanda xalq təbabətinin inkişaf tarixini öyrənənlər üçün maraqlıdır.

Mirzə Mehdi Nacinin cüngündə Hafiz, Sədi, Şəms Təbrizi və başqaları ilə yanaşı, İbrahim bəy Azər, Mirzə Ələsgər Növrəs Qarabaği, Qüdsi Ordubadi, S.Ə.Şirvani, Fazil xan Şeyda, Şahin, Ağa İsmayıl Zəbih, Səbuhi və başqa şairlərin də şeirləri vardır. Bu cüngdə başqa şairlərə nisbətən A.İ.Zəbihin

---

[48] Makulu P. Ədəbi məlumat cədvəli. Bakı, 1962, s. 365.
[49] ƏYİ, B – 71, vər. 35a.
[50] Yenə orada, vər. 40b, 41b.

şeirlərindən daha çox nümunələr verilmişdir ki, onların əksəriyyətini o, Təbrizdən dostu Naciyə yazmışdır. Bu mənzum məktublardan görünür ki, Zəbih Təbrizə köçməmişdən əvvəl Mirzə Mehdi Naci ilə şeir məclisində olmuş, müşairələrdə iştirak etmişdir. Zəbih Təbrizdə olarkən daim vətəni Gəncənin həsrətində olmuş, onun xəyalı ilə yaşamışdır. Şeirlərinin ümumi ruhunda qürbət eldə vətən həsrəti ilə çarpışan şairin könül iniltiləri əks olunmuşdur. Qəlbi həmişə ana yurdun həsrəti ilə çırpınan şair heç olmazsa bircə dəfə Gəncəyə gəlib duz-çörək kəsdiyi, özünün ustadı hesab etdiyi Naci ilə söhbət etməyi arzulayır. O, Naciyə yazdığı bir müxəmməsində:

*Eylədi əhbablərdən bir nəfər məndən sual:*
*Görməmişdim səndə mən bu təbi-şeiri ta be hal,*
*Kim sənə təlim edib, kimdəndi bu kəsbi-kəmal?*
*Söylədim: oldu mənə bu mürşidimdən intiqal,*
*Bu Zəbihi Naciyi-fərxəndə irşad eyləmiş*[51] -

deyərək şairliyi, şeir sənətini Nacidən öyrəndiyini etiraf etmişdir. Bu və digər şeirlərinin məzmunundan aydınlaşır ki, Təbrizə getməzdən əvvəl Zəbih «Divani-hikmət»də iştirak etmiş və bir şair kimi yetişməsində Nacinin ona böyük təsiri olmuşdur.

Məlumdur ki, Abdulla bəy Asinin Xurşidbanu Natəvanı həcv etməsi açıqfikirli şairlər tərəfindən narazılıqla qarşılanmışdı. S.Ə.Şirvanidən sonra Asiyə ikinci töhmətamiz cavab yazan Mirzə Mehdi Naci olmuşdur. Onun öz avtoqrafında bu haqda belə yazılmışdır:

"از شعرای قاراباغ عاصی تخلص از حسد خود دختر مهدی قلی خانرا هجو گفته به گنجه فرستاده بود و دیدم که در میان ناس میخوانند و خنده میکنند. با

[51] ƏYİ, M-180, vər. 76b.

وجود اینکه جدش مرد حلاج بوده، خان مرحوم آورده، مقرب درگاه خود ساخته، منصب بیگزاده داد. هنوز بیگزاده است. این صفت او بسیار ناخوشم آمد. وجهی د گر آن بود که از نواده گان مرهوم جواد خان بود. از ره تعسب بجواب ایشان مشغول شدم و بر خودشان فرستادم".

«Qarabağ şairlərindən Asi təxəllüslü birisi paxıllığından mərhum Mehdiqulu xanın qızına həcv yazıb, Gəncəyə göndərmişdi. Mən gördüm ki, camaat arasında onu oxuyub gülüşürlər. Halbuki onun babası həllac olmuş, mərhum xan onu gətirib öz sarayına yaxın eləmiş, bəyzadəlik mənsəbi vermişdi. İndi də bəyzadədir. Onun bu sifəti mənə heç xoş gəlmədi. Digər tərəfi də budur ki, mərhum Cavad xanın nəvələrindəndir. Təəssüb üzündən ona cavab yazmaqla məşğul oldum və özünə göndərdim[52]».

Bu həcvdə Naci Asinin namünasib, yersiz hərəkətini kəskin tənqid etmişdir.

Yuxarıda qeyd edildiyi kimi, Asinin həcvindən sonra S.Ə.Şirvani ilə Naci Natəvanı müdafiə etmişdir. M.Ə.Növrəs və Xarrat Qulu Yusif isə Asini müdafiə edərək Naciyə həcv yazmışlar.

Nacinin irəvanlı şair Molla Abbas, salyanlı Molla Səfər, trabzonlu Molla Hüseynə yazılmış mənzum məktubları göstərir ki, o, başqa şəhərlərdə olan şair və alimlərlə əlaqə saxlamış, onlarla məktublaşmışdır. Naci Tiflis və İrəvanda olmuş, hətta şeirlərinin bir qismini həmin şəhərlərdə yazmış, gürcü qızlarının məlahət, vəcahət və nəzakətlərini nəzmə çəkmişdir.

İstər Azərbaycanın başqa şəhər və mahallarından Gəncəyə gələn alimlər, şairlər, istərsə də xarici ölkələrdən olan səyyahlar Gəncədən keçərkən Naciyə qonaq olardılar. Məsələn, 1867-ci ildə Hacı Hidayət Təftişi, yenə həmin ildə Molla Abdulla Xeybəi, 1872-ci ildə Ağa Şeyx Cəlaləddin Bürucərdi, Hacı Məhəmməd Təbrizi kimi səyyahlar Gəncədə olan zaman

---

[52] ƏYİ, B – 71, vər. 48 a.

Naci ilə görüşmüş, bəzisi bir neçə gün ona qonaq olaraq arifanə söhbətlər etmişlər[53].

M.M.Nacinin ədəbi irsindən AMEA M.Füzuli adına Əlyazmalar İnstitutunda saxlanan iki kiçik əlyazmada Azərbaycan və fars dillərində yazılmış qəzəl, müxəmməs, təxmis, mürəbbe, həcvlər və s. qalmışdır. B-131 şifrəli 46 vərəqdən ibarət birinci əlyazma avtoqraf, 128 vərəq həcmində olan B-71 şifrəli əlyazma isə Mirzə Ələkbər adlı katib tərəfindən köçürülmüşdür.

Nacinin şeirlərinin əksəriyyəti aşiqanə məzmundadır. Lakin şairin ictimai məzmunlu əsərləri də yox deyildir. İstər şairin şəxsi həyatını, istərsə də XIX əsrdə baş vermiş aclıq ilində xalqın düçar olduğun müsibəti təsəvvür etmək üçün «Taxıl qıtlığı və şəhər əhlinin hamisi»[54] adlı şeiri diqqəti cəlb edir. Həmin şeirdə güzəranı ağır keçən şair zəmanəsindən şikayətlənərək deyir ki, mən cavanlıqdan ta bu vaxta kimi bir ləzzətli yemək-içmək görmədim, heç bir əməl, sənət mənə kömək eləmədi.

Şeirin ruhunda bir bədbinlik, küskünlük görünürsə də, bunu bilavasitə şairin şəxsi həyatının ağır keçməsi ilə əlaqələndirmək lazımdır. Naci var-dövlət hərislərinə, acgözlüklə sərvət toplayanlara müraciət edərək deyir:

*Yığışdırma bu dünyanın malını,*
*Görmürsənmi anın qilü-qalını,*
*Bir fikr elə, gözüm, anın dalını,*
*Özünə yetişməz ondan bir xeyrat.*

*Adam var ki, bircə kömmə yapammaz,*
*Adam var ki, bircə çörək tapammaz,*
*Adam var ki, Allahından utanmaz,*

---

[53] ƏYİ, B – 71, vər. 2 a.
[54] Yenə orada, vər. 111 a-112 b.

*Gündə gəlir daxılına min manat*[55].

XIX əsr realist şeirinin nümunələrindən olan bu əsərdə Gəncədəki bahalıq təsvir olunur. Pulu din və imandan üstün tutan, xalqın bir çörəyə möhtac olduğu vaxtda buğdanı anbara yığan möhtəkirlər sadə və anlaşıqlı dil ilə tənqid atəşinə tutulur.

XIX əsrin ikinci yarısında din xadimlərinin tənqidi, mövhumat və fanatizm əleyhinə yazılar getdikcə çoxalırdı. Bu cəhət M.Nacidə də özünü göstərirdi. Elə yuxarıda adı çəkilən şeirdə o, mollaları tənqid edərək deyirdi ki, belə bir qəhətlik vaxtında onlar da insaf və mürüvvəti atmışlar. O, mollaların xəbis hərəkətlərinə görə, ona bir «sədəmə» toxunmasın deyə, məsciddən baş götürüb qaçır:

*Minnət qəbul eyləmənəm hər itdən,*
*Geyərəm əynimə qədəhdən, çitdən.*
*Onun üçün qaçaram mən məsciddən,*
*Dəyməsin bunlardan mənə sədəmat*[56].

«Dünya və onun əhlinin məzəmmətində» şeirində Allahı vəsf etdikdən sonra ona müraciətən yazırdı:

*Xudavənda, sən özün bu dirhəmü dinarı xar et,*
*Odur bais bu xəlqi-ruzigarın felinə billa…*

*Ümumən xəlq talibdir ki, etsin cəm simü-zər,*
*Xüsusən pürtəməhdir onlar içrə firqeyi-molla*

*Nə xof eylər cəhənnəmdən, nə cənnət arzu eylər,*
*Bilirlər özlərin hirs ilə çox kamilü illa*[57].

[55] ƏYİ, B – 71, vər. 111 b.
[56] Yenə orada, vər. 112 a.

Naci həmin şeirində belə bir qənaətə gəlir ki, insanları bir-birindən asılı edən səbəblərdən başlıcası puldur, simü zərdir. Pul, simü zər (qızıl-gümüş) toplamaq, var-dövlət artırmaq üçün insanlar hər cür fəlakətlər törətməyə hazırdırlar.

Mirzə Mehdi Naci sözün əsl mənasında bütün ömrünü həmvətənlərinə sərf etmişdir. O, xəttat və ornamentçi rəssam kimi öz həkkaklıq sənəti ilə qəbir daşlarını bəzəmiş, təbib, əczaçı kimi xalqın səhhətinin keşikçisi olmuş, şair kimi isə gözəl əsərləri ilə şeir-sənət pərəstişkarlarının zövqünü oxşamışdır. Lakin təəssüflər olsun ki, bu nadir sənətkarın bədii irsindən və həkimliyinə dair əsərlərindən az nümunə qalmışdır. Xüsusən onun təbabətə dair əməllərini əks etdirən müalicə üsulu, nüsxəbəndlik qaydalarından yazılı bir sənəd qalmamışdır.

---

[57] ƏYİ, B – 71, vər. 122 a.

## II Fəsil
## «GÜLÜSTAN»

«Gülüstan» XIX əsrin birinci yarısında təşkil edilmiş ilk ədəbi məclislərdəndir. Bu dövrdə yaranmış digər məclislər kimi, onun da fəaliyyəti və üzvləri haqqında məlumat yox dərəcəsindədir. Bu məclisin əsasını zəmanəsinin görkəmli alim və şairi Abbasqulu ağa Bakıxanov Qüdsi qoymuşdur. Səfalı Qubanı gülüstana bənzədən Bakıxanov təşkil etdiyi ədəbi məclisi də «Gülüstan» adlandırmışdır.

«Gülüstan» ədəbi məclisi haqqında ilk məlumatı F.Köçərli vermişdir. Onun yazdığına görə, bu məclisin təşkilində A.Bakıxanova dostu qubalı axund Abdulla yaxından kömək etmişdir[58]. Lakin F.Köçərli «Gülüstan»ın nə vaxt təşkil olunması və onun üzvləri haqqında heç bir söz yazmamışdır. Ondan sonra prof. F.Qasımzadənin[59], filologiya elmləri namizədi K.Mirbağırovun[60] əsər və məqalələrində, həmçinin «Şairlər məclisi» məcmuəsində[61] həmin məclisin adı çəkilir. F.Qasımzadə və K.Mirbağırov «Gülüstan»ın 1835-ci ildə təşkil edildiyini göstərirlər. «Azərbaycan tarixi» kitabında isə onun 1830-cu illərdə yarandığı qeyd edilir[62]. Ə.Ə.Səidzadə əsaslandığı mənbəyi göstərmədən «Gülüstan»ın 1819-cu ildə fəaliyyətdə olduğu fikrini söyləyir[63].

---

58 Köçərli F. Materiallar. II c., II hissə. s. 282.
59 Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. s. 116.
60 Mirbağırov K. Füzuli və XIX əsr Azərbaycan ədəbiyyatı / "Azərbaycan" curnalı, 1958, N 12.
61 Şairlər məclisi məcmuəsi. s. 385.
62 История Азербайджана. II т. Баку, 1960, с. 120.
63 Сеидзаде А. Мирза-Шафи Вазех. Баку, 1969, с. 88.

Məlum olduğu kimi, A.Bakıxanov 1819-cu ilin dekabrında Qafqaz canişini dəftərxanasına mütərcim vəzifəsinə təyin olunmuşdu. Rəsmi dövlət qulluğunda olduğu müddət ərzində o, elmi fəaliyyətə meyil edir, biliyini artırmağa çalışır, yazacağı əsərlər üçün məlumat toplayırdı. Həyatını elmə həsr etmək istəyən A.Bakıxanov 1833-cü ildə dövlət qulluğundan azad olmaq üçün o vaxt Rusiyanın Polşa canişini olan, oradakı ordunun baş komandan, Qafqazın keçmiş canişini qraf Paskeviçə bu barədə kömək üçün müraciət edir.

Bu münasibətlə qraf Paskeviç xarici işlər naziri V.K.Nesselroda məktub göndərir, ondan xahiş edir ki, maaşı verilmək şərtilə A.Bakıxanovun işdən azad edilməsinə nail olsun.

1834-cü ildə I Nikolayın əmri ilə A.Bakıxanov maaşı verilmək şərtilə uzun müddətli məzuniyyətə buraxılır və Qubaya qayıdaraq, 1835-ci ildən etibarən atasının Əmsar kəndində olan malikanəsində yaşamağa başlayır.

Güman etmək olar ki, A.Bakıxanov «Gülüstan» ədəbi məclisini Tiflisə getməzdən əvvəl təşkil etmişdir. Lakin hələlik bu barədə, yuxarıda deyildiyi kimi, nə Ə.Ə.Səidzadə istinad etdiyi mənbəyi göstərir, nə də bizim əlimizdə bir sənəd vardır. Biz belə zənn edirik ki, A.Bakıxanov «Gülüstan» məclisini dövlət qulluğundan azad olub Tiflisdən Qubaya qayıtdıqdan sonra «Divani-hikmət»in təsiri ilə təxminən 1835-ci ildə təşkil etmişdir.

A.Bakıxanovun ədəbi-elmi fəaliyyətinin ən fəal və qızğın çağları da məhz rəsmi dövlət qulluğundan azad olub asudə yaşadığı illərə təsadüf edir. Onun «Təhzibül-əxlaq», «Gülüstani-İrəm» və bir sıra ədəbi-elmi, fəlsəfi əsərləri də bu dövrdə yazılmışdır. Şübhəsiz, A.Bakıxanov Qubada olduğu vaxtlar «Gülüstan» ədəbi məclisinin yığıncaqları da müntəzəm keçmişdir. 1841-ci ildə rus alimi Berezin ilə fransız alimi qraf

---

Bütün mənbələrdə həmin məclisin adı "Gülüstan" göstərildiyi halda Ə.Səidzadə onu A.Bakıxanovun kitabının adı ilə "Gülüstani-İrəm" adlandırır (N.Q).

Syuzane Şərqə etdikləri səyahət zamanı Qubadan keçmiş və orada A.Bakıxanovla tanış olmuş, onun «Gülüstani-İrəm» əsərini görmüşlər[64]. Güman ki, onlar «Gülüstan» məclisində də olmuşlar.

«Gülüstan» ədəbi məclisi təşkil edildikdən az sonra Quba və onun ətraf kəndlərində geniş şöhrət tapır.

Məclisə A.Bakıxanovun rəhbərlik etməsi buraya çoxlu həvəskarların gəlməsinə səbəb olur. Lakin bu ədəbi məclisə «əsasən Bakıxanovun dost və tanışları gəlirdilər[65]». Məclisdə iştirak edənlərin heç də hamısı şair deyildilər. Onlar A.Bakıxanovun arifanə söhbətlərinə qulaq asmaq üçün onun ətrafına toplaşaraq məclisin canlı keçməsinə şərait yaradırdılar. Buraya toplaşanlar klassik Şərq ədəbiyyatının Firdovsi, Nizami, Cami, Hafiz, Füzuli və b. kimi görkəmli nümayəndələrinin əsərlərini oxuyub təhlil edir, onlara nəzirələr yazırdılar. Bəzən Dərbənd şairləri də Qubaya gələrək, «Gülüstan»ın yığıncaqlarında iştirak edirdilər.

A.Bakıxanov «Gülüstani-irəm» əsərinin rusca tərcüməsi və nəşri ilə əlaqədar olaraq tez-tez Tiflisə getdikdə məclisin məşğələləri dayanırdı. Bakıxanovun vəfatından sonra «Gülüstan» ədəbi məclisinin fəaliyyəti zəiflədi və sonralar tamam kəsildi. F.Köçərli yazır ki, A.Bakıxanovun vəfatından sonra bir müddət bu məclis pozulmuş və şeir bazarı kasad olmudur[66].

Bu məclis ədəbi-ictimai aləmdə «Beytüs-Səfa», “Məclisi-üns», “Məclisi-fəramuşan», “Məcməüş-şüəra» kimi təsir buraxmamışdır.

A.Bakıxanovun həyat və yaradıcılığı, fəlsəfi görüşləri və elmi fəaliyyəti haqqında geniş tədqiqatlar aparıldığından biz yalnız «Gülüstan» ədəbi məclisinin son nümayəndələrindən hesab etdiyimiz Mirzə Möhsün «Xəyali» təxəllüslü şair haqqında imkan dairəsində məlumat verməyi lazım bilirik.

---

[64] H.Səmədzadənin arxivi, ƏYİ, Arx. 21, Q – 2 (26).
[65] Köçərli F. Materiallar. I c., II hissə, s. 282.
[66] Yenə orada, s. 282.

## Mirzə Möhsün Xəyali

Yaradıcılığının ilk dövrü «Gülüstan» ədəbi məclisinin son illərinə təsadüf edən Mirzə Möhsün Xəyali təxminən 1824-cü ildə Qubada anadan olmuşdur. Mirzə Möhsün ilk təhsilini atasından almış, onun köməyi ilə fars dilini mükəmməl öyrənmiş, sonra dövrünün müqtədir alimlərindən sayılan Molla Əli Axundun məktəbində təhsil almışdı.

Bir müddət Qubada məktəbdarlıq edən Mirzə Möhsünün həyatı çox ağır keçmişdir. Belə ki, Qubanın xurafat və cəhalət aləmində məktəbə soyuq münasibət gənc Mirzə Möhsünün pedaqoci fəaliyyətinə mane olurdu, onu mənəvi cəhətdən sıxırdı. Bu zaman artıq «Gülüstan» məclisi də fəaliyyət göstərmirdi. Böyük arzularla yaşayan gənc müəllim ictimai həyatda hər gün şahidi olduğu təzadlı hadisələrin mahiyyətini dərk edə bilməsə də, xalqın mədəni tərəqqisinə ciddi maneçiliyini görür və ürəkdən kədərlənirdi. Onun aşiqanə lirikasında zəmanədən şikayət, kədər və ümidsizlik motivləri bu cəhətdən səciyyəvidir. Müdərrislikdən başqa gəlir yeri olmayan şairin vəziyyəti getdikcə çətinləşir və o, Bakıya köçməyə məcbur olur.

Rus dilini yaxşı bilən Mirzə Möhsün müdərrislikdən əl çəkərək, quberniya idarəsində qulluğa girir. Bu dövrlərdə o, ədəbi fəaliyyətini də davam etdirir, müasirləri arasında bir şair kimi şöhrət tapır.

**Mirzə Möhsün Xəyali** 1904-cü ildə 80 yaşında ikən Bakıda vəfat etmişdir.

M.M.Xəyalinin ədəbi irsindən yarımçıq bir «Divan»[67] və bəzi əlyazmalarda[68] bir neçə şeiri qalmışdır ki, bunlar da üç yüzə qədər qəzəldən ibarətdir.

---

[67] ƏYİ, B – 514.
[68] ƏYİ, B – 1523, B – 2677.

Bakı mühiti M.M.Xəyalinin yaradıcılığına ciddi təsir göstərmişdir. Belə ki, onun ilk qəzəllərində, prof. F.Qasımzadənin qeyd etdiyi kimi, dini motivlərdən ibarət olduğu halda Bakıda yaşadığı illərdə yazdığı qəzəllərdə əsasən dünyəvi eşq tərənnüm edilir. Sadə, anlaşıqlı dildə yazılmış bu qəzəllərdə saf məhəbbət, azad eşq, hicrandan şikayət, vüsal həsrəti, daxili kədər, vəfasız gözəllərdən giley-güzar səmimiliklə qələmə alınmışdır[69]. Əsas etibarilə klassik poeziyanın davamçılarından olan Mirzə Möhsün Xəyali dövrün bir sıra şairləri kimi qəzəlçilikdən irəli gedə bilməmişdir.

[69] Azərbaycan ədəbiyyatı tarixi, II c., s. 61.

III Fəsil

## «ƏNCÜMƏNÜŞ-ŞÜƏRA»

“Əncümənüş-şüəra» ədəbi məclisi 1838-ci ildə Ordubadda Şıxəli Naib tərəfindən təşkil olunmuşdur[70]. Təşkil edildiyi ilk vaxtlara nisbətən, sonralar məclisin fəaliyyəti zəifləmişdi. Lakin 1860-70 illərdə Hacağa Fəqir Ordubad şairlərini ətrafına toplayaraq məclisi canlandırmışdır. Fəqirin vəfatından sonra “Əncümənüş-şüəra» yenə də dağılmaq üzrə idi. Bu zaman M.T.Sidqi bir çayxanada onun fəaliyyətini davam etdirməyə müvəffəq olur. Prof. Ə.Şərif «Görkəmli müəllim və şairimiz» adlı məqaləsində yazır: «1880-ci illərdə Sidqi Ordubadda bir çayxana, daha doğrusu, çayxana adı ilə bir qiraətxana, qəzetxana, kitabxana, bir sözlə, mədəni klub açır və xaricdən aldığı qabaqcıl qazetlərlə bərabər müştərilərinə özü yazdığı qəzəlləri oxuyur, söhbətlər edir, elm və mədəniyyət uğrunda təbliğat aparır, mövhumat və xurafat azarına tutulmuş ordubadlıların gözlərini açmağa çalışır[71]». Beləliklə, həmin məclisə bir zaman H.Fəqir, ondan sonra isə M.T.Sidqi rəhbərlik etmişdir. Məclisin yarandığı ilk dövrlər haqqında əldə müfəssəl və mötəbər məlumat yoxdur.

Sidqi Ordubaddan Naxçıvana köçdükdən sonra orada da şəhərin şeir həvəskarları və arif şəxsləri onun ətrafına toplaşırdılar. Fəaliyyətinin müxtəlif dövrlərində Ordubad, Naxçıvan və ətraf kəndlərdə yaşayan bir sıra gözüaçıq şəxslər və şairlər həmin məclisin toplanışlarında iştirak etmişlər. Heç bir yazılı mənbədə ədəbi məclis üzvlərinin siyahısı olmadığından

---

[70] Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. s. 386; M.S.Ordubadinin arxivi, ƏYİ.
[71] “Şərq qapısı” qəzeti. Naxçıvan, 18 noyabr, 1955, N 138.

onları ancaq həmin məclisin iştirakçılarının əsərlərindən müəyyən etmək olur. XIX əsrin birinci yarısında yaşamış Quba və Gəncə şairləri kimi, Ordubad və Naxçıvan şairlərinin də əsərlərindən çox az nümunə qalmışdır. Şübhəsiz ki, "Əncümənüş-şüəra»nın fəaliyyətində olduğu müddətdə Naxçıvan və Ordubadda yazıb-yaradan M.T.Sidqi, H.Fəqir, Cani Ordubadi, Hacı Mirzə Ağarəhim Qüdsi Ordubadi (Vənəndi), Möhtərəm Ordubadi (Vənəndi), Möhtərəm Ordubadi, Molla Məhəmməd Ordubadi, Əhmədağa Şəmi, Usta Zeynal Nəqqaş, Molla Hüseyn Bikəs, Məşədi Həsən Dəbbağ, Salik Ordubadi, Nadim Naxçıvani, Mirzə Mehdi Naxçıvani və qeyriləri "Əncümənüş-şüəra»nın iştirakçıları olmuşlar.

Bu şairlərdən ancaq Fəqir və Məmmədtağı Sidqinin əsərlərinin az bir hissəsi, digərlərinin isə bəzi cüng və fraqmentlərdə bir neçə qəzəli bizə gəlib çatmışdır ki, bunlardan Mirzə Ağarəhim Qüdsinin iki qəzəli diqqəti cəlb edir.

Mirzə Ağarəhim Qüdsi

Şairin həyatı haqqında məlumat yoxdur. Mirzə Mehdi Nacinin tərtib etdiyi bir cüngdə[72] onun iki, başqa bir cüngdə[73] isə iki-üç qəzəli vardır. Əldə olan bu bir neçə şeiri göstərir ki, Qüdsi Ordubadi özünəməxsus üslub və ifadə tərzinə malik, orijinal qafiyələr işlətməyi sevən şair olmuşdur. Məsələn, onun qəzəlindən verdiyimiz nümunələrə diqqət edək:

*Şanənin qəsdi nədir, çəkməz əlin birçəkdən?*
*Mən kimi aşiq olub zülfə məgər görcəkdən?*

*Mahi-ruyin görəli ayinə heyrandı sənə,*
*Göz götürməz, gözəlim, çirkin olan göyçəkdən*[74].

---

[72] Cüng, ƏYİ, M – 180, vər. 18 b.
[73] Cüng, ƏYİ, D – 377, vər. 199 a-200a.
[74] Cüng, ƏYİ, M – 180, vər. 18 b.

Orijinal ifadə və təşbehlərlə yanaşı bu qəzəldə işlənən «birçəkdən», «görcəkdən», «göyçəkdən», «milçəkdən» «gerçəkdən», «dölçəkdən» (mal-qara, qoyun və şairənin əmcəyi), «ögcəkdən» (evcikdən), «çəkçəkdən» (su dəyirmanında olan «çax-çax»), «dilçəkdən» (burada boğazdan mənasında işlədilmişdir), «sərçəkdən» (sərçədən kiçik, kolluqlarda olan bir quşun adıdır) kimi sözlərə klassik poeziya nümunələrində çox az təsadüf edilir, bəziləri isə birinci dəfə işlədilir. Bu cəhətdən şairin aşağıdakı qəzəli daha maraqlıdır:

*Zülfün nə səbəbdən yenə aşüftələnibdir?*
*Çöhrən nə cəhətdən qızarıb şəftələnibdir?*

*Bir busə, dedim, ver mənə pünhan, dedi: get, get,*
*Bir dürri-girənmayə məgər müftələnibdir?!*

*Mən taciri-eşqəm, mənə sat qəmzə mətain,*
*Hər kimsə məni görsə desin: «Süftələnibdir».*

*Geysu deməsin zülfə binaguşə düşübdür,*
*Bir əfidi gülşəndə gəzər, xoftələnibdir.*

*Dolmuşdu qubar ilə könül hicr qənimdən,*
*Göz yaşı ilə vəh, necə gör rüftələnibdir!*

*Tök zülfünü ruxsarə, desinlər nəzər əhli,*
*Gün çöhrəsi pərvin ilə hər həftələnibdir.*

*Görgəc səni lal oldu dilim, ha demə cana,*
*Bais nədi, Qüdsi, bu qapı cəftələnibdir*[75].

[75] Cüng, ƏYİ, M – 180, vər. 19 a-19 b.

Bu qəzəldə də hər şeydən əvvəl diqqəti cəlb edən yeni qafiyələrdir. Biz danışıq dilində «cəftələmə» sözünü işlədirik. (Qapını cəftələ, qapını cəftələyiblər, cəftələdim və s.). Lakin «aşüftə», «şəftə», «siftə», «rüftə», «həftə» kimi fars sözlərini işlədiriksə də indiyədək, nə danışıqda, nə də yazılı ədəbiyyatda həmin sözlər əsasında yaranmış «aşüftələnmək», «siftələnmək», «müftələnmək», «həftələnmək», «xüftələnmək», «rüftələnmək» kimi ifadə və qafiyələrə rast gəlinməmişdir. Bir də, Qüdsi Azərbaycan dilində təsadüf edilməyən fars sözü «rüftə»ni bizim dilimizdə işlənən şəkilçi vasitəsilə azərbaycanlılaşdırmışdır (rüftələnibdir).

Qüdsinin heca vəznində də gözəl qoşmaları vardır. Təəssüf ki, belə orijinal yaradıcılıq üslubuna malik olan sənətkarın ədəbi irsi itib-batmış, ondan ancaq üç-dörd qəzəl və bir-iki qoşmadan başqa nümunə qalmamışdır.

“Əncümənüş-şüəra» şairlərindən Hacağa Fəqir və Məmmədtağı Sidqi, yaradıcılıq mövzusu və əsərlərinin ictimai əhəmiyyəti baxımından diqqəti cəlb edir.

## Hacağa Fəqir Ordubadi

XIX əsrdə Ordubad ədəbi mühitində yetişən və itifikirliyi, hazırcavablığı, rəvan təbi ilə fərqlənən şairlərdən biri də görkəmli ədib M.S.Ordubadinin atası Hacağa Fəqirdir.

H.Fəqir təxminən 1836-cı ildə Ordubadda tacir ailəsində anadan olmuşdur. Dövrünə görə dünya görmüş atası ticarətlə əlaqədar tez-tez Şiraz və Təbriz şəhərlərinə gedərdi. Bu şəhərlərdə özünə yaxın dostlar qazanan atası kiçik Hacağanı həmin şəhərlərdə olan alim şəxslərin yanına qoyub, imkan dairəsində onun savadlanmasına şərait yaratmışdır. İyirmi beş yaşına kimi həmin şəhərlərdə qalan Hacağa ərəb-fars dillərini mükəmməl öyrənir, Şərq klassiklərinin yaradıcılığı ilə

yaxından tanış olur. Ordubada qayıtdıqdan sonra o, müdərrislik edir və “Əncümənüş-şüəra»da fəaliyyət göstərir.

Fırıldaqçı mollaları, zalım və mərhəmətsiz mənsəb sahiblərini tənqid edən əsərlər yazdığına görə Hacağa və onun yaxın dostu, həmməsləki M.T.Sidqi, Ordubad kimi fanatik bir mühitdə avam camaat tərəfindən heç bir rəğbət görmədikləri üçün köçərək, bir müddət Türküstan və İranda yaşamağa məcbur olmuşlar. Bu iki məslək dostu ancaq bu zaman bir-birilərindən ayrı düşmüşlər. Qalan vaxtlarda həmişə birlikdə fəaliyyət göstərmişlər. Bir müddət müxtəlif şəraitdə yaşamaları onların həmin dövr yaradıcılığına da öz təsirini göstərmişdir. Fəqir Türküstandan qayıtdıqdan sonra “Əncümənüş-şüəra» ilə əlaqəsini kəsməmiş, onun yığıncaqlarında fəal iştirak etmişdir. Ömrünün son illərində məişəti ağır keçən şairin gözləri tutulur. Bu zaman onun dediyi şeirləri dostu Sidqi yazıb toplamışdır. Məclis üzvlərindən Bikəs və Nadim də bu işdə ona kömək edirdilər. Çox güman ki, Fəqirin əldə olan əsərlərini də vaxtilə onlar toplamışlar.

Fəqir 1885-ci ildə təxminən qırx doqquz yaşında vəfat etmişdir. Fəqirin Azərbaycan və fars dillərində müxtəlif şeirləri toplanmış «Gülşəni-ürfan» adlı divanı, bəzi cüng və əlyazmalarda bir neçə qəzəli qalmışdır. Şairin yaradıcılığında Azərbaycan şairlərindən Füzulinin, İran şairlərindən isə Xəyyam, Sədi və Hafizin nəcib təsiri görünməkdədir.

XIX əsrdə çox yayılmış olan nəzirəçilik elə bir şəkil almışdı ki, ondan xilas olmaq çətin məsələ idi. Xüsusən ədəbi məclislərin üzvü olan şairlər bu bəlaya daha çox mübtəla olmuşdular. Fəqirin qəzəllərində də bu cəhət özünü aydın göstərir.

Fəqir şeirlərinin əksəriyyətini azərbaycanca yazmışdır. Ömrünün son çağlarında dövrünün müasir və aktual mövzularına meyil göstərən şairin əsərlərində tənqidi realizm motivləri daha çox hiss olunur. Lakin onun ictimai xarakterli şeirlərinin çoxu itib-batmışdır. Fəqirin bu qəbildən olan əsərlə-

rində köhnəlik və mütrəce adətlər pislənir, mollalar, çavuşlar, koxalar, rəislər, qubernatorlar tənqid olunur. Bu cəhətdən onun «Kürdün çul satması» və «Şikayət» əsərləri xüsusilə səciyyəvidir.

Mövzu və ideya cəhətdən orijinal əsər olan «Kürdün çul satması» (başqa bir nüsxədə əsər «Fatı və qubernator» adlanır) mənzum hekayətinin qısa məzmunu belədir:

Rəvayətə görə, İrəvanda çoxlu sürüsü və ilxısı olan bir şəxsin arvadı toxuduğu gözəl at çulunu ərinə verib deyir ki, bunu apar, şəhərdə qırx manata sat. Həmin pulla Gülpəriyə, Nazpəriyə, Mahpəriyə nimtənə, tumanlıq, köynəklik, Şirvan şalı, saqqız, güzgü, daraq çətkən, evə yalavaclıq, çobana və özünə müxtəlif şeylər, eşşəyə noxta, palan və sair şeylər al.

Kəndli çulu şəhərə gətirir. Üç gün bütün şəhəri küçəbəküçə gəzdirirsə də, qırx manata heç kəs onu almayır. Yorulub bezmiş kişi çulu şəhərin qubernatoruna bağışlamaq qərarına gəlir və belə xəyal edir ki, o da bunun əvəzində çoxlu bəxşiş verər.

Bu təmənna ilə o, çulu gətirib qubernatora verir və deyir ki, bu çulu sənə bəxşiş gətirmişəm. «Yaranal» (general) «xoroşo» və «malades» deyərək çulu alır, əvəzində isə ona heç nə verməyir. Kişi evə qayıtdıqda arvad çulu neçəyə satdığını və tapşırdığı şeyləri alıb-almadığını soruşur. Əri cavab verir ki, «yaranal» çula «üç xoroşo», «bir malades» verdi. Bunu eşidən arvad ərini danlayır və onu da götürərək şəhərə, qubernatorun yanına gəlir. Qubernator arvadın sifətinin ciddiliyini görüb səbəbini soruşur. Qadın çul satan kişinin arvadı olduğunu bildirir və deyir ki, sən o çula «üç xoroşo», «bir malades» vermisən ki, bununla da bizim qarnımız doymaz. Bunu eşitcək qubernator qəh-qəhə çəkib gülür və cavab verir ki, «mən sizə lütfi-bihədd qılaram». O biçarələr də sevincək evlərinə qayıdırlar. Bununla da əsər bitir.

Əsərdə təsvir edilən gözəl əl qabiliyyətinə malik Fatı adlı qadın mübarizliyi, cəsarət və ağıllılığı ilə qat-qat üstündür. Bu

sifətlərinə görə o, sadəlövh əri Şamodan fərqlənərək, zəhmətinin hədər getməsinə razı olmayır, toxuduğu çulun dalınca hətta qubernatorun qapısına qədər gedir. Zəhmət və zövqlə toxuduğu çulu ondan geri almaq istəyir. Hətta divan əhlinin zülmkarlığından şikayətlənərək qubernatorun üzünə:

*Niyə zülm eyliyə, bilməm, ümənayi-divan?!*[76]

-dedikdən sonra maymaq ərinin verdiyi çulun müqabilində «aldığı» sözləri onun üzünə çırpır:

*Vermisən ol çula sən üç «xoroşo», bir «malades»,*
*Veririk hər kəsə, verməzlər bizə bircə soğan.*

*Ya pulu, ya çulu ver, istəmirik biz «xoroşo»,*
*«Malades» qarnımızı sir eləməz, istiri nan*[77].

Qubernatorun çox ustalıqla sancıldığı bu əsəri şair belə bitirir:

*Ey əzizim, sənə ibrətdi bu söz, eylə qəbul,*
*Xəlqdən çəkməgilən gərdənə çox bari-giran.*

*Yox səxavət əsəri xəlqdə, yum çeşmi-təməh,*
*Nədi hər ləhzə qubernat qapısı, xidməti-xan.*

*Ey Fəqir, çəkməgilən çox da dəni minnətini,*
*Söyləmə cifədən ötrü dəxi həcvü hədyan*[78].

Burada şair «yox səxavət əsəri xəlqdə» deməkdə heç də «qara» camaatı, ümumi xalqı nəzərdə tutmamış, əksinə, mənsəb sahiblərinin, vəzifə başçılarının xəsis olduğunu demək

---

[76] ƏYİ, Arx. 33, Q – 11 (255).
[77] Yenə orada.
[78] Yenə orada.

istəmişdir. Bunu sonrakı «Nədi hər ləhzə qubernat qapısı, xidməti-xan?!» misrasından da aydın görmək olur.

Əgər Fəqir «Kürdün çul satması»nda bir nəfər vəzifə sahibinin-qubernatorun xəsis, tamahkar və səxavətdən uzaq olmasını göstərirsə, «Şikayətnamə» əsərində riyakar və yalançı axundları, şöhrət düşgünü molla və hacıları kəskin tənqid edir. Burada Hüseynə təkyə tutub ağlamaqdan əsas məqsədi öz zəngin ev-eşiyini, var-dövlətini göstərmək olan, səliqə ilə qəhvə, çay və qəlyana xərc çəkən hacılar belə xarakterizə olunur:

*Ziyafət eyləyər adı çıxmağa, deyər ehsan,*
*Qəbul olmaya bu «xeyirlər», xətadəndir.*

*Plov yeyənləri yeksər yığıb, qalıb aclar,*
*Görüm evi yıxıla, belə iş rizadəndir?*[79]

Nə qədər xarakter faktdır: ehtiyacı olanlar, ac-yalavaclar, plov üzünə həsrət qalanlar yada düşməyir, həmişə plov yeyənləri imam ehsanına plov yeməyə dəvət edirlər. Ehtiyacı olanlar bir tərəfdə qalır, imkanlılar təmin olunurlar. Maraqlı cəhət budur ki, həm də şəriətə zidd belə işi məhz ruhanilər, şəriət xadimlərinin özləri edirlər.

Qırx səkkiz beytdən ibarət olan bu əsərində müəllif şöhrətpərəst hacıların, iddialı axundların, xilaf fitva verən qazıların, riyakar zahidlərin, xalqı əcəlsiz ölümə düçar edən həkimlərin, bəxşiş xatirinə növhə, mədhiyyə yazan şairlərin, hiyləgər dərvişlərin, şişib «qabana dönən» rəislərin, xalqı ölü soyan kimi çapıb-talayan koxaların, ümumiyyətlə, cəmiyyətin bu kimi tüfeyli ünsürlərinin işlətdikləri bəd əməllərdən şikayətlənir.

[79] ƏYİ, Arx. 38, Q – 16 (337).

Təəssüf ki, bu maraqlı şairin ciddi şeirlərin hamısı əldə edilməmişdir. Onun bizə məlum olan qəzəllərində orijinal bir keyfiyyət olmadığı üçün onlardan bəhs etməyi lazım bilmədik.

### Məmmədtağı Sidqi

XIX əsrin ikinci yarısında yetişən görkəmli maarifçilərdən biri də bacarıqlı pedaqoq, istedadlı şair Məmmədtağı Sidqidir. Sidqi Azərbaycan mari fitarixində müəyyən xidmətlər göstərmiş, Həm də qabaqcıl fikirli bir şair kimi tanınmışdır[*].

Məmmədtağı Kərbəlayı Səfər oğlu Səfərov (Sidqi) 1854-cü ildə Ordubad şəhərində anadan olmuşdur. Onun atası ordubadlı, anası isə Üçtübindən, məşhur şair Əbülqasım Nəbatinin bacısıdır. Rəvayətə görə, şairin xırda alverlə məşğul olan atası tez-tez Üçtübinə gedərmiş. Burada o, Nəbatinin ailəsi ilə yaxından tanış olur, onun bacısı Tuti xanımı sevir və onunla evlənir.

Məmmədtağı təhsilini o zamanın görkəmli alimi hesab edilən ordubadlı Məmmədtağı adlı bir nəfərdən almış, ərəb-fars dillərini mükəmməl öyrənmişdir. Gənc yaşlarında Xorasan, Nişapur, Səbzəvar və s. yerlərə səfərlər etmiş, gəzdiyi yerlərin alimləri, əhalisi və xalqın güzəranı ilə tanış olmuşdur. Bu səyahətlər zamanı Şərq xalqlarının məişəti, iqtisadiyyatı, ümumi mədəni səviyyəsi onun diqqətini cəlb edir, şairdə öz xalqına olan vətənpərvərlik hissini daha da gücləndirir. O, səyahətdən qayıtdıqdan sonra Ordubadda bir məktəb açmaq istəyir. O zaman Ordubad mühitində mollaxanadan fərqli, yeni tipli məktəb açmaq çətin idi. Sidqi öz niyyətini Ordubadda qohum-əqraba cəhətdən qüvvətli, həm də qabaqcıl ziyalılardan və dövlətlilərdən olan Hüseyn Soltan Kəngərliyə bildirir. H.S.Kəngərli onun bu fikrini bəyənir. Lakin ilk dəfə ayrıca olaraq xüsusi binada belə məktəbin açılmasının çətin olacağını

---

[*] Bax: Qədimov Ə. Məhəmməd Tağı Sidqinin həyat və yaradıcılığı. Bakı, Çaşıoğlu, 2004, 151 s. **(red. – V.M)**

başa düşür və camaat bu işə pis nəzərlə baxmasın deyə, məktəbi Zəhirüddövlə İbrahim xan məscidinin üst mərtəbəsində yerləşdirməyi məsləhət görür.

Beləliklə, Sidqi 1885-ci ildə Ordubadda ibtidai məktəb açır və müdərrislik edir. Həmin məktəb o zaman İstanbulda çıxan və Sidqinin müntəzəm olaraq oxuduğu «Əxtər» qəzetinin adı ilə adlandırılır. Ordubad mühitində məscid və mollaxanadan fərqli yeni tipli məktəb açan Sidqi, təbiidir ki, müəyyən çətinliklərlə məruz qalır. Əvvələn varlılar öz uşaqlarını ruhani məktəblərində oxutduqları üçün onun məktəbinə rəğbət bəsləməyirdilər. Fanatik yoxsulların isə az bir qismi uşaqlarını yeni məktəbə göndərirdilər. Odur ki, əvvəllər məktəbə çox az şagird gəlirdi. Uşaqların və xüsusən valideynlərin rəğbəti qazanmaq, onlarda yeni məktəbə olan soyuq münasibəti aradan qaldırmaq üçün Sidqi hər gün günorta üstü uşaqları mədrəsə həyətinin ortasındakı hovuzun kənarına gətirər, dəstəmaz aldırıb namaz qıldırardı.

Digər çətinlik isə tədris işi ilə bağlı olan dərslik məsələsi idi. Köhnə tədris kitabları yeni üsullu məktəbin işinə yaramırdı. Odur ki, yeni dərslik tələb olunurdu. Sidqi şagirdləri buraxdıqdan sonra hər gün məktəbdə qalar, növbəti məşğələ üçün material tərtib edər, uşaqların yaşına uyğun xüsusi tərbiyəvi mənzumələr yazardı. Bu yolla o özü hazırladığı mövzular əsasında dərs keçərdi.

Mollaxana təlimindən fərqli olaraq, Sidqi uşaqlara əvvəlcə ancaq oxumağı yox, eyni zamanda yazmağı da öyrədirdi. Öz məktəbində təlim-tərbiyə işinə ciddi fikir verən Sidqinin səyi nəticəsində şagirdlər az müddətdə Azərbaycan və fars dillərində rəvan oxuyub-yazmağı öyrənirlər. Uşaqların tezliklə bu cür savadlandıqlarını görən camaatın məktəbə rəğbəti artır.

Sidqi gələcəkdə yeni üsul ilə dərs deyəcək müəllimlər də hazırlayırdı. Ordubadda açılan məktəbin gözəl nəticəsini görən Naxçıvan camaatı orada da belə məktəb açmaq qərarına gəlir. Onlar bu məqsədlə 1892-ci ildə M.T.Sidqini Naxçıvana dəvət

edirlər. Sidqi həmin ildə Naxçıvana gəlir. Əvvəlcə məhəllə məscidləri yanındakı köhnə üsul ilə davam edən molla məktəbini birləşdirir. Orada dörd sinifli bir məktəb təşkil edərək, özü də onun müdiri olur. Getdikcə şagirdlər çoxaldığı üçün bina darısqallıq edir. Sidqinin təşəbbüsü ilə 1896-cı ildə yeni məktəb binası tikilir. Həmin ildən yeni binaya köçən məktəb «Məktəbi-tərbiyə» adlanır. Sidqi bu münasibətlə təşkil etdiyi yığıncaqda demişdir: «Məktəb, məktəb dediyimizdə məqsudimiz həman məmaliki-İraniyyədə və sair biladi-müslimində qeyri-müntəzəm surətdə üsuli-cədid üzrə milli məktəblər bina olunub, o məktəblərdə türki (Azərbaycan – N.Q.), farsi, ərəbi və rusi dillərin təhsil və təliminə davam olunsun. Hər yüz evli qəryədə yeni bu cür məktəblərin təsisi lüzum görüləcəkdir[80]».

Demək, Sidqi yeni üsul üzrə məktəbdə ərəb və fars dilləri ilə yanaşı, Azərbaycan və rus dillərinin də tədris edilməsinin vacib bilirdi ki, bu da o dövrün maarifində mühüm məsələ idi. O, ana dilinin tədrisinə xüsusi əhəmiyyət verərək həmin nitqində demişdi: «Əsri-haliyyədə yer üzündə hər qövm və hər tayfa danışdığı lisan ilə yazışır. Biz Qafqazda sakin olan türklər (azərbaycanlılar – N.Q.) aləmi-ədəbiyyatdan kənar düşmüşük ki, hənuz məlum ola bilmir ki, bizlər türk ola-ola, irsal və mərsulumuzun farsi olmağına səbəb nədir? Bəyan olunsun ki, görək, aya, bizlər ərəb lisanından nə əxz etmişik və farsi zəbandan nə saxlamışıq? Rus dilindən nə öyrənmişik, türk dilimiz nə halətə düşüb[81]». XIX əsrin sonunda məhz Naxçıvan mühitində bu cür atəşli nitqi doğma ana dilini müdafiə edib, öz dilinə, xalqının halına ürəkdən yanan maarifpərvər bir vətəndaş – şair edə bilərdi.

Naxçıvanda işlədiyi müddət onun pedaqoci fəaliyyətinin daha ciddi dövrü olmuşdur. Yeni əlifba, yeni məzmunlu dərs-lik, dünyəvi elmlərin tədrisi, tərbiyəvi-əxlaqi mövzuda əsərlər

---

[80] Sidqi M.Ə. Xatirələr. ƏYİ, Arx. 25, Q – 2 (56).
[81] Yenə orada.

yazmaq onun gündəlik məşqələ və vəzifəsi olur. O, burada əlifbada yazı, tədrisdə ana dili məsələlərini ortaya atır. Hələ Ordubadda ikən İran, Türkiyə, Misir, Bağçasarayla müntəzəm əlaqə saxlayır, o yerlərdə nəşr olunan «Həblül-mətin», «Sürəyya», «Pərvəriş», «Tərcüman» kimi məcmuələri alır, dünya xəbərləri və başqa xalqların həyatı ilə tanış olurdu. Naxçıvana gəldikdən sonra bütün bunların təsiri ilə onun əsərlərində artıq həyati mövzular, dövrün aktual məsələləri özünü daha qabarıq şəkildə göstərməyə başlayır.

Qafqazın böyük şəhərlərində tək-tək rus-müsəlman məktəbləri olsa da, nəinki Ordubadda, hətta Naxçıvanın özündə belə məktəb yox idi. Bu işin nə qədər çətin olduğuna baxmayaraq, M.T.Sidqi fikrindən dönməyir. Hüseyn Soltan Kəngərli bu işdə ona kömək edərək öz hesabına Sidqinin dərs dediyi məktəbə skamya və qeyri ləvazimat alır. Hətta camaat uzaqlaşmasın deyə, məktəbi məscidin üst mərtəbəsində yerləşdirir.

Məlum olduğu kimi, heç bir xüsusi pedaqoci təhsili olmasına və təcrübəsinin azlığına baxmayaraq, Sidqi şəxsi bacarığı, xüsusi marağı sayəsində məktəbi təkbaşına idarə edir, məktub yazaraq İstanbul və Baxçasaraydan dərsliklər gətirdir. Özü də şagirdlər üçün dərsliklər hazırlayırdı. Bütün bunların nəticəsində az bir zamanda şagirdlər müstəqil surətdə oxuyub yazmağı öyrənirlər.

Cəlil Məmmədquluzadə həmin məktəbi səciyyələndirərək yazırdı ki, «Məktəbi-tərbiyə» biz yeniyetmə müəllim və ədiblər üçün də bir darül-ürfan hesab olunurdu[82].

Məktəbdə sinif otaqları çoxaldıqdan sonra buraya Sidqidən başqa daha üç nəfər müəllim dəvət olunmuşdur. Şagirdlərə Azərbaycan, ərəb, fars dilləri, hesab, coğrafiya, tarix fənləri ilə yanaşı, gündə bir saat rus dili də öyrədilirdi.

---

[82] Şərif Ə. Görkəmli şair və müəllimimiz // Şərq qapısı, 1955, 18 noyabr.

Sidqi köhnə üsul məktəblərində yalnız «fiqh» və «üsul» dərslərinin keçirilməsini tənqid edərək göstərirdi ki, elm ancaq bunlardan ibarət deyildir. O öz məktəbində coğrafiya dərsi deməyi vacib bilərək, məktub yazıb «Tərcüman» qəzetindən dərslik alır. Lakin oradan göndərilən kitab yeni üsul ilə təşkil edilmiş məktəbdə tədris üçün yaramadığına görə Sidqi özü sadə və aydın, həm də ana dilində coğrafiya dərsliyi tərtib etməyə məcbur olur. Azərbaycan dilində ilk coğrafiya dərsliyi olan bu kitabını o, nəşr etdirmək qərarına gəlir və bu barədə Bakıya, S.M.Qənizadənin adına bir məktub göndərir. Həmin məktubunda Sidqi yazırdı: «Məxdumi-möhtərəm cənab Nəriman bəyin zati-alilərinə ixlaslı və məhəbbətli salam edirəm. «Tərcüman» qəzetindən coğrafiya risaləsi gətirmişəm. Amma məktəbimizdə lazım ola bilməz. Bəndə özüm bir coğrafiya kitabçası tərtib etmişəm. İstəyirəm bilim ki, aya, onu Badikubədə mümkündür çap etmək və qərarü mədarı və xərci-təsərrüfatı nə növ ilə və nə qədər olur? İstida edirəm ki, məlum buyurasınız. Hərgah mümkündür, xidmətinizə göndərim. Və bir növ ilə də cəm etmişəm ki, Azərbaycan dilinin şivəsincə, ümidvar oluram ki, çap olunsa çox-çox iş görə. Çünki hənuz Azərbaycan dilində coğrafiya kitabı təsnif olunmayıb. Mühibbiniz: Məşədi Tağı müəllim Ordubadi Sidqi[83]».

Dövlət tərəfindən heç bir yardım almayan müəllimlər ancaq şagirdlərdən alınan tədris haqqı və ildə bir dəfə camaatdan toplanan pul hesabına təmin olunurdu. Bu qayda bir neçə il davam etdikdən sonra nəhayət, İrəvan quberniyası məktəblər direktorluğu onu rus-tatar məktəbi qaydasına salmağı qərara alır. Onlar əvvəlcə Sidqini müdirlikdən çıxarırlar və özünə də bildirirlər ki, əgər İrəvanda xüsusi imtahan verməsə müəllimlikdən də kənar ediləcəkdir. Sidqi İrəvanda imtahan verir və 1902-ci ildə Zaqafqaziya ruhani

---

[83] ƏYİ, Arx. 25, Q – 7 (175).

idarəsi tərəfindən «prixod» müəllimi adına attestat alıb, müəllimliyini davam etdirir.

M.T.Sidqi 1903-cü ildə dekabr ayının axırlarında Qarabağlar kəndində bir dostunun evində qonaq ikən qəflətən vəfat etmişdir.

Qabaqcıl maarif xadimi yeni üsul ilə açılan məktəblərin banilərindən biri, xalqının maariflənməsi uğrunda bütün həyatını sərf edən M.T.Sidqinin vəfatı münasibəti ilə M.S.Ordubadi[84], Rasizadə Naxçıvani[85], Cəlil Məmmədquluzadə[86] hüznlü şeir və məqalələr yazaraq, öz kədər və təəssüflərini bildirmişlər.

Məmmədtağı Sidqi ilk yaradıcılığına qəzəl, qəsidələr yazmaqla başlamışdır. Lakin onun əsl yaradıcılığı Naxçıvan həyatı ilə bağlıdır. Həm Ordubadda, həm də Naxçıvanda müəllimliyi ilə əlaqədar olaraq ictimai-fəaliyyəti onun dünyagörüşünə də müsbət təsir etmişdir. Şərq ədəbiyyatı ilə yanaşı o, rus klassiklərinin əsərlərini də öyrənməyə xüsusi həvəs və səy göstərirdi. Sidqi 1899-cu il mayın 26-da A.S.Puşkinin anadan olmasının yüz illiyi münasibətilə «Məktəbi-tərbiyə»də keçirilən xüsusi yığıncaqda böyük və məzmunlu bir nitq söyləmişdir.

Sidqi Naxçıvana gəldikdən sonra da mətbuatla əlaqəsini kəsməmiş Corc Zeydanın ərəb dilində nəşr etdiyi «Əlhilal» curnalını, Misirdə Əli Məhəmməd Kaşaninin nəşr etdiyi «Sürəyya», Kəlküttədə çıxan «Həblül-mətin» qəzetlərinin müntəzəm abunəçisi olaraq qalırdı. O, «Əxtər» qəzetinə iki və «Tərcüman» qəzetinin on illiyi münasibətilə Azərbaycanca bir mənzum təbrik yazmışdır. Sidqinin məşhur ərəbşünas tarixçi C.Zeydan və Mirzə Əlixan Kaşani ilə məktublaşmaları olmuşdur. Onlar şairə yazdıqları məktublarında ondan öz qəzetləri üçün məqalələr yazmağı xahiş edirdilər.

---

84 "Şərqi-rus" qəzeti,1904, 4 yanvar.
85 "Şərqi-rus" qəzeti,1904, 23 yanvar.
86 "Şərqi-rus" qəzeti,1904, 30 yanvar.

O, Naxçıvanda olarkən dərsdən sonrakı asudə vaxtlarını qabaqcıl ziyalılardan sayılan Qurbanəli Şərifzadə, Nəsrulla Şeyxov, Əsədağa Kəngərlinski, C.Məmmədquluzadə, Paşa Sultanov, Nəcəfqulu ağa və başqaları ilə arifanə söhbətlərdə keçirərdi.

Ə.Şərif yazır ki, «onun ən yaxın dostu və məsləkdaşları Cəlil Məmmədquluzadə, Qurbanəli Şərifzadə, Əsəd ağa Kəngərli (ali təhsilli hüquqşünas), Cümşüd bəy (Paşa ağa) və Eynəli Sultanovlar, Mirzə Məmmədqulu Novruzov, müəllimlərdən Mirzə Əliməmməd Xəlilov, Mirzə Ələkbər Süleymanov, Əbülqasım Sultanov, qocaman maarifpərvər Ağaməhəmməd Əkbərov (Ərbab) o zamankı Naxçıvanda fədakar fəaliyyət göstərmişlər»[87].

İctimai fəaliyyəti ancaq müəllimliklə məhdudlaşmayan Sidqi həmin ziyalılarla M.F.Axundov, N.Vəzirov, Ə.Haqverdiyev kimi dramaturqların əsərlərini tamaşaya qoyar, hətta çox zaman bu tamaşalarda recissorluq və suflyorluq da edərdi[88].

Şairin oğlu, Azərbaycan mətbuatında xüsusi xidməti olan Məmmədəli Sidqi xatiratında yazır: «Yadıma gəlirsə 1897-ci ildə Rəhim xanın evində böyük bir zalda teatrlar vermək üçün səhnə hazırlanmışdı. Axşamçağılar orada məşq olduğu da yadımdadır. Çünki bir neçə dəfə atam məni özü ilə aparmışdı. Mən o zaman teatr nə olduğunu bilmirdim. Atam suflyorluq edirdi. Birinci olaraq yadıma gələn «Dağılan tifaq»ı oynadı. Məhəmmədəli xan, Sərvətxan, Cəlil Mirzəyev, sonralar isə Mirzə Cəlil Məmmədquluzadə, Eynəli bəy Sultanov, Mirzə Məhəmməd Xəlilov və başqaları həvəskar kimi çıxış edirdilər[89]».

XIX əsrdə M.F.Axundovdan sonra, daha doğrusu, əsrin ikinci yarısından başlayaraq qabaqcıl Azərbaycan ziyalılarının da mütərəqqi fikirlərini İrana həsr etmələri, Cənubi

---

[87] Şərif Ə. Görkəmli şair və müəllimimiz // Şərq qapısı, 1955, 18 noyabr.
[88] ƏYİ, Arx. 25, Q – 2 (56).
[89] Yenə orada.

Azərbaycanın həyatı ilə maraqlanmaq meyilləri getdikcə güclənirdi. Bu fikir heç də başqa bir ölkəni işlərinə müdaxilədən yox, müxtəlif şəraitdə, qonşu ərazidə yaşayan eyni xalqın mənəvi ehtiyac və tələbindən doğurdu. Odur ki, M.T.Sidqinin şeirlərində və dostlarına yazdığı məktublarda da İran mövzusu xüsusi yer tutur. Xalqın maariflənməsində qəzetin rolunu qiymətləndirən Sidqi «Sürəyya» və «Pərvəriş» qəzetlərinin bağlanmasından çox təəssüflənMişdi. Sidqi həmin qəzetlərin naşiri Mirzə Əliməmməd xan haqqında «Həblül-mətin»ə farsca yazdığı məktubunda onun Misirdən göndərdiyi rəsmini qarşısına qoyub «heyrət və həsrətlə» deyirdi ki, «cahillər sənin sözlərini anlamadılar. Dövlət xainləri sənin qədrini bilmədilər… məmləkət əhalisi sənin gördüklərini görmədilər. Nəhayət, pis fikirlilər ədavət bayrağını qaldırdılar, qəzetini qadağan etdilər, fitnə odunu alovlandırdılar, ruznaməni yandırdılar[90]».

Mirzə Ələsgər xan Atabəylərin hiyləsi nəticəsində «Pərvəriş» qəzeti bağlandıqdan sonra onun naşiri Mirzə Əliməmməd vərəmləyib vəfat etdikdə Sidqi onun qəbir daşı üçün belə bir fərd yazmışdır:

فدا به قبر تو باشم ای فدایی وطن
*(Qəbrinə fəda olum, ey vətənin fədaisi!)*

O, dostu Mirzə Əliqulu xanla birlikdə Müzəffərəddin şaha qarşı «Bəsirət» adlı gizli şəbnamə də çap edirdi.

«Pərvəriş» və «Sürəyya» qəzetlərinin bağlanması Sidqini mütəəssir etsə də, o, xalqın ümumi oyanış dövrü keçirdiyini və mədəni tərəqqiyə doğru getdiyini görürdü və inanırdı ki, bir gün xalq «onun yazdıqlarını oxuyacaq, məqsədini başa düşəcəkdir». Sidqi öz dövrünün bir çox açıqfikirli şəxsləri ilə dostluq etmiş, onlarla məktublaşmışdır. Bu məktubların əksəriyyətində mövcud quruluş, İran hakim dairələri və çar

---

[90] Yenə orada.

Rusiyasının müstəmləkə siyasəti tənqid edilir. Onun bu cür açıq fikirliliyi çar hökumətinin yerli nümayəndələrini şübhəyə salmışdı. Odur ki, Sidqini izləməyə başlamışdılar. Şairin oğlu M.Ə.Sidqinin yazdığına görə, o, candarmalar tərəfindən evinin axtarılacağından ehtiyat edərək, müxtəlif yerlərdən aldığı lazımlı və bir çox əhəmiyyətli məktub və digər sənədləri öz əli ilə yandırıb məhv etmişdir.

Vaxtilə «Şərqi rus» qəzetinin redaktoru Məhəmməd ağa Şaxtaxtinski Sidqini redaksiyada işə dəvət etmişdi. Lakin o, böyük ailəsini buraxıb Tiflisə gedə bilməmişdi.

M.T.Sidqi «Kəblə Nəsir», «Heykəli-insanə bir nəzər», «Tənviri-əfkar və təfhimi-insaniyyət», «Nümuneyi-əxlaq» əsərlərinin, «Coğrafiya» dərsliyinin, Azərbaycanca və farsca çoxlu qəzəllərin müəllifidir. Bunlardan başqa o, Cümşüd bəy Sultanovla bərabər otuz min sözdən ibarət «Rusca-farsca lüğət» hazırlamışdır[91].

Onun müxtəlif qəzet naşirlərinə və dostlarına yazdığı məktublar da öz ictimai-siyasi mülahizələrinə görə maraqlıdır.

A.S.Puşkinin anadan olmasının yüz illiyi münasibətilə keçirilən yığıncaqda söylədiyi nitq («Puşkin»), «Heykəli-insanə bir nəzər», «Həkimanə sözlər», «Nəsihətnamə» əsərləri, dərslik və məktublarında Sidqinin pedaqoci görüşləri öz əksini tapmışdır. «Nümuneyi-əxlaq», «Tənviri-əfkar…», «Həkimanə sözlər», «Məktəbi-tərbiyə»nin şagirdləri üçün ədəb qaydaları «Qızlara hədiyyə» onun yaradıcılığında əsas yer tutan pedaqoci səciyyəli əsərlərdir.

«Nümuneyi-əxlaq» əsəri «Məktəbi-tərbiyə»nin şagirdləri üçün imla qaydaları öyrətmək məqsədilə 1894-1896-cı illərdə tərtib edilmişdir. Yeni üsul məktəblərində yazı işinə nəhayət dərəcədə ehtiyac olduğunu nəzərə alaraq həftədə iki dəfə imla dərsləri keçən Sidqi sonra həmin mətnləri toplayıb bu dərsliyi yaratmışdır. Onun hazırladığı bu mətnlər məzmunlarına görə

---

[91] Şərif Ə. Görkəmli şair və müəllimimiz // Şərq qapısı, 1955, 18 noyabr.

öz dövrü üçün olduqca əhəmiyyətli vəsait idi. Məktəbə davamiyyət, təfəkkür və s. bu kimi məsələlər haqqında şagirdlərdə xüsusi anlayış yaratmağa çalışan müəllif mətnləri də yaxşı və pis əməllərə görə seçmişdi. Məsələn, bir mətnin məzmunu diqqətcil uşaq haqqındadırsa, ondan sonrakı mətndə diqqətsiz uşaq haqqında danışılır. Bu əsərdə çalışqan və tənbəl, doğruçu və yalançı, təmkinli və təmkinsiz, səliqəli və pinti, cəsur və qorxaq, ata-ana və müəllimini sevən və sevməyən və s. uşaqlar haqqında yazılmış imla mətnlərinin dili səlis, anlaşıqlı, kiçiklərin başa düşəcəyi tərzdədir. Tərbiyə və əxlaq nöqteyi-nəzərindən həmin mətnlərin əksəriyyəti indi də öz əhəmiyyətini itirməmişdir.

M.T.Sidqinin «Tənviri-əfkar…» adlanan ikinci əsəri də pedaqogikaya aiddir. Burada gənclərə ədəb, elm, sədaqət, əmanətə sadiqlik kimi gözəl insani sifətlərdən bəhs olunur. Əsərdə elmin, ədəb və tərbiyyənin bütün yaranmışlar içərisində ancaq insana xas olduğunu göstərən müəllif uşaqların tərbiyəsində valideynin roluna xüsusi əhəmiyyət verir. Burada məclisdə oturmaq, söhbət etmək, yemək, hifz-səhiyyə və sair qaydalara da toxunulur. Sidqi xəstə və naxoşlara hörmət, onların əhvalını sormağı da ədəb və tərbiyənin ümdə xüsusiyyətlərindən hesab edirdi.

Xəstəxanalar açmaq, savadlı həkimlərin olmaması Sidqini düşündürən məsələlərdən idi. Xəstəlikdə ancaq həkimə müraciət etmək, onun verdiyi dərmanları lazımi qaydada qəbul etməyi tövsiyyə edir.

Sidqinin pedaqoci əsərləri içərisində «Məktəbi-tərbiyə»nin şagirdləri üçün yazdığı həkimanə sözləri xüsusi yer tutur. İmkanı dairəsində əlindən gələni yeni qayda ilə şagird tərbiyə etməyə sərf edən müəllif valideynləri həmin məktəbə gəlib, köhnə qayda ilə yeni üsul məktəbi arasındakı kəskin fərqə baxmağa, buradakı üstün cəhətləri görməyə çağırırdı. Pedaqoci fəaliyyəti dövründə bütün bacarıq və qüvvəsini uşaqların tərbiyəsinə, əxlaq və davranışına sərf edən müəllif

əsərini məhz bu sözlərlə başlayır: «Məktəbi-tərbiyəmizə təşrif gətirənlərə hər nə qədər razılıq göstərsək, yenə xəcalət qalacağıq[92]».

Məktəbə gələnlər oradakı təmizlikdən, şagirdlərin tərəqqisindən razı qalırdılar. Var qüvvəsini şagirdlərin təlim-tərbiyəsinə, səliqə və təmizliyinə, ədəb-ərkanına sərf edən Sidqi valideynləri məktəbə dəvət edərək onları qazanılmış müvəffəqiyyətlərlə tanış etməsi oraya daha çox uşaq cəlb olunmasına səbəb olurdu.

Dərs dediyi şagirdlərə əsl insani keyfiyyətlər aşılayan Sidqi tərbiyə və əxlaqa daha çox üstünlük verirdi. O göstərirdi ki, heyvanat aləmi «elmi-heyvanat» deyilən elm ilə bilinirsə, insana, insanlığa xas olan sifətlər də onun əxlaqı ilə bilinir. Başqa sözlə desək, Sidqi demək istəyirdi ki, insanı heyvandan ayıran əsas cəhət onun yüksək əxlaqıdır. Burada əmək, elmin faydası, sənət öyrənmək, dostluq, doğruçu olmaq, əxlaq və tərbiyə haqqında gözəl fikirlər söylənmişdir. Bu baxımdan şair-pedaqoqun təfəkkürünün məhsulu olduğu üçün həmin əsər xüsusi əhəmiyyətə malikdir.

Sidqinin «Məktəbi-tərbiyə»nin şagirdləri üçün tərtib etdiyi ədəb qaydaları da maraqlı sənəddir. İyirmi bir maddədən ibarət olan bu qaydalarda şagirdlərə gündəlik dərs ləvazimatından artıq məktəbə əlavə şey gətirməmək, dərs zamanı başqasının kitabına baxmamaq, bir-birilə danışmamaq, papiros çəkməmək, dava etməmək, küslü qalmamaq və bu kimi şeylər tövsiyə olunur.

Sanitariya qaydalarına diqqət yetirən Sidqi məktəbə gələrkən üst-başın təmiz saxlanması, dırnaqların tutulması kimi məsələlərə xüsusi yer vermişdir. Sinif otaqlarının təmizliyi, pəncərə şüşələrinin qorunması, məktəb ləvazimatının korlanmaması, bir sözlə, şagirdlərin doğma məktəb avadanlığına

---

[92] Sidqi. Seçilmiş pedaqoci əsərləri. Bakı, 1967, s. 72.

qayğı ilə yanaşması kimi mühüm məsələ də nəzərdən qaçırılmamışdır.

Ümumiyyətlə, götürdükdə, müəllimliklə məşğul olmağa başladıqdan sonra Sidqi xalqı üçün pedaqoci fəaliyyətini ədəbi fəaliyyətdən daha səmərəli və faydalı hesab edərək bütün qüvvə və bacarığını bu sahəyə yönəltmişdi. Onun «Seçilmiş pedaqoci əsərləri» kitabında gedən «Nümuneyi-əxlaq», «Tənviri-əfkar…», «Həkimanə sözlər», «Məktəbi-tərbiyənin şagirdləri üçün ədəb qaydaları» göstərir ki, o, bir müəllim-alim kimi Azərbaycanda pedaqoqika tarixində özünəməxsus orijinal simalardan biri olmuşdur.

## IV Fəsil
## “FÖVCÜL-FÜSƏHA»

XIX əsrin ikinci yarısında yaranmış ilk ədəbi məclis Lənkəran şəhəri və onun ətraf yerlərində yaşayan şair, alim və şeir-sənət həvəskarlarını təmsil edən «Fövcül-füsəha» olmuşdur.

Ədəbiyyat tarixi kitablarında və başqa mənbələrdə ədəbi məclislərdən bəhs edilərkən «Fövcül-füsəha» məclisinin adı çəkilmirdi. Həmin məclis haqqında ilk məlumatı filol. e. d. Əzizağa Məmmədov, habelə Lənkəran şəhər məktəbinin müəllimlərindən Mirhaşım Talışlı və Mustafa Dadaşov vermişlər[93]. XIX əsrdə Lənkəran, Astara və Masallı rayonlarında yaşamış şair və alimlər haqqında bir sıra məlumat toplayan M.Talışlı və M.Dadaşovun təşəbbüsü təqdir edilməlidir. Lakin onlardan hələ çox əvvəl, təxminən 1930-cu illərdə Ə.Şərifov və R.Həsənov xeyli zəhmət bahasına Lənkəran şairlərinin əsərlərindən nümunələr və şəxsiyyətləri haqqında materiallar toplamışlar[94].

Bununla belə, «Fövcül-füsəha» şairlərinin əsərlərindən əldə çox az nümunə vardır.

«Fövcül-füsəha»nın təşkili tarixi haqqında müxtəlif fikirlər vardır. M.Talışlı onun 1850-ci illərdə[95], Lənkəran şəhər məktəbinin müəllimi X.Mehdiyev isə 1855-1860-cı illər

---

[93] Məmmədov Ə., Dadaşov M., Talışlı M. Seyid Əzim Şirvaninin müasiri Qasir // Ədədbiyyat və incəsənət qəzeti, 1959, 25 iyul, N 29.
[94] Salman Mümtazın arxivi, Lənkəran şairləri, ƏYİ, Arx. 38, Q – 17 (356, 358).
[95] Dadaşov M., Talışlı M. “Fövcül-füsəha” ədəbi məclisi haqqında // “Leninçi” qəzeti (Lənkəran), 1959, 9 sentyabr.

arasında yarandığını qeyd edir[96]. Hələlik «Fövcül-füsəha»nın təşkil edildiyi ili dəqiq müəyyən etmək mümkün olmasa da, çox güman ki, o, 1850-1855-ci illərdə fəaliyyətə başlamışdır.

«Fövcül-füsəha» ədəbi məclisinin üzvləri haqqında siyahını ilk dəfə M.Talışlı və M.Dadaşov vermişlər[97]. Onlardan sonra X.Mehdiyevin yazısında da həmin siyahı bir qədər dəyişikliklə təkrar edilmişdir. Əhatə dairəsinə və həcminə görə yuxarıdakı müəlliflərin yazılarından fərqlənən «Lənkəran şairləri» məcmuəsində XIX əsrin sonu və XX əsrin əvvəllərində Lənkəran zonasında yazıb-yaradan Qasir, Xəyali, Xəmuşi, Taib, Səyyad, Mahir, Mücrüm və başqa şairlərin əsərlərindən nümunələr və bir çoxunun tərcümeyi-hallarından məlumat verilmişdir ki, bunların çoxu «Fövcül-füsəha»nın fəaliyyəti dövründə yaşamışlar. Məcmuədə Səyyadın özündən alınmış tərcümeyi-halında göstərilir ki, «…günümün və gecəmin çox yarısını Lənkəranın məşhur şairləri Molla Fəttah, Molla Mücrüm, Xəyali, Nəccar, Mahir, Qasir, Sərvi, Təab, Pünhan, Tahirli, Mühib, Mühəqqir, Aciz və başqalarının xüsusi məclislərində keçirməklə iştirak etmişəm. Eyni zamanda Sərvi ilə də həmsöhbət varam[98]».

Burada adları çəkilən şairlərin «xüsusi məclisləri» heç şübhəsiz «Fövcül-füsəha» olmuşdur.

«Fövcül-füsəha»nın yığıncaqlarında şairlərlə yanaşı, Talış mahalının tarix və etnoqrafiyasından, görkəmli şəxslərinin həyatından bəhs edən "Cəvahirnameyi-Lənkəran»ın[99] (1869) müəllifi Mirzə Səidəli bəy Kazımbəyov, «Tarixi-Lənkəran və

---

[96] X.Mehdiyevin buraxılış işi. ADPU filologiya fakültəsinin arxivi.

[97] Talışlı M., Dadaşov M. XIX əsrdə Lənkəranda "Fövcül-füsəha" ədəbi məclisi haqqında. ƏYİ, İnv. 21520 (makina çapı).

[98] ƏYİ, Arx. 39, Q – 17 (356), vər. 62 a. İki hissədən ibarət olan makinada yazılmış bu məcmuənin biri (Q-17(356) Ə.Şərifov, ikincisi isə (Q-17(358) H. Rəhimov tərəfindən tərtib edilmişdir.

[99] Bax: Mirzəzadə Y. Talış tarixinə aid qiymətli bir əlyazması // Azərb. EA Respublika əlyazmalar Fondunun əsərləri, 1961, c. 1; Hüseynzadə Ə. XIX əsrin ikinci yarısında Azərbaycan tarixşünaslığı. Bakı, 1968.

Talış»[100] (1892) əsərinin müəllifi Mirzə Əhməd Mirzə Xudaverdi oğlu (1802-1894), bir sıra əxlaqi-tərbiyəvi və astronomiyaya aid «Heyət»[101] kitabının müəllifi Mirzə Ələkbər Axundov və Lənkəran mahalında birinci dəfə yeni tipli məktəbin ilk təşəbbüskarı, Mirzə Sadiq bəy Mehmandarov kimi alim və açıqfikirli ziyalılar iştirak etmişlər.

Bunlardan başqa, mahir tarzən, S.Əzimin dostu Şirəli bəy Nəsirbəyov[*], xalq təbabətini gözəl bilən Molla Məhəmməd Həkim (1841-1931) xanəndə və çarıqçı Məmmədqulu, bitkilərdən dərman hazırlayan Molla Məhəmməd Əczaçı, Məktəbdar Mirzə İsmayıl Təbrizi (1801-1889), ziyalı Mir Qasım Talışinski[**], Teymur bəy Bayraməlibəyov[***] (1862-1936) və qeyriləri də boş vaxtlarını həmin məclisdə keçirirdilər.

Ümumiyyətlə, «Fövcül-füsəha»da aşağıdakı adları göstərilən şair, alim və şeir-sənət həvəskarı olan müxtəlif peşə sahibləri iştirak etmişlər: Mirzə İsmayıl Qasir (1805-1900), Molla Fəttah Səhban (1813-1898), Ağababa Bixud (1815-1898), Usta Məhəmmədhəsən Nəccar (1819-1912), Mirzə İsa Xəyali (1850-1917), Hüseynqulu (Dübəndiduz) Şuri (1826-1934), Mirzə Mütalib Ərcivani (1838-1936), Molla Ələkbər Aciz (1835-1899), Molla Məhəmməd Mücrüm, Mirzə Əziz Əliyev (1830-1910), Kəblə Baxışəli Axundov, Mirzə Əhməd Kəmin (Talib), Mirzə İsrafil Həmid oğlu Mahir, Sərvi, Pünhan, Tahirli, Mühibb, Mirzə Ələkbər Mühəqqir (1867-1919), Mir Həsən Səyyad Seyidzadə, İbrahim bəy Talış, Mirzə bəy

---

[100] Rüstəmov S. Lənkəran və Talış tarixi haqqında nadir bir əlyazması // Azərb EA Məruzələri, XII cild, 1956, N 3.
[101] Əsər M.Talışlının şəxsi arxivindədir.
[*] S.Ə.Şirvaninin Şirəli bəy Nəsirbəyova bir məktubu da vardır. Bax: S.Ə.Şirvani. Əsərləri. II c. Bakı, 1969, s. 323.
[**] M.Talışlının yazdığına görə onun şəxsi arxivində M.Q.Talışinskinin üç kitabı vardır (N.Q).
[***] M.Talışlı yazır ki, Teymurbəy Bayraməlibəyovun Lənkəranın tarix və etnoqrafiyasına aid rus dilində yazılmış bir kitabı məqalələri ilə birlikdə qızı Məryəm xanım Bayraməlibəyovadadır. ƏYİ, 21320.

Talışinski, Mir Sadıq Talışinski, Mirzə İsmayıl Süruri, Mirzə Əbdüləhəd Növrəs, Sadıq bəy Mehmandarov, Mirzə Səidəli Kazımbəyov, Mirzə Əhməd Xudaverdi oğlu (1802-1894), Mirzə Ələkbər Axundov, Şirəli bəy Nəsirbəyov, Molla Məhəmməd Həkim, çarıqçı Məmmədqulu, Mir Qasım Talışinski, Teymur bəy Bayraməlibəyov, Molla Məhəmməd Əczaçı, Hacı Möhsün və başqaları[*].

«Fövcül-füsəha» ədəbi məclisinin tərkibi müxtəlif zümrə, təhsil və sənət-peşə adamlarından ibarət idi. Burada Qasir, M.İ.Xəyali, Aciz, Kəmin, Mirzə İsmayıl Təbrizi kimi ömürlərinin xeyli hissəsini təlim-tərbiyə işinə sərf edən müdərris şairlərlə yanaşı, həkim Molla Məhəmməd, çarıqçı Məmmədqulu, dülgər Məhəmmədhəsən, habelə zadəgan silkinin nümayəndələrindən Mir Qasım bəy, Mir Sadıq bəy, Mir Əlibəy Talışinskilər də iştirak edirdilər. Yuxarıda göstərildiyi kimi, məclis iştirakçıları təhsil cəhətdən də müxtəlif olmuşlar. Belə ki, fars, ərəb və rus dilində mükəmməl təhsil görmüş şəxslərlə yanaşı, məclisdə cüzi mollaxana təhsili görmüşlərə də rast gəlinir. Əlbəttə, belə müxtəliflik məclis iştirakçılarının dünyagörüşündə də özünü göstərməli idi. Xüsusən Mirəli bəy Talışinski, Molla Məhəmməd Mücrüm kimi şairlərin şeirlərində qatı dindarlıq ruhundan başqa bir şey yoxdur. Lakin bu cür müxtəlif peşə, sənət, təhsil, zümrə sahiblərinin şeir-ədəbiyyat, poeziya məclisi öz ətrafında birləşdirərək, bir növ onları həmkar etmişdi.

«Fövcül-füsəha»nın rəhbəri Mirzə İsmayıl Qasir idi. S.Əzim bir məktubunda

*Sənsən ol sərdəftəri-«Fövcüş-şüəra»,*
*Ki, sənə tifli səbəqxan olu söhbət Qasir*[102].

---

[*] Bax: Mirzə Ələkbər Səburi. Şeirlər. Bakı, Nurlan, 2004, 119 s. **(red. – V.M)**
[102] S.Ə.Şirvani. Əsərləri. II c. Bakı, 1969, s. 151.

deyərək onu «Fövcül-füsəha» şairlərinin «sərdəftəri» adlandırmasından da bunu aydın görmək olur. Şurinin bir şeiri məclisin «Fövcül-füsəha» adlanması, xarakteri və üzvləri haqqında müəyyən təsəvvür yaradır. O, həmin məclisi səciyyələndirərək yazırdı:

*Bu xanə bizə Kəbeyi-ərbabi-səfadır,*
*Bir hücrəgəhi-məzhəri-əsrari-xudadır.*

*Qurban belə bir hücrəgəhə, fərq qoyar çox,*
*Cühhalə deməz kim, üqəlavü üdəbadır…*

*Bu məclis ara vardı şərafətli cənablar,*
*Söhbətləri hər dərdə dəva, ruhə qidadır.*

*Ol Mirəli xan zatı-şərifində əzizdir,*
*Xülqündə fəsih, çox da əmirül-üləmadır.*

*Qasirü, Səid Acizü Fəttah ilə Nəccar,*
*Sadiqü Əziz cümləsi-«Fövcül-füsəha»dır*[103].

Adından məlum olduğu kimi, fəsahət, bəlağət sahibləri, arif və əhli-dillər əsasən ayaqqabı tikən usta Hüseynqulunun, bəzən də öz dövrünün açıq fikirli müdərrislərindən olan Molla Möhsünün evində yığışarmışlar. Molla Möhsün Bakı və Şamaxı ziyalıları arasında da tanınmış şəxslərdən olmuşdur. Hətta Seyid Əzim Mir Sadıq bəy Talışinskiyə yazdığı mədhində Molla Möhsünün də adını çəkmiş, onu yüksək nəcabət, həya və səxa sahiblərindən biri kimi səciyyələndirmişdir. Həmin şeirində S.Əzim Molla Möhsünü nəzərdə tutaraq, Mir Sadığa müraciətən yazırdı:

*Xassə bir hüsni-xülqə həmdəmsən*

---

[103] ƏYİ, inv. 21520.

*Ki, onun hər sifatıdır əhsən,*
*Hacı Möhsündür ol həya kani,*
*Ki, odur xəlqə həqqin ehsani*[104].

Şeirin məzmunundan məlum olur ki, Mir Sadıq bəy dəfələrlə Şamaxıya gəlmiş, şəhərin ziyalılarına qonaq olmuşdur.

«Fövcül-füsəha»nın müxtəlif peşə sahibləri olan iştirakçıları kəsbkarlıqla məşğul olduqlarından gündüzlər bir yerə toplaşa bilmirdilər. Hər axşam yığışmaq da mümkün olmurdu. Odur ki, əsasən cümə günləri toplandıqları üçün məclisin məşğələləri də həmin günlərdə olurdu. M.İ.Qasir «Cümə günü» müxəmməsində yazır:

*Ürəfa söhbətə amadə olur cümə günü,*
*Sübhədək xatiri bügşadə olur cümə günü*[105].

«Fövcül-füsəha»nın başqa şəhərlərdəki ədəbi məclislərlə müntəzəm əlaqəsi olmuşdur. Bu əlaqədə Mirzə İsmayıl Qasir xüsusilə fərqlənirdi. Müxtəlif cüng və fraqmentlərdəki qeydlərdən görünür ki, o, tez-tez Bakıya gələr, "Məcməüş-şüəra»da iştirak edər və Şamaxı şairləri ilə məktublaşardı. Bir dəfə Bakıda Ağadadaşın[*] mənzilində müşairə zamanı Şirvanlı bir şair (Qasir onun adını çəkmir) öyünərək özünü Şirvanşahi adlandırır ki, bu da Qasirə xoş gəlməyir və həmin şairi həcv edir. Qasir həcvin əvvəlində yazır:

" پیر مردی خود را شیروانشاهی نامیده از اهل شیروان بود و در بادکوبه در اوطاق آغا داداش بیگ که از اهل عرفان بود، با ما مصاحب شد. بجهت تمسخر

---

[104] S.Ə.Şirvani. Əsərləri. II c., Bakı, 1969, s. 334-335.
[105] ƏYİ, Fraqment 1266, vər. 26.
[*] Qeyd: Bakı şairlərindən Sürəyya və Münirinin adı Ağadadaş olmuşdur. "Məcməüş-şüəra" əsasən Münirinin evində toplandığı üçün çox güman ki, Qasirin dediyi Ağadadaş Müniridir (N.Q).

و برای خوشوقتی حضرات احباب با مشارالیه شعربافی میکردیم. این چهار پاره از آن جمله است و در اینجا سبت شده. بعضی افراد را نه نوشتم. والسلام".

«Şirvan əhlindən olan və özünü Şirvanşahi adlandıran bir qoca kişi Bakıda əhli-ürfanlardan olan Ağadadaş bəyin otağında bizimlə həmsöhbət oldu. Zarafatlaşmaq və dostların vaxtının xoş keçməsi cəhətincə sözügedən şəxslə şeirləşdik. Buraya yazılan bu dörd parça o cümlədəndir. Bəzi fərdləri yazmadım, vəssalam»[106].

İli göstərilməsə də şeirin məzmunundan əhvalatın bahar fəslində baş verdiyi aydın olur. Şirvanlı şair yazdığı bir şeirində nə münasibətləsə Qasirin adını çəkmiş, bu da Qasirə toxunmuş və cavab olaraq yazdığı şeirdə onun nəzmdən başı çıxmadığını, qəzəl, qafiyə, vəzn və əruzdan bixəbər olduğunu göstərmişdir.

M.İ.Qasir Şuşada da olmuş və Molla Məhəmməd Mücrümə yazdığı:

*Şuşidə idim namə-pəyamın mənə gəldi,*
*Ol əmrə dedim, mən də cavabın sənə, gəldi*[107].

beytilə başlanan məktubundan görünür ki, o burada çox qalmış, lakin bu müddətdə Lənkəran şairləri ilə əlaqəsini kəsməmişdir.

«Beytüs-Səfa» və “Məcməüş-şüəra» şairləri kimi, «Fövcül-füsəha» üzvlərinin də Dərbənd şairləri ilə məktublaşmaları olmuşdur. Molla Faiz Dərbəndi son vaxtlar Qasirin məktublarına cavab vermədiyi üçün o da

*Namələr yazdım peya-pey, heç birindən yox cəvab,*
*Kim, nə illətdən məzaci-inhiraə olmuş sizə?*

[106] ƏYİ, Fraqment 1266, vər. 12 b – 13 a.
[107] ƏYİ, Fraqment 1266, III dəftər, s. 23.

*Ya edibsən ixtiyari-inziva simürğvar,*
*Badikubə qələsi bir Kuhi-Qaf olmuş sizə?*[108]

- deyərək inciməsinin səbəbini xəbər almışdır.

«Fövcül-füsəha» şairləri ilə Ərdəbil şairləri arasında da müntəzəm əlaqə olmuş, bir-birlərinin məclislərində iştirak etmişlər. Hətta «Fövcül-füsəha» şairlərindən Mücrüm, Aciz və Xəyali əslən ərdəbilli olmuş, XIX əsrin 70-ci illərində köçərək Lənkərana gəlmişlər. Mirzə Əhməd Taib Ərdəbil şairlərindən Əşiq ilə yaxından dostluq etmiş, bir-birləri ilə məktublaşmışlar[109].

Qasirin Xəyaliyə, M.Ə.Acizə məktubları göstərir ki, o, Lənkərandan bir yana getdikdə belə «Fövcül-füsəha» ilə əlaqəsini kəsməmiş, məktub yazaraq, onların hal-əhvalından, məclisdən xəbər tutmuşdur. Aciz Bakıya gəldikdən sonra Qasir onun ardınca məktub yazaraq, çox dayanmayıb Lənkərana qayıtmasını tapşırmışdır[110].

Məşhur şərqşünas Miller vaxtilə Lənkərandan keçərək İrana gedərkən «Fövcül-füsəha»nın üzvü Mirzə Əzizlə dostlaşmış və onun qonağı olmuşdur. Sonralar da bu dostluq davam etmiş və onlar bir müddət məktublaşmışlar. Hətta Mirzə Əzizdən sonra onun oğlu Mirzə Ağaəli atasının Millerlə olan dostluğunu davam etdirmişdir[*].

Fəaliyyətinin müəyyən dövrlərində otuzdan artıq şair, alim və ziyalının iştirak etdiyi «Fövcül-füsəha» ədəbi məclisinin bütün üzvlərindən bəhs etmək, əlbəttə, imkan xaricindədir. «Təzkireyi-Nəvvab», «Riyazül-aşiqin», «Azərbaycan ədəbiyyatı tarixi materialları», «Danişməndani-Azərbaycan» və

---

[108] Yenə orada, I dəftər, vər. 9 b.
[109] Bax: ƏYİ, Arx. 38, Q – 17 (356), vər. 10 a – 11a, Taibin Əşiqə məktubu.
[110] ƏYİ, Fraqment 1266, IV dəftər, s. 34.
[*] Millerin 1925-ci ildə Mirzə Ağəliyə yazdığı məktub M.Talışlının şəxsi arxivindədir (N.Q).

bu kimi mənbələrdə “Məclisi-üns», “Məclisi-fəramuşan», «Beytüs-səfa» və qeyri ədəbi məclislərin şairləri haqqında az-çox məlumat olduğu halda, «Fövcül-füsəha» üzvlərinə dair ancaq bəzi arxiv sənədlərində və pərakəndə əlyazmalarda çox az material vardır. Bunu nəzərə alaraq, onların bir neçəsi haqqında qısa da olsa məlumat verməyi məqsədə müvafiq bildik.

## Mirzə İsmayıl Qasir

XIX əsrin tanınmış şairlərindən olan Mirzə İsmayıl Səlim oğlu Axundzadə Qasir 1805-ci ildə indiki Ağdaş rayonunun Ləki kəndində ruhani ailəsində doğulmuşdur. O hələ uşaq ikən atasını itirmiş, anası ilə Şamaxıya gələrək iki il orada qalmış, sonra naməlum səbəbə görə ailəliklə Cənubi Azərbaycanın Əhər şəhərinə köçmüşdür. Mirzə İsmayıl ilk təhsilini də orada almışdır. Qasirin ailəsi burada da qərar tutmayıb Təbrizə getmişdir.

Təbriz mühiti Mirzə İsmayılın dünyagörüşündə mühüm rol oynamışdır. O, burada təhsilini daha da təkmilləşdirmiş, ərəb, fars dillərini öyrənmiş, Şərq ədəbiyyatı ilə yaxından tanış olmuşdur. Rusiya təbəəsi olduğu üçün Qasir təxminən 1840-cı ildə Qaradonluya, sərhəd idarəsinə mütərcim vəzifəsinə çağırılmış, lakin az müddətdən sonra dövrün ziyalı mülkədarlarından Sadıq bəy Mehmandarov onu Lənkərana dəvət etmişdir. Nəhayət, Lənkəran Qasirin son yaşayış məskəni olmuşdur.

Lənkərana gəldikdən sonra o, S.Mehmandarovun yardımı ilə orada yeni üsulla məktəb açmış, bir sıra çətinliklərə baxmayaraq, ömrünün sonuna kimi müdərrislik etmişdir. Qasir məhz məktəbdarlıqla əlaqədar olaraq qarşılaşdığı çətinlikləri şeirlərindən birində ümumi şəkildə belə ifadə etmişdir:

*Kişi məktəbdar olunca bu vilayətlərdə,*

*Yeydir ondan dolana gavü xərü əstər ilən.*
*...Bizim əbnayi-zəmanə eləməz heç təsir,*
*Zülfüqarın götürüb gəlsə Əli Qənbər ilən*[111].

Bütün bu çətinliklərə baxmayaraq, Qasir fədakar maarif xadimi kimi XIX əsrin ortalarından sonunadək məktəbdarlıqdan əl çəkməmiş, təxminən ömrünün yarısını uşaqların təhsilə cəlb olunmasına və tədris işinə sərf etmişdir. XIX əsrin ikinci yarısında Lənkəranda maarifin intişar tapmasında onun xüsusi xidməti olmuşdur. Başqa müasirləri kimi, Qasir də tədris vəsaitini özü tərtib edirdi. Bu məqsədlə, o, sövti üsulda «Qanuni-Mirzə İsmayıl Qasir» adlı bir dərslik də yazmışdır[112].

«Divani-Hikmət», «Gülüstan», "Əncümənüş-şüəra» ədəbi məclislərinin zəiflədiyi bir vaxtda Qasir Lənkəran şairlərini ətrafına toplayaraq, «Fövcül-füsəha» məclisini təşkil etmişdir. Lənkəran mahalında yazıb-yaradan şairlər, şeir həvəskarları və digər ziyalılar onu özlərinin ruhani rəhbəri hesab edirdilər. Təşkil edildiyi vaxtdan dağılana kimi «Fövcül-füsəha»nın rəhbəri olan Qasir Şamaxı, Bakı, Ərdəbil, Şuşa şairləri ilə yaxından əlaqə saxlamış, müntəzəm olaraq onlarla məktublaşmışdır. Seyid Əzim Qasiri «şairi-nadirəgöftarü pəsəndikəlam, mürşidi-əhli-vəfa, piri-süxəndan» adlandırırdı[113]. O, hər dəfə Bakıya gələndə "Məcməüş-şüəra»nın yığıncaqlarında iştirak edərdi. Beləliklə, Lənkəran şairləri məhz Qasirin vasitəsilə yuxarıda adı çəkilən şəhərlərin ədəbi ictimaiyyəti ilə yaxından tanış ola bilmişdilər.

Qasir nəsx, təliq və naxun xətlərinin mahir ustası idi. Seyid Əzim onun xəttatlığına işarə edərək yazmışdır:

---

[111] Salman Mümtaz. El şairləri. I c. Bakı, 1927, s. 213.
[112] Məmmədov Ə., Dadaşov M., Talışlı M. Seyid Əzim Şirvaninin müasiri Qasir // Ədəbiyyat və incəsənət qəzeti, 1959, 25 iyul; Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. s. 386.
[113] S.Ə.Şirvani. Əsərləri. II c. s. 147.

*Nəsxü təliqdə tut kim, sənə yoxdur həmxət,*
*Fələk ol xəttə çəkibdir xəti-bütlan, Qasir.*
*Naxuni-həsrət ilə eyləmə çox sinə xəraş,*
*Xətti-naxundan olurmu sənə dərman, Qasir*[114]*?*

Qasir həm də dövrünün tanınmış şahmat ustalarından olmuşdur. O, Mahmud Şəbüstərinin yaradıcılığı ilə maraqlanmış, 1870-ci ildə şairin «Kənzül-həqayiq» adlı məsnəvisinin üzünü köçürmüşdür[115].

Mirzə İsmayıl Qasir 1900-cü ildlə Lənkəranda vəfat etmişdir.

Nədənsə nə «Fövcül-füsəha» Qasirlə həmməclis olan «Təzkireyi-Ziyai»nin müəllifi Mirzə İsa[*], nə də dostu Seyid Əzim öz təzkirələrində onun haqqında heç bir məlumat verməmişlər. F.Köçərli isə «Materiallar»ının fehristində[116] Qasirin adını vermişsə də, lakin kitabda onun barəsində yazıya rast gəlinməyir.

Ədəbiyyatşünas S.Mümtaz Qasirlə maraqlanmış, tərtib etdiyi «El şairləri» kitabına onun «Əskinas», «Ərə verdi», «Qara pul», «Balaxanım», «Odun», «Məhəmmədəli bəy Məcruha» şeirlərini daxil etmişdir. Sonralar Ə.Məmmədov, lənkəranlı müəllimlər Mustafa və Mirhaşım Talışlı şair haqqında nisbətən geniş məlumat vermişlər[117]. Akademik F.Qasımzadə Qasiri XIX əsrin ikinci yarısında müasir mövzulara meyil edən, əsərlərində realizm ünsürləri və satira motivləri görünən şair kimi səciyyələndirmişdir[118]. F.Qasımzadənin göstərdiyi kimi,

---

[114] Yenə orada, s. 149.
[115] ƏYİ, B – 335, I kitab.
[*] Müəllif "Təzkireyi-Ziyai"də Qasirin iki şeirini vermişdir. Bax: ƏYİ, D – 269.
[116] Bax: F.Köçərli. Materiallar. II c. II hissə. mündəricat.
[117] Məmmədov Ə., Dadaşov M., Talışlı M. Seyid Əzim Şirvaninin müasiri Qasir // Ədəbiyyat və incəsənət qəzeti, 1959, 25 iyul.
[118] Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. s. 386-393.

Qasirin dövrün müasir mövzularına meyil göstərməsində «Əkinçi» qəzetinin xüsusi təsiri olmuşdur.

Mirzə İsmayıl Qasirin bədii irsi təmamilə əldə edilməmişdir. Şair vəfat etdikdən sonra əsərlərinin bir qismi itib-batmış, bir qismi isə sonralar qohumları tərəfindən AMEA Əlyazmalar İnstitutuna verilmişdir. Bundan başqa, Lənkəran ziyalılarının şəxsi arxivlərində mühafizə olunan cüng və fraqmentlərdə də şairin əsərlərindən nümunələr vardır[119]. Onun əldə olan əsərləri, qəzəl, müxəmməs, təcnis, həcviyyat, həmçinin dini məzmunlu şeirlərdən ibarətdir. Qəzəllərinin bir qismini klassiklərin əsərlərinə deyilmiş nəzirələr təşkil edir. Qasir əruz vəznində olduğu kimi, heca vəznində də bir sıra gözəl şeirlərin müəllifidir[*].

Əsərlərinin əsas məzmununu məhəbbət motivi təşkil etsə də, şair yaşadığı mühitdə rast gəldiyi bir sıra ziddiyyətləri ustalıqla qələmə almışdır. Onun «Əskinas» «Qara pul», «Ərə verdi», «Odun», «Balaxanım» və s. şeirləri bu qəbildəndir. Qasir hakim və məhkumların mövcud olduğu cəmiyyətdə pulun qüdrətini, onun törətdiyi fəlakətləri açmağa çalışmış və müəyyən qədər məqsədinə nail olmuşdur. O, pula fitnə-fəsad törədən, gündə birinə vədə verən əxlaqsız «gözəl» kimi baxırdı. «Əskinas» şeirində kağız pulu «zəmanə gözəllərinin başçısı», «Qönçədəhan», «lalərux», «güləndam», nəhayət, «könüllər quşunun tələsi», «fitneyi-əyyam» kimi səciyyələndirdikdən sonra yazırdı:

*Bir-birinə vurdun ata-qardaşı,*
*Çox adamın başına saldın daşı,*
*Təbi dəni süflələrin oynaşı,*
*Qəhbərəviş, min lotunun yoldaşı,*
*Tağıyevə eylədin sən göz-qaşı,*

---

[119] Bax: Məmmədov Ə., Dadaşov M., Talışlı M. Seyid Əzim Şirvaninin müasiri Qasir // Ədəbiyyat və incəsənət qəzeti, 1959, 25 iyul.
[*] Mirzə İsmayıl Qasir. Seçilmiş əsərləri. Bakı, Yazıçı, 1988, 198 s.

*İndi olub Bakıda tacirbaşı,*
*Bizlərə də yavan yedirtdin aşı,*
*Səndən olub ustabaşı hər naşı,*
*İndi yonar tirü kəman, əskinas*[120]*!*

Yaxud «Qara pul» şeirində başqa tərzdə deyirdi:

*Dünyadə nikü bəd yetişir xəlqə puldən,*
*Gəh əngəbinə, gah dönər zəhri-marə pul.*
*Salmış xəlayiq içrə bəsi şurü qülqülə,*
*Durmuş özü bu halətə eylər nəzarə pul*[121]*.*

Qasir haqlı olaraq göstərirdi ki, «gah Məkkə və Mədinə yolunda, gah da şəraba və qumara xərc olunan» pul ədalətsizliyin hökm sürdüyü cəmiyyətdə elə bir qüvvəyə malikdir, «istəsə bir anda gülüstanı xərabəyə, xərabəni isə gülüstana çevirə bilər».

Şübhəsiz ki, pulun törətdiyi bütün bu fəsadları şair gözləri ilə görmüş, həmçinin:

*Bir para əqdnaməvü qəbzə basar peçat,*
*Şəltükzari-kasibi eylər icarə pul*[122] -

beytini icarə bəhanəsi ilə yoxsulların əkin yerlərinin pul gücünə əllərindən alınmasının şahidi olduqdan sonra demişdir.

Vaxtilə milyonçu Nağıyev, Hacı Hacağa, yaxud lənkəranlı Hacı Nəsir kimilərin zəmanədə «iftixar sahibi» olmaları, «barmaqla göstərilmələri» heç də onların alicənab, səxavətliliyindən, yüksək insani keyfiyyətlərindən yox, ancaq pullu, sərvətliliklərindən irəli gəlirdi. Birinin gecə-gündüz ça-

---

[120] Salman Mümtaz. El şairləri. S. 209-210.
[121] Yenə orada, s. 215-216.
[122] Yenə orada, s. 216.

lışdığı halda quru həsir üstə yatması, yaxud bir yoxsulun meyidi kəfənsizlikdən yerdə qaldığı halda, başqasının qəbrinə «kisə-kisə pul xərclənməsi» Qasiri düşündürür və narahat edirdi. Özü ehtiyac içində yaşasa da, Qasir aşağıda göstərdiyi səbəblərə görə pula nifrət edirdi.

*Gəh Lənkəranda Hacı Nəsirə nəsib olub,*
*Zeydə verib həsir, salıb həsarə pul.*
*... Gəh Bakıda Nağıyevə vermiş kürur ilən,*
*Əngüştnüma edib onu xurdü kübarə pul.*
*Gəh Hacı Hacağanı milyonçu eyləyib,*
*Əhli-cəhan ara gətirib iftixarə pul.*
*Baxsa bəsirət ilə görər mərdi-hüşyar,*
*Damın qurubdu, danə səpib hər güzarə pul.*
*Bir eybi var ki, çox mütəkəbbürdü bəzi tək,*
*Daim özün çəkər füqəradən kənara pul.*
*Bir para şəxsi öləndə qoyar yerdə bikəfən,*
*Gəh kisə-kisə xərc olunar bir məzarə pul.*
*Yox Qasir ilə hiç bu bi-pirirn ülfəti.*
*Şamə əgər tapılsa, tapılmaz nəharə pul*[123].

Şairin «Ərə verdi» şeirində də gənc qızını var-dövlətə aldanıb, özündən qat-qat yaşlı, qoca kişilərə ərə verən simü-zər düşgünləri tənqid edilir. O yazırdı:

*Hacı filani öz qızını şövhərə verdi.*
*Yəni ki, bizim türki dilində: ərə verdi.*
*Yaxşı-yamanın eyləməyib hiç təfəhhüs,*
*Əlhəqq, o biçarəni simü-zərə verdi.*
*Öz nökərinə versə idi gər bu ayaqdan,*
*Heç kimsə deməzdi ki, qızı nökərə verdi*[124].

---

[123] Salman Mümtaz. El şairləri. s. 215-218.
[124] Yenə orada, s. 211-212.

Şübhəsiz, burada da Qasir həyatda tez-tez rast gəldiyi, şahidi olduğu hadisələri qələmə almışdır.

Dilinin sadəliyi, canlı xalq danışığından gələn həkimanə ifadələr, həssas qabiliyyətinin nəticəsi olan bənzətmələr onun həm satirik, həm də lirik şeirlərinə xüsusi ahəng, təravət və səmimilik verir.

Qasir, bədii irsi toplanıb müasir oxucularımıza təqdim edilməli sənətkarlarımızdandır*.

## Mirzə İsa Xəyali

Xəyali XIX əsrin ikinci yarısında klassik şeir üslubunda yazan Azərbaycan şairlərindəndir. «Fövcül-füsəha» məclisinin fəal üzvlərindən olan Mirzə İsa Xəyali öz əsərlərində dövrün bəzi ictimai yaralarını açmış, İranın iqtisadi-mədəni geriliyini, hakimlərin eyiblərini tənqid atəşinə tutmuş, elmi və maarifi tərənnüm etmişdir. Xəyalinin əldə edilən əsərləri ilə tanışlıq göstərir ki, o, maarifçi şairlər nəslinə mənsubdur. Onun əsərləri bəzi dil-üslub xüsusiyyətlərinə görə də diqqətəlayiqdir. Lakin indiyə kimi şairin həyat və fəaliyyəti tədqiq edilməmiş, onun ədəbiyyatımız tarixindəki mövqeyi müəyyənləşdirilməmişdir.

AMEA Əlyazmalar İnstitutunda saxlanılan bir cüng-məcmuədə şairin qısa tərcümeyi-halı yazılmışdır[125]. Bundan başqa, onun əsərlərində də öz həyatı, dolanacağı, məşğuliyyəti haqqında bəzi məlumatlara rast gəlirik. Yuxarıdakı mənbədə göstərildiyinə görə, Mirzə İsa Xəyali 1850-ci ildə Ərdəbil şəhərində sərraf ailəsində anadan olmuşdur. O, ilk təhsilini Ərdəbildə almış, ərəb, fars dillərini, eləcə də klassik Şərq poeziyasının qayda-qanunlarını mükəmməl öyrənmişdir. Atası

---

* Qeyd: Qasirin ədəbi irsi, yaradıcılığı AMEA Əlyazmalar İnstitutunun əməkdaşı f.e.n. A.Rəhimova tərəfindən araşdırılmışdır. Bax: Rəhimova A. Mirzə İsmayıl Qasir. Bakı, 2002, 131 s. **(red. – V.M.)**

[125] ƏYİ, D – 379.

öldükdən sonra ondan qalan irsi bölüşdürərkən Mirzə İsa ilə qardaşları arasında narazılıq baş vermişdir. Həmin narazılıq üzündən o 1871-ci ildə Lənkərana köçmüş və evlənərək buranı özünə məskən etmişdir. Xəyali Lənkəranda taxta-şalban işində çalışmış, müdərislik etmiş, Hacı Rza adlı bir nəfərin bəzzaz dükanında satıcı olmuşdur. Şair «Elədi» rədifli şeirində Lənkərandakı həyatını belə təsvir edir:

*Ərdəbil tək vətəni saldı gözümdən gətirib,*
*Xaki-Talışda ip-örkənlə giriftar elədi.*

*Gah öz verdiyi tənxahı əlimdən çıxarıb,*
*Qövmü qardaşlarımı düşməni-xunxar elədi.*

*Gah mindirdi at üstə, dedi: «Gəz mişələri»,*
*Bir neçə pirkeşiyə sahibi sərdar elədi*

*Gah arşın əlimə verdi, dedi: ol bəzzaz*
*Gah baqqal adımı qoydu, dükandar elədi*[126].

Lənkəranda şair yerli ziyalılarla yaxın dostluq əlaqəsi yaratmış, əhalinin hüsn-rəğbətini qazanmışdır. Boş vaxtlarını «Fövcül-füsəha»da müsahibələrdə keçirən Xəyali tezliklə həmin məclisin görkəmli üzvlərindən biri kimi şöhrət tapır. Lakin maddi cəhətdən çətinlik çəkdiyi üçün Bakıya köçməyə məcbur olur. Burada ilk vaxtlar özünə iş tapa bilmədiyindən çala-çuxurlardan neft satmaqla dolanır, bir qədər sonra isə müdərrislik etməyə başlayır. Lakin nə çala-çuxurlardan neft yığıb satmaq, nə də az haqla müdərrislik etməklə o, özünü və ailəsini dolandıra bilmir. Odur ki, iş dalınca Mərvə gedib, orada yeni çəkilməkdə olan dəmir yolunda fəhləlik edir. Bir növ səyahət xarakteri daşıyan iş axtarmaq səfəri onu Aşqabada

[126] ƏYİ, Arx. 38, Q – 17 (358), s. 3.

çıxarır. M.İ.Xəyali burada atasının keçmiş bir dostundan borc pul alaraq, sərraflıq etməyə başlayır. Nə Bakıda, nə Mərvdə, nə də Aşqabadda rahatlıq və məişətini təmin edəcək bir iş tapa bilməyən şair Lənkərana qayıdır. Burada qaynı Məhəmməd Fətəliyevdən borc pul alaraq, kiçik bir bəzzaz dükanı açır və ömrünün sonuna kimi bu işlə məşğul olub, ailəsini dolandırır. Xəyali Bakıda olarkən «Fövcül-füsəha»da iştirak edə bilməməsi məclis üzvlərini çox narahat etmişdi. Şairin yaxın dostu Mirzə İsmayıl Qasir bu münasibətlə ona yazmışdı.

*Mirzə İsa, qıl nəzər namında ünvan altına,*
*Səbt olub zahirdəki məqsudi pünhan altına.*

*Lənkəranı tərk edib Baku ara tutdun vətən,*
*Saldı əhbabi sərasər bari-hicran altına.*

*Çox da Bakuda yubanma, Lənkərana qıl səfər,*
*Müddəi söylər: «Yığıb sərraf milyan altına»*[127].

Başqa bir məktubunda isə M.İ.Qasir ona yazırdı ki, sən Lənkərandan gedəndən sonra başıma olmazın müsibətlər gəlib. Bütün xəlayiqdən və dost-aşnadan əlaqəni kəsib evdə oturmuşam. O vaxt Lənkəranda məktəbdarlıq edən Qasir özü dediyi kimi, «başına olmazın müsibətlər gəldiyi üçün» məktəb və uşaqlardan ayrılıb Bakıya köçmək istəyir və bu barədə dostu Xəyalidən öz fikrini bildirməyi xahiş edir[128].

Əldə edilən şeirlərindən məlum olur ki, bütün həyatı boyu Xəyalinin vəziyyəti ağır keçmiş, daim maddi ehtiyac içərisində yaşamışdır. O, məhz ağır güzəranına işarə edərək, əsərlərinin birində yazmışdı:

*Rizq təhsili üçün bir neçə müddətdi məni,*

[127] ƏYİ, Fraqment 1266, vər. 4 a.
[128] ƏYİ, yenə orada, VII dəftər, vər. 12 b.

*Gərdişi-çərx salıb şəhrü vilayətdən uzaq.*

*Şəhrdən, əhldən avarə düşüb, hey gəzirəm,*
*Salmışam öz-özümü zillətə, rahətdən uzaq*[129].

Və yaxud

*Bazarın yoxluğu, pul azlığı, daxıl boşluğu,*
*Qoymur hövsələvü səbrü səbat ilə məni*[130].

Lakin həyatının bu cür ağır keçməsinə baxmayaraq, o heç kəsə boyun əyməmiş, kimsədən minnət götürməmişdir. Şair bu xasiyyətinə sadə həyati təşbeh gətirərək, özünü nə dayədən, nə də döş südündən belə minnət götürməyib, barmağını sormağa qane olan uşağa bənzədir:

*O tifləm kim, sorub əngüşt, olam ta rizq üçün qane,*
*Nə minnət dayədən könlüm çəkər, nə şiri-püstandan*[131].

Xəyalinin ölüm ili dürüst məlum deyildir. D-379 şifrəli cüng-məcmuədə göstərilir ki, o, hicri 1325-ci il məhərrəm ayının 20-də (miladi 1907-ci il mart ayının 5-də) 64 yaşında Lənkəranda vəfat etmiş və şəhərin Kiçik Bazar məhəlləsindəki təzə qəbirstanlıqda dəfn olunmuşdur[132]. Həmin əlyazmasına tikilmiş başqa bir vərəqdə isə qeyd edilir ki, Xəyali hicri 1328-ci il məhərrəm ayının 20-də (miladi 1910-cu il fevral ayının 1-də) vəfat etmişdir. Əlyazmalar İnstitutunda saxlanılan digər bir sənəddə isə onun 1917-ci ildə vəfat etdiyi göstərilir[133]. Xəyalinin vəfatı haqqında olan bu üç tarixdən (1907, 1910,

---

[129] ƏYİ, Arx. 38, Q – 17 (358), s. 25.
[130] Yenə orada, s. 16.
[131] Yenə orada, s. 17.
[132] Yenə orada, s. 16.
[133] ƏYİ, inv. 21520.

1917) birincisi düzgün ola bilməz. Şairin 1908-ci il oktyabrın 8-də naməlum bir şəxsə yazılmış avtoqraf məktubu bunu inkar edir[134]. Qalan iki tarixdən hansının düzgün olması hələlik aydınlaşdırılmamış qalır.

Tədqiqat göstərir ki, Mirzə İsa Xəyali Azərbaycan və fars dillərində üç-dörd kitab yazmışdır. Lakin onun ədəbi irsi tam əldə edilməmişdir. «Lənkəran şairləri» adlı məcmuədə onun «Elədi», «Uzaq», «Məni», «Eyləyibsən», «Arasında», «Səbəbi-təlifi-kitabi-Xəyaliyyət», «İran əhlinin tənbih və nəsihətinə», «Əhli-İranın məzəmmətinə», «Əhvalati-vəliəhdi-Yapon», «İtaliyalı qarının vəsiyyəti», «Dər müqəddimeyi-əncümən» və başqa şeirləri verilmişdir. Bunlardan əlavə, D-379 şifrəli cüng-məcmuədə

*«Nə gördü bilməm ol şuxi-nüktədan məndən»,*
*«İsa neçə müddətdi ki, heyrətdə qalıbdır»,*
*«Deyillə şəh yenə məşrutəni müqərrər edər»,*
*«Saqiya, ey fərxəndə ruxü mahcəmal»,*
*«Saqiya, dönmə əhdü peymandən»* -

mətləli şeirləri, fars dilində naməlum şəxsə yazılmış məktubu vardır. Bunlardan «Deyillə şəh yenə məşrutəni müqərrər edər», «Nə gördü bilməm ol şuxi-nüktədan məndən» şeirləri və yuxarıda adı çəkilən məktubu avtoqrafdır ki, tərtibatçı tərəfindən buraya tikilmişdir. Ümumiyyətlə, bu iki mənbədə Xəyalinin otuza qədər şeiri toplanmışdır.

Yaşadığı cəmiyyətdə addımbaşı gördüyü haqsızlıq, zəmanədən şikayət, İranın iqtisadi-mədəni geriliyinin tənqidi, İran monarxiyası başçılarının fərasətsizliyi, elmin, marifin, zəhmətin, xeyirxah əməllərin təbliği Xəyalının şeirlərinin əsas mövzusunu və ideya məzmununu təşkil edir.

---

[134] ƏYİ, D – 379, vər. 16.

Xəyalinin şeirlərində yalançı din xadimlərindən tutmuş padşahlara kimi cəmiyyətin bütün tüfeyli ünsürləri kəskin tənqid atəşinə tutulur. «Saqiya, lütfi-aşiqanə ilən» mətləli şeirində şair zəmanənin fitnə-fəsadı və vəzifə başında olanların ədalətsizliyi nəticəsində xalqın soyulub var-yoxdan çıxmasını belə təsvir edir:

*Görürsən ruzü şəb bu beş qəpiyi,*
*Alı hər kimsə bir bəhanə ilən,*
*Padşahlar deyir ki, məmləkəti,*
*Saxlaram ləşkərü xəzanə ilən.*
*Qələmü kağız ilən hakimü ürf*
*Əhli-züllam taziyənə ilən.*
*Yetişir mətləbə təbib əhli,*
*Neçə misqal raziyanə ilən*[135].

Müstəbid İran dövlət başçılarının bacarıqsızlığı və laqeyidliyi üzündən ölkənin iqtisadi-mədəni cəhətdən geri qalması, əhli-İranın zillətdə yaşaması, vətənindən didərgin düşməsi, var-dövlətin xaricilər tərəfindən talan edilib aparılması şairi düşündürən əsas məsələlərdən olmuşdur. Onun «Əhli-İranın tənbih və məzəmmətinədir», «Rücu əhli-İranın məzəmmətinə», «Gürizi-əhli-İranın məzəmmətinə», «Gürizi-əhli-İranın məzəmmətinə və onların ədəmi-tifaqına» şeirlərində bilavasitə bu məsələlərdən bəhs edilmişdir. Bu şeirlərində şair İran hakimlərini satira atəşinə tutaraq göstərirdi ki, İranda sənayenin inkişaf etməməsinə, fabrik, zavodların olmamasına, adi kağızın belə xaricdən gətirilməsinə, məktəb və mədrəsələrin yoxluğuna, ordunun xarici zabitlərin ixtiyarına tapşırılmasına və ölkənin Qərbi Avropa dövlətlərinin təsiri altına düşməsinə səbəb məhz onların bacarıqsızlığı və geridə qalmasıdır.

---

[135] ƏYİ, Arx. 38, Q – 17 (358), vər. 22-23.

«Gürizi-əhli-İranın məzəmmətinə və onların ədəmi-tifaqına» şeirində şair göstərirdi ki, əgər mədənlər kəşf olunub istifadəyə verilərsə, ölkə əsrin tələbləri ilə ayaqlaşar, İran əhli sahibsiz, vətənsiz qalmaz, el-obadan didərgin düşməz, bir tikə çörək ardınca xarici ölkələrə getməz. Nəticədə həm dövlət faydalanar, həm də xalq işsiz qalmaz:

*Məgər yoxdu İranda mədəniyyət,*
*Ki, qılsın bu cəmaət sərfi-övqat?*
*Həmi ondan götürsün nəf dövlət.*
*Həmi məşğuli-kəsb olsun rəiyyət*[136]*!*

Xəyali İran hakimlərinə üz tutaraq deyirdi ki, bu ölkə ilə «dost» olan dövlətlər ancaq öz faydaları xatirinə dostluq edirlər. Şair onları keçmiş tarixə nəzər salmağa, İranın həyatında iz buraxmış Kəyumərs, Ənuşirəvan, Zöhhak kimi hakimlərin hər birindən əsrlər boyu yadigar qalmış «yaxşı-yaman» adlardan nəticə çıxarmağa, ibrət götürməyə çağırırdı. Azərbaycanın digər maarifçiləri kimi M.İ.Xəyali də cəmiyyətinin tərəqqisini, xalqın güzəranın yaxşılaşmasını milli oyanışda, elmin və mədəniyyətin inkişafında görürdü. Bu cəhətdən onun «İtaliyalı qarının vəsiyyəti» şeiri çox səciyyəvidir. Əsərdə italiyalı qoca bir qarının vətən balalarının təhsil alması üçün halal zəhmətlə qazandığı pulunu ölkədə məktəblər tikdirməyə sərf etməsi təsvir olunur. Bununla da şair İran varlılarını avropalı qoca qarının nəcib hərəkətindən ibrət götürməyə çağırırdı.

«Mehdi bəy Şəqaqi və xani-şair və onların sərgüzəşti» adlı məsnəvisində Xəyali XVIII əsrin sonu, XIX əsrin birinci yarısında yaşayıb-yaratmış Şəqaqinin dili ilə faydalı zəhmətə xor baxan, günlərini heç bir ictimai-bədii əhəmiyyəti olmayan şeirlər yazmaqla keçirən təqlidçi şairləri tənqid edir,

---

[136] ƏYİ, Arx. 38, Q – 27 (358), vər. 46.

müasirlərini elmə, maarifə, dövrün tələblərindən doğan sənət ardınca getməyə çağırırdı. O, gözəllərin qaş-gözlərini, saçlarını, simasını qeyri-adi, süni ştrixlərlə təsvir edən şairlərin əsərlərini «Hərzəvü hədyan» adlandırırdı. Əsərdə Xəyali eyni zamanda köhnə tədris üsulu əleyhinə də çıxmış, dünyəvi elmlərin tədrisi məsələsini ortaya atmışdır.

Zəhmətin, namuslu əməyin tərənnümü Xəyali şeirlərində mühüm yer tutur. O, halal zəhməti, faydalı əməyi təbliğ edərək göstərirdi ki, əli-ayağı salamat, canında hərəkət olan hər bir kəsin bekar oturması qeyrətsizlikdir. İnsan qəbir evinə kimi çalışmalıdır. Lakin dövründən şikayətlənən şair onu da göstərirdi ki, bu əsrdə zəhmət çəkib minnətsiz fayda götürmək mümkün deyildir:

*Bəli, insan gərək əvvəl çəkə zəhmət, görə nəf,*
*O da bu əsrdə mümkün döyü minnətdən uzaq.*
*Kəsb ilə zəhmət özü lazımü məlzum düşüb,*
*Necə ki, aşiq olan olmadı töhmətdən uzaq.*
*Səyü kuşiş gərək etmək nə qədər var ömrün,*
*Rizq təhsilini yazmıbla məşəqqətdən uzaq*[137].

Xəyali müasir cəmiyyətin eyiblərini tənqid etsə də, bunun əsas ictimai köklərini görə bilmir, hər şeyi qəzavü qədərlə bağlayırdı. Bu fikrini şair rəvan və çox gözəl təkrirlə belə ifadə etmişdir:

*Çox gəzib, çox dolanıb, çox qazanıb, az yemişəm,*
*Qismətim yoxdu, yemək olmur qismətdən uzaq*[138].

Yuxarıda adları çəkilən məcmuə və cünglərdə qeyd edilir ki, M.İ.Xəyali qadın azadlığı məsələsində mütərəqqi mövqedə

---

[137] ƏYİ, Arx. 38, Q – 17 (358), vər. 26-27.
[138] ƏYİ, Arx. 38, Q – 17 (358), vər. 5.

olmuşdur. Lakin biz şairin şeirlərində hələlik belə bir fakta rast gəlməmişik.

Onun «Səbəbi-təlifi-kitabi-Xəyaliyyə» şeirindən məlum olur ki, şair əlli yaşında ikən, təxminən 1900-cü illərdə «Xəyaliyyə» adlı bir əsər yazmışdır. Mal-mülkü, var-dövləti, hətta övladı belə özündən sonra yadigar hesab etməyən şair göstərir ki, bir gün mal-dövlət, var-yox əldən gedəcək, yaxşı, qiymətli söz isə dünya durduqca qalacaqdır. Dünyada təkrar olunmayan söz, nəzmə çəkilməyən mətləb qalmadığını göstərən şair «nağıl kimi görünsə də, nəsihət və tənbehdən ibarət» olan «Xəyaliyyə» kitabını yazmağı lazım bilmişdir. Təəssüf ki, həmin əsər hələlik əldə edilməmişdir.

Əsərlərinin məzmunu, ideyası, toxunduğu məsələlərə görə Xəyali «Fövcül-füsəha» şairlərinin bir çoxundan fərqlənsə də, klassik şeir üslubunda yazmaqla onlarla birləşirdi. Lakin bu üslubda onun özünəməxsus cığırı var idi. Canlı xalq dilindən gələn sadə və anlaşıqlı ifadələr, səmimilik, axıcılıq, tez-tez işlənən təkrirlər, nəhayət, lirika ilə yumorun vəhdəti onun fərdi üslubuna xas olan xüsusiyyətlərdəndir.

Şairin işlətdiyi danışıqdan gələn «eldən avara düşmək», «gizlin tikəyə möhtac», «bir başımdı, iki əlim», «əli boş çöllərə düşmək», «bir toyuğa kiş deyə bilməyən» kimi ifadələr onun şeirlərinə xüsusi bir məlahət verir. Onu da qeyd etmək lazımdır ki, bütün bu ifadələrin ümumi mənası şairin ağır həyatı ilə çox həmahəng idi.

Tədqiqat zamanı akademik H.Araslının «XVII-XVIII əsr Azərbaycan ədəbiyyatı tarixi» və prof. F.Qasımzadənin «XIX əsr Azərbaycan ədəbiyyatı tarixi» (1956-cı il nəşri) kitablarında adı çəkilən «Təzkireyi-Ziyai»nin müəllifi Mirzə İsa Ziyai ilə haqqında danışdığımız Mirzə İsa Xəyalinin şəxsiyyətinin eyniləşməsi faktlarına rast gəldik.

AMEA Əlyazmalar İnstitutunun fondunda saxlanan və təxminən 1930-cu illərdə başqa-başqa şəxslər tərəfindən yazılan iki mənbədə Mirzə İsa Xəyalinin təzkirə yazdığı

göstərilir. Həmin mənbələrdən birində Ərdəbilli Hacı Məhəmmədrəhimin oğlu Mirzə İsa Xəyalinin qara karandaşla yazılmış qısa tərcümeyi-halında deyilir: «mərhum bütün ömrünü şeir yazmaqla keçirmişdir. Bütün türk (Azərbaycan – N.Q.) şüərasının tərcümeyi-halından və şeirlərindən maraqlanıb axırda öz əli ilə yazılmış böyük bir kitab yazıb qoyub[139]». Salman Mümtazın arxivində saxlanılan «Lənkəran şairləri» adlı məcmuədə tərtibçi Şərifov Mirzə İsmayıl Qasirdən bəhs edərkən eynilə belə yazır: «…Qasirin müasirlərindən Mirzə İsa Xəyali məşhur «Atəşkədə»yə etdiyi əlavələrdən birisi də Mirzə İsmayıl Qasirin əsərlərindən ancaq iki şeir əldə edə bildik. Bu şeirlər Mirzə İsa Xəyali tərəfindən ən qiymətli və ən qüvvətli şeirlər hesab edilərək «Atəşkədə»yə daxil edilmişdir[140]».

Həmin məcmuəni əvvəldən-axıra diqqətlə oxuduqda belə görünür ki, onun tərtibaçisi Şərifov Lənkəranda olmuş, oranın sakinləri və məcmuədə adları çəkilən şairlərin bəziləri ilə görüşmüş, onlardan canlı şahid kimi istifadə etmiş, «Təzkireyi-Ziya»ni də şəxsən özü oxumuşdur. Doğrudan da «Atəşkədə»nin davamı olan «Təzkireyi-Ziyai» də Qasirin iki şeiri vardır.

Yuxarıda deyildiyi kimi Mirzə İsa Xəyalinin əsli Ərdəbildəndir, 1871-ci ildə Lənkərana gəlib burada sakin olmuşdur. «Təzkireyi-Ziyai»də Lənkəranda yazılmışdır. Bunu müəllifin təzkirəyə yazdığı qısa müqəddimədən də aydın görmək olur. O yazır: «… Kəcmədar zəmanə bir hadisənin səbəbi üzündən bu həqiri gilanzəminə, yəni Lənkərana atdı və bir neçə müddət bekar oldum». Müqəddimədən aydınlaşır ki, bekar qalmağı sevməyən Mirzə İsa «yazı-pozu» ilə məşğul olur. Özündən sonra bir yadigar qoymaq məqsədilə o, on-on iki günlüyə bir nəfərdən çox minnətlə Lütfəli bəy Azərin «Atəşkədə» əsərini alır, on beş günün tamamında həmin kitabın üzünü köçürüb

[139] ƏYİ, D – 379, vər. 16 a.
[140] ƏYİ, Arx. 38, Q – 17 (358), məcmuənin Qasir hissəsi. s. 1-2.

sahibinə qaytarır. Müəllif göstərir ki, «Atəşkədə» yazılan vaxtdan indiyədək keçən təxminən yüz illik bir dövrün şairləri haqqında əlimdə məlumat olmadığından və Lənkəranda bu haqda bir kitab tapa bilmədiyimdən mən də öz müasirlərim haqqında məlumatımı bu kitaba əlavə edirəm. Müqəddimədə fars dilində açıq-aydın qeyd olunmuşdur:

"حقیر الفقیر کسیر التقصیر عسی المتخلص به ضیائی ابن مرحوم حاجی محمد رحیم مشهور بصراف اردبیلی"

(Günahları çox olan həqir, fəqir, Sərraf Ərdəbilli kimi tanınan mərhum Hacı Məhəmmədrəhimin oğlu Ziyai təxəllüslü İsa).

Buradan görünür ki, həmin təzkirənin müəllifi Ziyai ərdəbilli Hacı Məhəmmədrəhim oğlu İsadır. Xüsusən «Ziyai» (ضیائی) sözü ilə yazılmışdır ki, onu heç cürə səhv edib Xəyali (خیالی) kimi oxumaq mümkün deyil.

Yeri gəlmişkən onu da qeyd etməliyik ki, XIX əsrin ikinci yarısında Ərdəbildə Ziyai təxəllüslü iki şair olmuşdur. Mirzə İsa Ziyai öz təzkirəsində ərdəbilli Kərbəlayi Haqverdi Cigərçi təxəllüslü şairdən bəhs edərkən yazmışdı:

"یك وقتی در مجلیسی که مولانا ضیائی با شمس اردبیلی و چندین نفر رفقای دیگر باهم نشسته بودند، یك نفر مذاکره جگرچی را نموده و تعریف و اوصاف وی را میشمردی. مولانا از وی پرسید که اسم وی چیست؟ گفت: کربلایی حقوردی. مولانا گفت: در نام حقوردی شاعر و در نام شاهورن پادشاه و در نام مشهدی نادر محمد وزیر اصلا نخواهد شد و هر آیینه نادرتا اتفاق افتاده باشد، در شآن وی التفات اشرف است. از مذاکره ایشان حقیر در آرزوی ملاقات ایشان بودم".

(«Bir dəfə Mövlana Ziyai, Şəms Ərdəbili və bir neçə nəfər başqa yoldaşları ilə birlikdə bir məclisdə oturmuşdu. Bir nəfər Cigərçini müzakirə edərək, onu təriflədi və vəsf etdi. Mövlana ondan soruşdu ki, «onun adı nədir?» Dedi: «Kərbəlayi Haqverdi». Mövlana dedi: «Haqverdi adında şair, Şahverən adında padşah və Məşədi Nadirməhəmməd adında vəzir əsla

ola bilməz. Hərgah belə bir təsadüf olarsa, onun haqqında iltifat yaxşıdır». Mən bu söhbətlərinə görə bir də onlarla görüşmək arzusunda oldum»)[141].

Yuxarıda verdiyimiz bu parçadan aydın olur ki, həmin məclisdə Mövlana Ziyai və Şəms Ərdəbili ilə birlikdə haqqında danışdığımız təzkirənin müəllifi Mirzə İsa Ziyai də iştirak etmişdir. Həm də onun Mövlana Ziyai və Şəms Ərdəbilinin söhbətlərinin arzusunda olması göstərir ki, təzkirə müəllif Mirzə İsa Ziyai ilə yuxarıdakı mətndə göstərilən Şəms Ərdəbilinin dostu Mövlana Ziyai ayrı-ayrı şəxslərdir. Həmin təzkirədə ərdəbilli Mövlana Ziyai haqqında da məlumat verilmişdir. Burada yazılır ki, «Mövlana Ziyai Ərdəbil əhlidir, o vilayətin varlı ailələrinin birindəndir. İncə, gözəl zövqlü, gözü tox bir cavandır. Şahmat elmində kamil, arif bir şəxsdir. Gecə-gündüz vaxtını Şəms Ərdəbili ilə keçirir. Bəlkə bir saat bir-birilərindən ayrılmırlar. 1871-ci ildə kəcrəftar zəmanə onunla düz gətirməyib, mal və mülkdən əli boşa çıxıb, Ərdəbildən Gilan tərəfə gəlib, on iki il Lənkəranda sakin olub. Təxəyyülatından bir neçə tuğra türkcə (azərbaycanca – N.Q.) qəzəli yazılır[142]».

Təzkirədə Mövlana Ziyainin «Qoyubdu başə ol sərvi-səhi külah əyri», «Əgərçi hicrdən canımda olmuş min bəla peyda», «Dilbəra, şəhdi-ləbin dil hərdəm eylər arzu», «Bir zəman görsəm fərəhdən ərşə əfğanım çıxar», «Çox kimsədən dilər bu dili-binəva mədəd» misraları ilə başlanan qəzəlləri verilmişdir[143].

Xəyalinin isə əlyazmasının haşiyəsində «Xəyali Ərdəbilinin kəlamından» başlığı altında «Bir yol eşidib ol məhi naməhrəm içində», «Şəhneyi-hicr kəsib başımı qəssab kimi», «Ömrün qəbaləsi şəbi-hicran əlindədir» mətləli qəzəlləri

---

[141] ƏYİ, D-269, vər. 77a.
[142] ƏYİ, D – 269, vər. 81 b.
[143] Yenə orada, vər. 200 b – 201 a.

getmiş[144], həyatı haqqında isə heç bir məlumat verilməmişdir. Bir məsələ aydındır ki, «Təzkireyi-Ziyai»ni yazan İsa ibn Hacı Məhəmmədrəhim Ziyai həmin təzkirənin 81 «b» vərəqində qeyd olunmuş Ziyai deyildir. Bu həmin şəxs olsaydı müəllif, Şəms Ərdəbili ilə Mövlana Ziyainin iştirak etdikləri məclisdən bəhs edərkən onlarla söhbət etmək arzusunda olduğunu yazmazdı. Müəllif tərtib etdiyi təzkirənin müqəddiməsində özü haqqında məlumat verdiyi üçün təkrara ehtiyac duymamışdır. Onun həm Ziyai, həm də Xəyali təxəllüsləri daşımasına gəlincə deməliyik ki, eyni hal bir çox şairlərdə müşahidə olunur. Məsələn, Mirzə Rəhim Fəna «Aşiq», Əbdülxaliq Cənnəti «Əttar», «Vasifi», Abdulla bəy Abış, «Abdulla» və başqaları müxtəlif vaxtlarda müxtəlif təxəllüslərlə şeir yazmışlar. Çox güman ki, Mirzə İsa da əvvəllər, daha doğrusu təzkirəni yazmağa başladığı illərdə Ziyai təxəllüsü daşımış, sonralar el-oba, qohum-qardaşdan ayrılıqdan sonra Xəyali təxəllüsünü qəbul etmişdir.

Həmin təzkirənin əvvəlində üç vərəq ağ buraxılmışdır. Bu vərəqlərin hər birində bənövşəyi karandaşla köhnə rus və ərəb əlifbaları ilə yazılmışdır: «İsa Xəyali təxəllüs Ziyad-fikirli», «Mirza İsa Xəyali təxəllüs».

Hər halda bunları yazan naməlum adam Xəyali ilə Ziyainin eyni şəxs olduğuna əmin olmuşdur. Əgər belə olmasaydı, təzkirənin 5 «a» vərəqində «Sərraf Ərdəbilli kimi tanınan mərhum Hacı Məhəmmədrəhimin oğlu Ziyai təxəllüslü İsa» yazıldığı halda naməlum bir şəxs oraya Ziyai əvəzinə Xəyali sözlərini yazardımı? Yeri gəlmişkən bunu da qeyd etmək lazımdır ki, həmin təzkirənin xətti Mirzə İsa Xəyalin D-379 şifrəli cüng-məcmuədəki avtoqraf xəttinə çox oxşayır.

Görkəmli alim Əkrəm Cəfər də həmin təzkirənin Mirzə İsa Xəyalinin qələminin məhsulu olduğunu təsdiq edir. O xatırlayır ki, 1928-ci ildə Lənkəranda müəllim işləyərkən məhz

[144] Yenə orada, vər. 338 a – b.

AMEA Əlyazmalar İnstitutunda D-269 şifrə altında saxlanılan «Təzkireyi-Ziyai»ni M.İ.Xəyalinin oğlu İbrahimxəlil İsazadədən almış və bir neçə ay özündə saxlayaraq, dönə-dönə oxumuşdur.

«Təzkireyi-Ziyai»* fars dilində, «Atəşkədə» səpgisində yazılmışdır. «Atəşkədə»də olduğu kimi burada da əvvəl şairlərin həyatı, sonra isə onların əsərlərindən nümunələr verilmişdir. Təzkirəyə əlavə olunan şairlərin əksəriyyəti XIX əsrin ikinci yarısında Ərdəbil və Təbrizdə yaşayıb yaratmışlar. Burada həmçinin S.Ə.Şirvani, Mirzə Ələsgər Növrəs, Əbülhəsən Şəhid, Mirzə Rəhim Fəna, Fatma xanım Kəminə, Hacı Abbas Agəh kim Şirvan və Qarabağ şairləri də daxil edilmişdir. Bunlardan əlavə həmin əlyazmasında başqa təzkirələrdə adlarına rast gəlmədiyimiz Rindi Şirvani, Niyazi Şirvani və Əsrar Qarabağinin şeirlərindən nümunələr verilmişdir. Ümumiyyətlə, burada XIX əsrin yetmişdən artıq şairi haqqında məlumat vardır.

Təzkirədə Ərdəbil şairləri ilə tanış olarkən öyrənirik ki, XIX əsrin 60-70-ci illərində orada da şair və alimlərin məclisi olmuşdur. Musiqişünas və sənətkar Sərraf Ərdəbili, dövrünün «bütün elmlərindən xəbərdar» olan Molla Qulaməli Həsrət, Kərbəlayi Fərəc Zikri Ərdəbili, Mirzə Əsəd Ərdəbili, əvvəllər Ərdəbildə olub, 1871-ci ildə Lənkərana köçən Molla Məhəmməd Mücrüm, Mövlana Ziyai Ərdəbili, Mirzə Əbdürrəhim Rağib Ərdəbili, Məşədi Zeynalabdin Ünqa, Mirzə Abdulla Sağəri və başqaları tez-tez həmin məclisə toplaşaraq şeir-sənət ətrafında söhbət açmış, mübahisələr aparmışlar. Təzkirədə Əliməmməd Rövşən[145], Mirzə Abdulla Sağəri[146],

---

* Qarayev N. "Təzkireyi-Ziyai" və "Təzkireyi-Nəvvab" haqqında bəzi qeydlər // Əlyazmalar xəzinəsində. C. 4. – Bakı, 1976, s. 78-87. **(red. – V.M.)**

145 ƏYİ, D – 269, vər. 77 b.

146 Yenə orada, 78 b.

Kərbəlayi Haqverdi Cigərçi[147], Mirzə Əbdürrəhman Rağib[148], Ünqa[149] və başqalarından bəhs edilərkən onların həmin məclisdə iştirakı və müşairləri haqqında çoxlu qeydlər vardır.

Təzkirədə musiqi, rəssamlıq, xəttatlıqda məharəti olan, həmçinin təbabət, nücum və sair elmləri gözəl bilən söz ustaları ilə yanaşı, Məşədi Məhəmməd Müsəvvir, Mirzə Rəhim Fəna, Mövlana Ziyai Ərdəbili və Mahmud kimi şairlərin öz dövrlərinin görkəmli şahmat ustaları olmasına dair məlumat da verilmişdir.

Müasirləri haqqında verdiyi bəzi qeydlərdən görünür ki, təzkirənin «Atəşkədə» hissəsini təxminən 1871-ci ildə köçürən müəllif ona etdiyi əlavələrin bir çoxunu 1883-cü ildə yazmış, sonralar əlinə məlumat düşdükcə bu işi davam etdirmişdir.

XIX əsrin ikinci yarısında Ərdəbil və Təbriz şairləri haqqında qısa da olsa məlumat və əsərlərindən nümunələr verdiyi üçün bu təzkirə ilk mənbə kimi xüsusi əhəmiyyətə malikdir.

## Mir Həsən Seyidzadə Səyyad

Ədəbi fəaliyyətinin ilk çağları «Fövcül-füsəha»nın son dövrünə təsadüf edən Mir Həsən 1877-ci ildə Lənkəranda müəllim ailəsində anadan olmuşdur. İlk təhsilini atasından almış, 12 yaşından Lənkəranda Məşədi Nəsir Kazımzadənin yanında oxumuşdur. 1891-ci ildə atasını itirən Mir Həsən Lənkəranın iri tacirlərindən Məmmədtağı Allahverdi oğlunun yanında mirzəlik edərək, onun hesab işlərini aparmışdır. 1895-ci ildən Mir Həsən bir neçə il «Fövcül-füsəha»nın yığıncaq və ədəbi gecələrində iştirak etmiş, Qasir, Xəyali, Aciz, Səhban və başqa şairlərlə müşairələrdə olmuşdur.

«Fövcül-füsəha» şairlərinin əksəriyyətini görmüş Mir Həsən öz şeirlərini əsasən Qasirin təsiri ilə yazmışdır. «Lənkə-

---

[147] Yenə orada, 77 a.
[148] Yenə orada, 74 b – 75 a.
[149] Yenə orada, 76 a.

ran şairləri» məcmuəsində göstərilir ki, «Səyyad da Xəyali kimi qadın məsələsində mütərəqqi mövqe tutmuş, qadın azadlığı uğrunda mübarizə aparmışdır»[150]. Lakin məcmuənin tərtibçisi nə Xəyalidən, nə də Səyyaddan bu məsələyə aid heç bir misal gətirmir. Təəssüf ki, onun vəfat tarixi haqqında məlumat yoxdur.

## Mirzə Ələkbər Mühəqqir

Mirzə Ələkbər Mühəqqir 1867-ci ildə Lənkəranda anadan olmuşdur. Lənkəran limanında fəhləlik, şəhərin Kiçik Bazar məhəlləsində kömürçülük və çayçılıq etmişdir. «Fövcül-füsəha»nın iştirakçılarından olmuşdur. Klassik üslubda yazmış, əsərlərinin çoxu itib batmışdır. Mühəqqir 1911-ci ildə vəfat etmişdir.

Şairin ancaq iki şeirini əldə etmək mümkün olmuşdur. Bunlardan biri

*Aşiq olan eşqində sabitqədəm olsun,*
*Meydani-məhəbbətdə o sahib-ələm olsun.*

mətləli sadə dildə yazılmış aşiqanə qəzəlidir. Digəri isə Qasirin eyni rədifli qəzəlinin təsiri ilə yazılmış «Pul» rədifli qəzəlidir.

*Ey edən dünyanı zindan guşəsi mən zarə pul,*
*Çəkdirən İsa kimi hər bir zamanda darə, pul!*

*Dolmusan ərbablar sandığına sən sel kimi,*
*Qoymusan mən binəvanı dərhdə avarə, pul.*

*Adımı gahi qoyub fəhlə, götürdüm avarı,*
*Gəh sepə vurdum gücü, gahi vurub avarə, pul.*

---

[150] ƏYİ, Arx. 38, Q – 17 (356), s. 62.

*Çıxmadı bir şey, gəlib aldım kömür, satdım kömür,*
*Misqalı puta vurdum, puti də xalvarə, pul.*

*Çıxmadı ondan bi şey, əşkində mən çayçı olub,*
*Orda xidmət eylədim baqqal ilə tüccarə, pul.*

*Düşmədin axir ələ, hər cürə xidmət eylədim,*
*Tiryəkə, bəngə qoşuldum, gahi mən qumarə, pul.*

*Üzü qarə eylədin bu Məhqəri, ey qarə üz,*
*Mən kimi eldən olasan daima avarə, pul!*

## Molla Məhəmməd Mücrüm

Molla Məhəmməd Ərdəbildə anadan olmuşdur. Doğulduğu il məlum deyildir. Atası Ərdəbildə dini məhkəmədə vəkillik etmişdir[151]. Mücrüm 1871-ci ildə Masallı rayonunun Xıl kəndinə köçmüşdür[152].

Mücrümün ədəbi irsinin az bir hissəsi məlumdur ki, bunlar da «Lənkəran şairləri» məcmuəsindəki bir neçə aşiqanə qəzəl və «Təzkireyi-Ziyai»də verilmiş

*Tazədən yar məni atəşi-suzanə salıb,*
*Naz ilə bir yanar od bu dili-büryanə salıb.*

mətləli qəzəlindən ibarətdir.

## Mirzə İsrafil Mahir

---

[151] ƏYİ, D – 269, vər. 78 b.
[152] ƏYİ, inv. 21520; Arx. 38, Q – 17 (358), vər. 11 a.

Lənkəranda «Fövcül-füsəha»nın fəaliyyətinin son dövrlərində bir sıra gənc şairlər yetişmişdir ki, bunlardan biri də Mirzə İsrafil Mahirdir. Anadan olduğu il məlum deyildir.

Gənc yaşlarında fars dilini mükəmməl öyrənən Mahir ana dilində olduğu kimi bu dildə də rəvan şeirlər yazmışdır. Şairin ədəbi irsindən «Lənkəran şairləri» məcmuəsində Qaibə, Xəmuşiyə yazdığı şeirləri, Molla Səhbanın oğlu Taibin həcvi və farsca yazdığı bir qəzəlindən üç beyt verilmişdir.

## V Fəsil

## «BEYTÜS-SƏFA»

XIX əsrin ikinci yarısında «Fövcül-füsəha»dan sonra ikinci ədəbi məclis Xaqani, Fələki, Nəsimi kimi onlarca şair və alimlər yetişdirmiş Şamaxıda təşkil edilmişdir. Seyid Əzimin rəhbərliyi ilə təşkil olunmuş, bu məclisdən əvvəl Şamaxının görkəmli şairlərinin yanında xüsusi məclislər olurdu. Mərhum H.Səmədzadə Bahar Şirvani haqqında olan qeydlərindən birində yazır: «… Naseh Bahar Şirvani ilə şəxsən tanış olmuş, onun məclisində iştirak etmiş, Şamaxı ürəfa və şairlərindən olan və Səftər imzası ilə yazan Hacı Səftər Məhərrəm oğlunun yaxın məhəllə qonşusu Bahar Şirvani ilə maraqlanmış və onun həyatına aid məlumat toplamışdır[153]».

Bu qeydlər göstərir ki, hələ «Beytüs-səfa»dan əvvəl, XIX əsrdə Şamaxıda yazıb-yaradan şairlər Mirzə Nəsrullah Baharın yanına toplaşar, şeir-sənət ətrafında xüsusi söhbətlər edər, mübahisələr açarmışlar. M.N.Bahar Şamaxıdan getdikdən sonra da belə məclislər davam etmiş və «Beytüs-səfa» üçün bir zəmin olmuşdur. 1850-ci illərdə Şamaxıda Seyid Əzim, Bixud, Qafil, Rağib, Salik, Zöv'i, Zühuri və başqalarının fəaliyyət göstərməsi, tez-tez bir yerə toplaşıb müşairələr keçirməsi, nəhayət, zəruri olaraq həmin məclisin yaranmasına gətirib çıxarmışdır.

Bəziləri «Beytüs-səfa»nın "Məclisi-üns»ün təsiri ilə yarandığını söyləyirlər[154]. "Məclisi-üns»dən çox-çox əvvəl Gəncə, Quba, Ordubad və Tiflisdə Azərbaycan şairlərinin xüsusi ədəbi məclisləri təşkil edildiyini qeyd etməklə, tədqiqat gös-

---

[153] ƏYİ, Arx. 21, Q – 8 (238).
[154] M.Rahim. Natəvan // "Vətən uğrunda" curnalı, 1943, № 7-8.

tərir ki, hələ xüsusi adı olmasa da Şamaxı məclisi “Məclisi-üns»dən əvvəl fəaliyyətdə olmuşdur.

Bəziləri onun Məhəmməd Səfanın evində təşkil edildiyi və ya orada fəaliyyət göstərdiyi üçün «Beytüs-səfa» («Səfanın evi») adlandığını iddia edirlər. Həmin məclisin fəal üzvlərindən olan Molla Mahmud Cavad oğlu Zöv’inin divanında farsca bir şeirin əvvəlindəki cümlələr bu fikrin düzgün olmadığını göstərir. O yazır: «Cənab Əhməd ağanın karvansarasında cənab Hacı Ələkbər bəy şairlər məclisi təşkil etmək üçün bizdən ötrü bir otaq təyin etmişdi və beş nəfər şairin – əvvələn, buradan gedib Tehranda məlik-üş-şüəra olan Bahar təxəllüslü ustadımız cənab Mövlana Mirzə Nəsrullahın, cənab Seyidin, cənab Rağibin, cənab Bixudun və bəndeyi-həqir Zöv’inin orada fəaliyyət göstərməsi üçün lazımi xərci ödəyirdi. Bir gün ustadımız cənab Bahar buyurdu ki, gərək bu mənzili «Beytüs-səfa» adlandırıb, hər birimiz onun tərifində bir neçə beyt deyək. Hamımız yazıb gətirdik. Şeirlərin hamısından artıq mənim şeirimi bəyəndi. Şamaxı, h. 1284 / m. 1867-ci il»[155].

On bir beytdən ibarət olan bu şeirdə Zöv’i beş nəfər Şamaxı şairinin toplandığı məclisi tərifləyir. M.N.Baharı əsrin ariflərinin imamı adlandırır və s.

Göründüyü kimi, qeyddə həmin məclisin fəal iştirakçılarından biri olan Zöv’i açıq-aydın yazmışdır ki, məclis hicri 1284 (1867)-ci ildə Əhməd ağanın karvansarasındakı otaqlardan birində toplanmış, ona «Beytüs-səfa» (saflıq, təmizlik evi) adı isə ilk dəfə Bahar Şirvani tərəfindən verilmişdir. O zaman Məhəmməd Səfa həmin məclisdə iştirak etsəydi Zöv’i onun da adını çəkərdi. Çox güman ki, məclis adını Məhəmməd Səfanın təxəllüsündən yox, əksinə, o, məclisin yığıncaqlarında müntəzəm iştirak etdikdən sonra təxəllüsünü məclisin adından

[155] ƏYİ, B – 742, vər. 256 b- 257 a.

götürmüşdür. Bəlkə də, Məhəmməd Səfa təxəllüsünü onun xatirini çox istəyən ustadı Seyid Əzim vermişdir.

Bahar Şirvani birinci dəfə Hindistana yollanmış, orada dayanmayıb Şamaxıya qayıtmış, sonra İrana getmişdir. İrandan da bir dəfə Şamaxıya qayıtmışdır. Ola bilsin, Zöv'inin yazdığı əhvalat Bahar Hindistandan qayıtdıqdan sonra baş vermişdir.

«Beytüs-səfa»nın rəhbəri, onun aparıcısı Seyid Əzim Şirvani idi. «Qürbətdən Beytüs-səfa şairlərinə» və «Şirvanə səni eylərəm, ey namə, rəvanə» misraları ilə başlayan müstəzad məktublarından göründüyü kimi, o, hətta səyahətə çıxdığı zamanlarda da «Beytüs-səfa» məclisi ilə əlaqə saxlayırdı. S.Əzim bu məktublarından birini:

*Siz rahət olun behcət ilə «Beyti-səfa»də,*
*Seyyid bu bəladə,*
*Döndü cigərim firqətinizdən dəxi qanə,*
*Yox təndə təvanə*

- misraları ilə tamamlamışdı.

Əvvəllər məclisin üç-dörd nəfər iştirakçısı olmuşdur. Lakin sonralar Şamaxı şairlərinin Şuşaya «Fəramuşan» məclisinin üzvü Asiyə göndərdikləri məktublarda iştirakçıların sayı çoxalır. Biz burada artıq S.Əzim, Qafil, Rağib, Didə, Səfa, Zöv'i və Zühurinin adlarına rast gəlirik[156].

F.Qasımzadə isə «Beytüs-səfa» məclisinin üzvlərinin əsasən aşağıdakılardan ibarət olduğunu göstərmişdir: Seyid Əzim, Bixud, Zöv'i, Zühuri, Rağib, Səfa, Qafil, Salik, Ziya[157].

Lakin tədqiqat göstərir ki, yuxarıda adları çəkilənlərdən başqa vaxtilə Şamaxıda yazıb-yaradan bir çox şairlər də həmin məclisin üzvü olmuşlar. S.Əzim təzkirəsində Füruği haqqında yazarkən qeyd edir ki, «kərrat və mərrat məclisi-şüərada şeirləri təqrir və təhsin olmuşdur və bəndə ilə kəmali-

---

[156] S.Ə.Şirvani. Əsərləri. II c. s. 152, 154.
[157] Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. s. 385.

sədaqətləri vardır[158]». Əsli şamaxılı olan bu şair sonralar köçüb Temirxanşurada yaşamışdır. 1291(1874)-cü ildə S.Əzim orada olarkən Əliheydər Xudaverdi oğlu Füruği ilə görüşmüş, onun divanına da baxmış və təzkirəsində nümunə verdiyi aşağıdakı beytləri də həmin divandan götürmüşdür:

*Yarəb, olumu hicr əlindən qurtaram mən,*
*Bu qürbət elindən vətənim sarı varam mən?!*

*Bir şöləvər od içrə məni saldı zəmanə,*
*Su səpdikcə dəmbədəm artıq yanaram mən*[159].

Seyid Əzimin qeydindən görünür ki, Füruğinin şeirləri də «Beytüs-səfa»da oxunub müzakirə edilirmiş. Maraqlıdır ki, S.Əzim Temirxanşurada şairin divanına baxdıqdan sonra vətənindən o qədər də uzaqda yaşamayan şairin başqa qəzəllərindən yox, məhz qürbətdə vətən həsrətilə yazdığı qəzəlindən iki beyti nümunə götürmüşdür. Füruğinin divanına nəzər yetirən S.Əzimin «mülahizə olundu ki, qabiliyyəti-ziyadə peyda edibdir» deməsindən aydın olur ki, bu şairi o, əvvəllər yaxşı tanıyırmış. Çox güman ki, Füruği əvvəllər, hələ Şamaxıdan köçüb getməmiş «Beytüs-səfa» da iştirak etmişdir.

Seyid Əzim təzkirəsində Hacı Nəcəf bəy haqqında da məlumat verir və qeyd edilir ki, o, 1230 (1814)-cu ildə Şamaxıda anadan olmuş, «elmi-musiqidə Fəriyabiyi-sanidir ki, əlhəq sərrişteyi-tamı vardır və nəzmü nəsrdə çox şirin kəlamı» olan Nəcəf özünə təxəllüs qəbul etməmişdir. S.Əzim dəfələrlə onunla bir məclisdə olmuşdur.

Seyid Əzimin A.Asiyə yazdığı məktubunda «Beytüs-səfa» şairləri ilə bir sırada Mirzə Nəsrullah Didənin də adını çəkir. «Bahar gəldikdə təbiətin dəyişəcəyindən, hər tərəfdə gül-çiçək açacağından, quşların dil-dil ötəcəyindən, ürəfa dövrəsinə

---

[158] ƏYİ, Arx. 5, Q – 3 (29).
[159] Yenə orada.

şüşədən həsar çəkiləcəyindən» özünə isə bu mövsümündən «şərabi-nab zəhirmar olacağından» dəm vurduqdan sonra yazır ki, hətta

*Nə kim badə edər rəf möhnətü dərdim,*
*Nə qəmli xatirimə Zöv'i qəmküsar olacaq.*

*Nə Rağib eyləyəcək hal sormağa rəğbət.*
*Nə Qafil əmri-əcibimdə huşyar olacaq.*

*Zühuridən nə edər halıma zühur kərəm,*
*Nə Didənin gözü bu qəmdə əşkbar olacaq.*

*Nə bir səfa verəcək xatiri-həzinə Səfa,*
*Minayi-eşqdə dil zarü biqərar olacaq*[160].

Ancaq Asinin Şirvana «nəzmü nəsr» göndərəcəyi ilə qəlbi təsəlli tapan S.Əzim özü də daxil olmaqla həmin şeirdə adlarını çəkdiyi şairlərin «Beytüs-səfa»da iştirak etdiyinə şübhə yoxdur.

A.Asinin vəfatı münasibətilə yazılan hüznlü tərkibbənddə isə bütün əvvəlki şairlərə əlavə olaraq Sabitin də adı çəkilir:

*Bixudun əxtəri-iqbalına üz verdi vəbal,*
*Sabitin kövkəbi-əşki üzə səyyar oldu.*

*Seyyidi-bəxtiqaranın günü oldu qarə,*
*Zöv'inin çeşminə məcmui-cəhan tar oldu*[161].

A.Asinin 1874-cü ildə vəfat etdiyini nəzərə aldıqda, məlum olur ki, bu qəsidə də həmin ildə yazılmışdır. Mirzə Nəsrullah Didə və Salikin burada adları çəkilməməsi onların

---

[160] S.Ə.Şirvani. Əsərləri. II c. s. 153.
[161] Yenə orada, s. 333.

həmin ildə həyatda olmamaları ilə əlaqədardır. Doğrudur, Mirzə Nəsrullah Didənin təbiəti və xasiyyəti başqalarından fərqləndiyi üçün o, həmin məclisə az-az gəlirdi. Lakin Şamaxıda eyni dövrdə on nəfərdən artıq şairin fəaliyyət göstərdiyi bir vaxtda Didənin həmin məclisdən kənarda qalmasını təsəvvür etmək mümkün deyildir.

Beləliklə, «Beytüs-səfa»da aşağıdakı şairlər fəaliyyət göstərmişlər. Seyid Əzim Şirvani (1835-1888), Bahar Mirzə Nəsrullah (1834-1883), Ələkbər Qafil (1828-1891), Qafar Rağib (1818-1892), Məhəmməd Səfa (1851-1876), Molla ağa Bixud (1830-1892), Ağababa Zühuri (1848-1895), Mirzə Mahmud Zöv'i (1843-?), Naseh (1856-1914), Salik, Mirzə Nəsrullah Didə (1797-1870), Ziya, Füruği, Nəcəf bəy, Mirzə Məhəmməd Həsən Nalə (1850-1917) və b.

«Beytüs-səfa» ədəbi məclisi haqqında ilk məlumat F.Köçərlinin «Azərbaycan ədəbiyyatı tarixi materialları» kitabında verilmişdir. Həmin məclis haqqında daha sonra prof. F.Qasımzadə[162], t. e. n. Ə.Hüseynzadə[163] və filol. e. n. M.Əsgərov[164] bəhs etmişlər. Bu müəlliflər həmin məclisin XIX əsrin ikinci yarısında Şamaxıda Səfanın evində yarandığını, Seyid Əzimin rəhbərliyi altında fəaliyyət göstərdiyini və Şuşa şairləri ilə bəzi əlaqələrindən ötəri qeydlər etmişlər. Seyid Əzim istisna olmaqla onun ayrı-ayrı üzvləri altında isə demək olar ki, danışmamışlar.

F.Köçərlinin «Materialları»na əsaslanan «Danişməndani-Azərbaycan» müəllifi Məmmədəli Tərbiyət S.Əzimdən bəhs edərkən yazır: «O vilayətdə biri Qarabağda «Məclisi-xamuşan» və digəri Şamaxıda «Beytüs-səfa» adlı iki şairlər məclisi təşkil olunmuşdur. Seyid Əzim, Asi, Növrəs, Zöv'i,

---

[162] Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. s. 385.

[163] Hüseynzadə Ə. XIX əsrin ikinci yarısında Azərbaycanda tarixşünaslıq. Bakı, 1967, s. 78.

[164] Əsgərov M. "Beytüs-Səfa"nın yaranması və onun Azərbaycan ədəbiyyatında mövqei // "Azərbaycan məktəbi" curnalı, 1944, N 2-3, s. 27.

Səfa, Salik, Qafil, Zühuri, Rağib, Bixud və qeyriləri o iki məclisin üzvlərindən hesab edilirlər[165]». Sonra Tərbiyət hər iki məclisin arasında şeirləşmə, məktublaşma və fikir mübadiləsi olduğunu yazmışdır.

«Beytüs-səfa» ədəbi məclisi XIX əsrdə Azərbaycanda yaranan ədəbi məclislər içərisində xüsusi mövqe tutur ki, bunun da səbəbi öz dövrünün geniş məlumatlı, zəkalı, hazırcavab, bir sözlə, Qafqazda fəaliyyət göstərən «şairlərin səramədi» hesab edilən Seyid Əzimin həmin məclisə rəhbərlik etməsi idi. Seyid Əzimin Şamaxıda olmadığı vaxtlarda məclisin rəhbərliyi Molla Ağa Bixudun üzərinə düşürdü.

Digər ədəbi məclislərdə ollduğu kimi, burada da Şərqin dahi şairlərinin əsərləri mütaliə edilir, onların yaradıcılıq xüsusiyyətləri təhlil olunur, Azərbaycan və Şərq tarixi öyrənilirdi. S.Əzimin Azərbaycan tarixi və şairləri haqqında topladığı məlumat «Beytüs-səfa» məclisinin qızğın fəaliyyəti dövrünün məhsuludur. Şərq ədəbiyyatı tarixini, məntiq və fəlsəfəni, Azərbaycanın etnoqrafiyasını gözəl bilən Seyid Əzim mətbuatla, rus ədəbiyyatı və mədəniyyəti ilə maraqlanması məclisin digər üzvlərinə də öz təsirini göstərirdi. Bu tərəqqipərvər, maarifçi şair müntəzəm olaraq «Əkinçi», «Ziya» qəzetlərini alır, ölkənin əhvalından, mühüm beynəlxalq hadisələrdən xəbər tuturdu. Ola bilməzdi ki, o, oxuduğu məlumatlar haqqında «Beytüs-səfa»da söhbət açmamış olsun. «Əkinçi»nin abunəçilərinin azaldığı bir zamanda o, qəzetin faydasından qəzet vasitəsilə «Hali-aləmə» vaqif olmaqdan, əkin, ticarət və sairdən xalqı xəbərdar etməsindən bəhs edərək, həmvətənlərini qəzet oxumağa, maariflənməyə çağırırdı[166]. «Ziya»nın çıxması münasibətilə ona xüsusi təbrik yazan[167], həmin qəzetin ilk nömrələrində çıxış edərək, xalqı elm, maarif,

---

[165] Məmmədəli Tərbiyət. Danişməndani-Azərbaycan. Bakı, 1987, s. 301.

[166] S.Ə.Şirvani. Əsərləri. II c. s. 53. ("Əkinçi" qəzetinə yardım üçün"); s. 55 ("Qəzet nədir")

[167] Yenə orada, s. 60, 62, 65, 67.

sənət kəsb etməyə səsləyən, «özgələr tərəqqiyi-tam elədiyi» halda öz xalqının «ayaq altında payimal» olmasına dözə bilməyən şair

*Bəsdi tədrisi-«Gürbəvü muş»,*
*«Leyli-Məcnun»ü «Vəsfi-badəfüruş[168]»*

-deyərək yeni tədris üsuluna keçmək üçün yollar axtarmağa çağırırdı.

Əgər «Fövcül-füsaha» da Aciz, Səhban və başqaları; “Məclisi-fəramuşan»da Nəvvab və Hadi, “Məcməüş-şüəra»da Sürəyya və Seyid Zərgər dini mövzularda əsərlər yazırdılarsa, Şamaxı ədəbi məclisinin üzvləri arasında Didə bu baxımdan diqqəti cəlb edir. Seyid Əzimin şeirlərində də bəzən mədhiyyə və mərsiyyə nümunələrinə rast gəlinir.

«Beytüs-səfa» şairləri də əsərlərini iki dildə – Azərbaycan və fars dillərində yazırdılar. Onlar ərəb-fars dillərinin hələ güclü təsirə malik olduğu bir dövrdə yaşayırdılar. Məhz belə bir təsirin nəticəsi idi ki, bu şairlər əsərlərində həmin dillərdən gəlmə çoxlu tərkib və ifadələr işlətmək bir yana dursun, hətta ana dilində əsər yazdıqda belə sərlövhələrini fars və ya ərəb dilində qoyurdular. Bu hal digər elmlərə aid yazılmış əsərlərdə daha çox müşahidə olunurdu.

Nəzirəçiliyə gəldikdə isə bu, ədəbi ənənə kimi məclislər dövründə də geniş yayılmış bir hal idi.

İstər «Beytüs-səfa»nın, istərsə də XIX əsrdə yaranmış digər ədəbi məclislərin arasında olan əlaqə və məktublaşmaların, nəzirəçiliyin bəzi xarakter cəhətini göstərmək üçün Şamaxı şairlərinin “Məclisi-fəramuşan»ın bütün üzvlərinə müraciətlə başlanan məktubunu eynilə veririk: “Məclisi-fəramuşan»i-məsərrətbəyan hüzurlarına, əshabi-«Beytüs-Səfa»dən. Ol xüsusda ki, bu günlərdə biz şüərayi-Şirvan mabeynində qüvveyi-şeir və mətanəti-nəzm barəsində müşavirə olmuşdu.

[168] Yenə orada, s. 65.

Mövlana Füzulidən bir qəzəli-fəsahəti-məşhun və bəlağət-məzmunu intixab etdik ki, mütaqibi-qafiyə onun müqabilində deməyə iqdam edər. Və ol qəzəllərdən bir-birindən mafövq olmağın imtiyaz etməkdə biz şüərayi-Şirvan arasında mübahiseyi-külli və mücadileyi-əzim vaqe olmuşdur.

Ona binaən həman qəzəlləri təmamən yazıb, hüzuri-bahirən-nurunuza pişnihad etdik. Ümid ki, əshabi-firdovsnişan, xüsusən əvvəl səramədi-dövran və qibleyi-ürfan Abdulla bəy Asi və Növrəs ol təmam əhli-məclis ol qəzəllərin bir-birindən əla və ya pəst olmağın tərtibən imtiyaz edib əlan buyuralar ki, ta bu qəzəllərin hansı hansından əla olduğu məlum və müşəxxəs ola. Məsələn: bu qəzəl əvvəlimcidir, bu ikimincidir, bu üçümcüdür və ilax. Müxlisi-şüma: Hacı Seyid Əzim, Qafil, Rağib, Bixud, Salik, Səfa, Zöv'i, Zühuri[169]».

Məlum olduğu kimi, Füzulinin

*Təriqi-fəqr tutsam təb tabe, nəfs ram olmaz,*
*Qina qılsam tələb, əsbabi-cəmiyyət təmam olmaz,*

mətləli qəzəlinə yazılmış həmin nəzirələr "Məclisi-fəramuşan»da oxunub müzakirə olunduqdan sonra birinci yer Bixuda verilmişdir.

Bu məktubda iki cəhət diqqəti cəlb edir. Bunlardan biri ədəbi məclislərdə müşavirə və müşairələrin nə məqsədlə aparılmasının göstərilməsidir. Aydın olur ki, nəzmə, ədəbiyyata vüsət vermək, şeirdə kimin daha qüvvətli olduğunu göstərmək kollektiv nəzirəçiliyin əsas məqsədi olmuşdur. Əgər fərdi, təkbaşına hər hansı bir şair Füzulinin qəzəlinə nəzirə yazırsa, bu, o qədər də mühüm məqsəd güdməyir və əhəmiyyət kəsb etməyirdi. Lakin məclislərdəki qayda-qanuna görə, kollektivin, məsələn, «Beytüs-səfa» şairlərinin eyni bir qəzələ nəzirə yazması ədəbi yarış xarakteri daşıdığı üçün, təbii

[169] Sitat "Şairlər məclisi" məcmuəsindən götürülmüşdür. s. 387.

olaraq, şeirə qüvvət, «nəzmə mətanət» verməklə şairlik istedadının, sənətkarlıq qabiliyyətinin təkmilləşməsinə, onun inkişafına müəyyən dərəcədə bir təkan idi.

Məktubda diqqəti cəlb edən ikinci cəhət orada qeyd edilən «ol qəzəllərdən biri-birindən mafövq olmağın imtiyaz etməkdə biz şüərayi-Şirvan arasında mübahiseyi-külli və mücadileyi-əzim vaqe olmuşdur» cümləsidir. Buradan aydın olur ki, məclis özü həll edə bilmədiyi məsələni yoluna qoymaq üçün başqa məclisə müraciət edirdi. İlk baxışda adi nəzirənin qiymətinin təyin edilməsi kimi mənasız görünən bu məsələ bir, hətta bir neçə məclisin, beləliklə də otuz-qırx şairin rəyinin öyrənilməsi baxımından əhəmiyyətlidir. Daha sonra bu məktub bir də onu göstərir ki, məclis üzvləri şairliyə, şeirə, nəzmə ötəri, yüngül münasibət bəsləməmiş, şairliyin, söz sənətinin məsuliyyətini hiss etmişlər. «Beytüs-səfa» məclisi ilə əlaqələr heç də həmişə ədəbi məclislərlə məhdudlaşmayırdı. Onun rəhbəri S.Əzim dövrünün qabaqcıl ziyalısı kimi aktual məsələlərə qarışır, mətbuatda çıxış edir, mühüm məsələlərə öz münasibətini bildirirdi. Beləliklə də, o, bir çox şəxslərlə istər-istəməz fikir mübadiləsində olurdu.

«Beytüs-Səfa»nın yığıncaqlarında şeirlə yanaşı, musiqi də eyni dərəcədə öyrənilirdi. Şamaxı ədəbi məclisində Seyid Əzim müsiqini dərindən bilən, onu mahir musiqişünas qədər qiymətləndirməyi bacaran şairlərdən olmuşdur. O, musiqini əfsanələrdə söylənən «İsanın ölüyə həyat verən nəfəsi»nə bərabər tutaraq yazırdı:

*Tut bərabər dəmi-İsayə müğənni dəmini,*
*Qılıb əhya özünü, seyr elə ruh aləmini*[170].

[170] S.Ə.Şirvani. Şeirlər. Bakı, 1950, s. 348.

Musiqiyə dair yazılmış səkkiz bəndlik bu müxəmməsdə şair insana zövq verən, əhvali-ruhiyyəyə şadlıq gətirən, dərd-qəmdən azad edən bir mənəvi qida, ruhani nemət hesab edirdi. Şairə görə, musiqi zövqü olmayan şəxs cansız daşdan başqa bir şey deyildir.

## Mirzə Məmmədhəsən

XIX əsrdə S.Ə.Şirvani ilə bir dövrdə Şamaxıda bir neçə musiqiçilər yaşamışdır. Mahmud ağa bunların içərisində xüsusi ilə fərqlənirdi. Şairlərin xüsusi məclisləri olduğu kimi, Mahmud ağa da öz yanında musiqi məclisi təşkil etmişdi. O, şəhərin əhli-zövq, musiqidən xəbərdar olan arif şəxslərini, xanəndə və sazəndələrini ətrafına toplayar, tez-tez yarışlar təşkil edərdi. Həmin dövrdə Şamaxıda yetişən xanəndələrdən biri də Mirzə Məmmədhəsəndir.

Məlahətli səsi ilə yanaşı, həm də gözəl şairlik təbi, rəvan şeir yazmaq qabiliyyəti olan Mirzə Məhəmmədhəsənin Seyid Əzim ilə bir dövrdə, xüsusən də bir şəhərdə yaşaması onunla dost olması bizdə belə bir qənaət hasil edir ki, o, «Beytüs-Səfa»da iştirak etmişdir.

Mirzə Məhəmmədhəsən təxminən 1850-ci illərdə Şamaxıda anadan olmuş, öz həmyerlisi Kərbəlayi Ələkbərdən musiqi təhsili almışdır. Müstəsna dərəcədə gözəl və məlahətli səsə malik olan Məhəmmədhəsən gənc yaşlarından Şirvanın Göyçay, Ağdaş kimi rayonlarında tanınmış xanəndələrdən olmuşdur. O, Tiflis və Gəncə kimi şəhərlərdə də müvəffəqiyyətlə çıxışlar etmişdir. Şamaxıdan əlavə, müxtəlif şəhərlərdə otuz beş il xanəndəlik etmiş, Qarabağın məşhur xanəndələrindən Hacı Hüsü və Əbdülbaqi ilə bir dövrdə yaşamış, hətta bir müsabiqədə Əbdülbaqiyə qalib gəlmişdir.

Bir dəfə Seyid Əzim bahar fəslində «təbiətin tamaşası qəsdilə Şamaxı bağlarını seyr edərkən» uzaqda bir nəfərin gözəl səslə oxuduğunu eşidir. O, dayanıb bir qədər qulaq asdıqdan

sonra dostu Məhəmmədhəsənin səsini tanıyır və elə oradaca bədahətən aşağıdakı beytləri deyir:

*Əqlimi əlimdən nə gülü yasəmən aldı,*
*Nə sünbülü reyhan, nə bağü çəmən aldı*
*Davud məgər zində olub dəhrdə, Seyyid,*
*Arami-dilim sövti-Məhəmmədhəsən aldı*[171].

Belə bir istedad və nadir səs sahibinin həyatı yoxsulluq və ehtiyac içərisində keçmiş, xüsusilə qocaldıqdan sonra acınacaqlı bir vəziyyətə düşmüşdür. Onun 1916-cı ildə «Nalə» adlı bir əsəri çap olunmuşdur. Məzmunundan görünür ki, bu əsərin o, qulaqları kar və gözləri kor olduğu vaxtında yazmışdır. Düçar olduğu çarəsiz müsibət, gəncliyini şadlıq və keyf məclislərində, toy-düyünlərdə keçirən xanəndə-şairə sarsıdıcı təsir etmişdir. Mirzə Məhəmmədhəsən yazdığı kitabına sənəti və düçar olduğu müsibətə müvafiq olaraq «Nalə» adı vermişdir. O, həmin əsərdə öz halına uyğun olaraq belə yazır:

*Səyyad oxunu kəmana qoydu,*
*İki gözümü nişanə qoydu.*
*Səyyadın oxu dəyəndə bildim,*
*Səyyad özü bildi, mən də bildim.*
*Seyd etdi qəza, bu halə saldı,*
*İki gözümü əlimdən aldı.*

Kərbəlayi Əbdüləli Əliyevin «Məktəb» nəşriyyatı tərəfindən nəşr edilmiş «Nalə» kitabına yazdığı müqəddiməsindən görünür ki, şikəst, «guşənişin, izlətdə» olduğu zaman Məhəmmədhəsəni heç kəs «tanımamış», gəlib yoxlamamışdır. Mirzə təxəllüsü ilə yazan Məhəmmədhəsənin ədəbi irsindən bizə

[171] Mirzə Məhəmmədhəsən. Nalə. Bakı, 1916, s. 3-4.

çatan ancaq onun «Nalə» əsəri və həmin kitabçanın sonunda verilmiş

*Pərvanə kimi yandı könül narə desinlər,*
*Bülbül qəmini güldən ötür xarə desinlər*[172].

mətləli qəzəlidir.

Sənətkarlıq cəhətdən kamil olan və şairin öz halına müvafiq deyilmiş həmin qəzəlindən görünür ki, bu, onun yeganə əsəri olmamışdır. Təəssüf ki, belə maraqlı və istedadlı şair-xanəndənin ədəbi irsi itib batmışdır. Mirzə Məhəmmədhəsən 1917-ci ildə vəfat etmişdir.

Seyid Əzim hər hansı bir məsələdə öz fikrini daha qabarıq və rəmzlərlə ifadə etmək üçün muğamlardan, onun şöbə və guşə adlarından məqsədə müvafiq surətdə məharətlə istifadə edirdi. O, XIX əsrin ikinci yarısında mərsiyə ədəbiyyatının tanınmış nümayəndəsi dərbəndli M.Qumriyə yazdığı bir məktubunda onu və Şüaini şeirin qayda-qanunlarını bilməməkdə, məzmunsuz nəzmlər yazmaqda tənqid edərək deyirdi:

*Gərəkdir şeir lafın eyləyən, ey bixəbər Qumri,*
*Rümuzi-nəzmü nəsrə agəh olsun, huşyar olsun*[173].

Şeirin məzmunundan anlaşılır ki, Dərbənd şairləri Seyid Əzimi musiqidə və şahmat oynamaqda, mey içməkdə məzəmmət etmişlər. S.Əzim də onlara cavab olaraq yazmışdır:

*Binati-şeirə arayiş verən olsun gərək arif,*
*Nə kim, hər bixəbər məşşateyi-ruxsari-yar olsun.*

---

[172] Mirzə Məhəmmədhəsən. Nalə. s. 16.

[173] Qaibov H. Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir. ƏYİ, M – 134, s. 1111.

*Başında şuri-eşqin artar, onda şahə naz eylər,*
*Güli-nəzmində ta kim, xari-kollar laləzar olsun.*

*Əraq ilə hicazi çulğaya avazeyi-nəzmin,*
*Nəvayi-dilkəşi-şeirin binası üstüvar olsun.*

*Büzürgü kuçeki irfan ara şeiri-humayunun,*
*Gərəkdir qədrlə manəndi-dürri-şahvar olsun.*

Yuxarıda misralarda və sonra gələn beytlərdə adları çəkilən şur, şahnaz, əraq, hicaz, nəva, dilkəş, büzürg, kuçek, hümayun, sürud, suz, güdaz, məqam, xaric, dügah, pəncgah, əşiran, rast, müxalif, zabul, həsar kimi muğam adlarını şair həm müstəqim, həm də məcazi mənada məharətlə işlətmiş, beləliklə də, gözəl omonimlər yaratmışdır.

Yazılı və şifahi ədəbiyyatda tez-tez nərd və şahmat adlarına rast gəlirik. Bu, onu göstərir ki, bədii söz ustaları, şairlər hələ qədim zamanlardan Şərqdə geniş yayılmış bu idman növünü gözəl bilmişlər. Maraqlı haldır ki, dinin qadağan etdiyi nərd və şahmat oyunu şah saraylarında olduğu kimi, ziyalılar arasında da geniş yayılmışdır. Xüsusən şairlər bu oyunlarla daha çox maraqlanmışlar. Din xadimlərinin şərab və qumar kimi şahmatı da haram buyurduqları üçün Qumri kinayə ilə Seyid Əzimdən şahmatla necə arası olduğunu xəbər aldıqda şair ona belə cavab vermişdir:

*Demişdin məbhəsi-şətrəncdə, canım, rəvadırmı,*
*«Hüseyn məddahının kirdarı şətrəncü qumar olsun?»*

*Kişi şətrənc bilməkçin qumarbaz olmaz, ey qafil,*
*Gərək arif olan hər elmdə kamiləyar olsun*[174].

---

[174] ƏYİ, M – 134, s. 1112.

Bu misralar göstərir ki, Seyid Əzim də digər şairlər kimi idmanın bu növü ilə məşğul olmuşdur. Əgər o, şahmatı bilirdisə, demək onu mütləq tək yox, başqa bir nəfər «rəqiblə» oynamalı idi. Belə olduqda heç şübhəsiz ki, onun «rəqibləri» «Beytüs-Səfa» məclisinin iştirakçıları olmalı idi. Bu fakt bizə onu deməyə haqq verir ki, həmin məclisdə şeir və musiqi məşqələləri ilə yanaşı, şahmat da oynanılmışdır.

«Beytüs-Səfa» şairləri Seyid Əzimi özlərinin ustadı hesab edirdilər. Qafil bir şeirində yazır:

*Məktəbi-eşqdə bir tifli-səbəqxan idim,*
*Rəhmət ol Seyyidə kim, eylədi ustad məni*[175].

Şairin vəfatından sonra ona rəhmət oxuyan Qafil «eşq məktəbi» dedikdə, əlbəttə, şeir-sənəti, bədii sözü nəzərdə tuturdu.

«Beytüs-Səfa»nın neçənci ilədək davam etdiyi haqda əlimizdə bir fakt yoxdur. Çox güman ki, məclis 1876-cı ildən, daha doğrusu, Məhəmməd Səfanın vəfatından sonra onun evində yox, ya Seyid Əzimin məktəbində, ya da növbə ilə şairlərin evində toplaşmışdır. M.M.Nəvvab 1891-ci il oktyabr ayının 24-də şikayət təriqi ilə “Məclisi-üns»də yazdığı məktubunda deyir:

*Əgər imdadə yetməklik sizə lazım deyil, yaran,*
*Nə vacibdir, nə sünnətdir, həmin bir qövli-bicadir.*

*Edin məlum, ta «Beytüs-Səfa»yə eyləyim şikvə,*
*Deyirlər kim, səadətdə «Səfa» əhli müsəffadır.*

*«Fəramuşan»da «Üns» əhli qoyub məzlum Nəvvabı,*
*Xəyalilə cədəl eylər ki, bunlar nə təmənnadır*[176].

---

175 Yenə orada, s. 1148.
176 ƏYİ, M – 67, vər. 271.

Yuxarıda «Edin məlum, ta «Beytüs-Səfa»yə eyliyim şikvə; Deyirlər kim, səadətdə «Səfa» əhli müsəffadır» beytindən görünür ki, Şamaxı şairlərinin məclisi S.Əzimin vəfatından sonra 1890-cı illərə kimi davam etmişdir.

«Beytüs-Səfa» ədəbi məclisinin rəhbəri S.Ə.Şirvani haqqında çoxlu tədqiqat işi aparılmış, şairin həyat və yaradıcılığından dönə-dönə bəhs edilmişdir. Odur ki, həmin məclisin bir neçə üzvü haqqında qısa da olsa məlumat verməyi məqsədə müvafiq bildik ki, bunlardan biri də Molla ağa Bixuddur.

## Molla Ağa Bixud

«Beytüs-Səfa»nın görkəmli üzvlərindən hesab edilən, rəvan təbi, səlis dili, şirin ləhcəsi və cəsarəti ilə həmməclislərindən fərqlənən Molla Ağa Bixud, Seyid Əzim Şirvani, Mirzə Nəsrullah Bahar Şirvani, Mirzə Nəsrullah Didə, görkəmli səyyah Hacı Zeynalabdin Şirvani ilə müasir olmuşdur.

Molla Ağa Hacı Molla Tağı oğlu Bixud 1830-cu ildə Şamaxıda ruhani ailəsində doğulmuş və təhsilini də həmin şəhərdə almışdır. Mollaxanada ərəb-fars dillərini mükəmməl öyrənən Ağa şəxsi mütailəsi sayəsində Şərqin görkəmli şairlərinin əsərlərinə dərindən bələd olur ki, bu da onda şeir yazmağa böyük həvəs oyadır. Kiçik yaşlarından baftaçılıqla məşğul olan şair, sonralar Mahmud ağanın karvansarasının yanında balaca bir dükan açıb ətriyyat satmaqla güzəran keçirmişsə də, ömrünün sonuna kimi şeir-sənətdən ayrılmamışdır. Dəfələrlə Qafqazın və İranın müxtəlif şəhərlərinə səfər etməsi, müxtəlif xalqların həyatı, güzaranı və gəzdiyi yerlərin arifləri ilə tanış olması Bixudun dünyagörüşünə öz təsirini göstərmişdir. Ömrünün çoxunu Şamaxıda keçirən şair 1892-ci ildə 62 yaşında ikən vəba xəstəliyindən vəfat etmişdir. Şamaxının cahil dindarları və var-dövlət sahibləri S.Əzimə necə münasibət bəsləmişlərsə, Bixuda da eyni nəzərlə

baxmışlar. Onlar şairi dinsiz və meypərəstlikdə ittiham edərək, onun cənazəsinə yaxın durmağa, hətta namazını belə qılmağa heç kəsə icazə verməmişlər. Nəhayət, İrandan gəlmə bir neçə şəxs və Şamaxının bəzi cavanları pul toplayıb, şairi dəfn etmişlər.

Molla Ağa Bixud haqqında ilk məlumata S.Ə.Şirvaninin təzkirəsində və F.Köçərlinin «Azərbaycan ədəbiyyatı tarixi materialları»nda rast gəlinir. Hər iki müəllif şairin qısa tərcümeyi-halını və beş-altı qəzəlini vermişdir. F.Köçərli onun bir divanı olduğunu göstərirsə də hələlik əldə edilməmişdir. F.Köçərlidən sonra Ə. Müznib Bixudun otuza qədər qəzəlini toplaya bilmişdir. AMEA Əlyazmalar İnstitutunda saxlanılan bəzi fraqment və cünglərdə də onun bir neçə qəzəli vardır.

Bixud müntəzəm surətdə Şuşadakı “Məclisi-fəramuşan», “Məclisi-üns» və Bakıdakı “Məcməüş-şüəra» üzvləri ilə, eləcə də Dərbənd şairləri ilə müşairələrdə olmuş, onlarla tez-tez məktublaşmışdır. Dərbənd şairlərindən M.T.Qumri və M.K.Şüai «Beytüs-Səfa» şairlərini musiqipərəstlikdə və mey içməkdə təqsirləndirdikləri zaman onlara kəskin və tutarlı cavab verənlərdən biri də Molla Ağa Bixud olmuşdur. Məlum olduğu kimi, XIX əsrdə ədəbi məclislər dövründə Dərbənd şairləri qatı təriqətçilik mövqeyində durub, şiəliyi təbliğ edirdilər. Böyük istedad sahibi olan Qumri bütün ədəbi fəaliyyətini Həzrət Əli mədhinə və Kərbəla hadisələrini yanıqlı bir dillə qələmə almağa həsr etmişdir. Bixud Dərbənd şairlərinin əksinə olaraq, məzhəb və təriqətlərə qarşı çıxmışdı. Qumri və Şüai kimi şairlər həcv yazıb Şamaxıya göndərmiş, açıq fikirli şairə nalayiq sözlər demişdilər. Belə bir həcvin qarşısında isə Bixud onlara yazırdı ki, mən sizə daha kəskin cavab yaza bilərdim. Lakin arif, bilicilər və mərifət sahibləri həcvguluq etməzlər. Hər hansı bir təriqət və məzhəbə qarşı çıxan, şair onlara cavab olaraq yazırdı:

*Mənəm babi, mənəm şeyxi, mənəm sünni, mənəm şiə,*

*Mənəm ol bütpərəst kim, məndə cəbr ixtiyar olmaz*[177].

Vaxtilə «Əkinçi» qəzetinin fəal əməkdaşlarından Əhsənül-Qəvaid həmin qəzetdə (1876, № 7) şairlərə toxunan, xüsusən şeirin islam dininə yad olmasını iddia edən bir məqalə ilə çıxış etmişdir[178]. Bu məqalə Şuşa və Şamaxının bir çox şairlərinə toxunmuş və hər kəs qabiliyyətinə görə Əhsənül-Qəvaidə cavab yazıb onu tənqid atəşinə tutmuşlar. O cümlədən Seyid Əzim də belə bir həcv yazmış, lakin nədənsə H.Zərdabi onu öz qəzetində dərc etməyi məqsədə müvafiq bilməmişdi. Bundan sonra Əhsənül-Qəvaidin məqaləsinə etiraz olaraq «şüərayi-ərbəeyi-Şirvan» (dərd Şirvan şairi) adından Seyid Əzim, Qafil və Zöv'i ilə yanaşı, Bixud da həmin cavab məktubunun yazılmasında yaxından iştirak etmişdir. Həmin məktubda, məlum olduğu kimi, Şirvan şairləri Əhsənül-Qəvaidi, ümumiyyətlə şeirin məzmununu dərk etməməkdə, sağlam zövqü və təbi olmamaqda təqsirləndirirlər. İbn Sina, Sədi, Hafiz, Şeyx Bəhai və Əli İbn Əbu Talibdən, hətta Qurandan gözəllərin tərifinə dair misallar gətirərək onun məzəmmətinin yersiz olmasını sübut edirdilər.

Bixud Şuşa şairləri ilə yaxından dostluq etmiş, orada yaranan hər iki məclislə müntəzəm olaraq məktublaşmışdır. Təsadüfi deyildir ki, Şuşada ilk dəfə təşkil olunmuş "Məclisi-üns»ü təbrik edənlərdən biri də Bixud olmuşdur. O, "Məclisi-fəramuşan»la, xüsusən Abdulla bəy Asi ilə dost olmuşdur. Bu iki dost şair bir-birilərinə mənzum məktublarını eyni bəhr, eyni vəzn və eyni qafiyədə yazmış və hər ikisi cavabların eyni vəziyyətdə – xoş məqamda çatmasını, onun gəlişindən hədsiz dərəcədə fərəhləndiklərini obrazlı ifadələrlə, bədii boyalarla ifadə etmişdilər.

Xurşidbanu Natəvanın oğlu Mir Abbasın vaxtsız ölüm xəbəri tezliklə bütün şəhər və kəndlərə yayılan zaman yerbə-

---

[177] Köçərli F. Materiallar. II c. I hissə. s. 30.
[178] "Əkinçi" qəzeti, 1876, N 7.

yerdən ona təziyələr göndərməyə başladılar, həmin münasibətlə xüsusi qəzəl yazıb Şuşaya – Natəvana göndərənlərdən biri də Bixud olmuşdur.

Bixud yaradıcılığının ilk dövrlərində mərsiyə, sinəzən kimi dini xarakterli şeirlər yazmış olsa da, hələlik onlar bizə məlum deyildir. Onun əldə olan şeirlərinin bir qismi insanların dinə olan inamından öz şəxsi mənafeləri üçün istifadə edən fırıldaqçı mollaların əleyhinə yazılmışdır. Bixud klassik şeir ənənələrinə yenilik gətirən sənətkarlardandır. Doğrudur, biz erkən klassiklərimizin də yaradıcılığında din xadimlərinin – vaiz, zahid və mollaların tənqidinə rast gəlirik. Lakin bu, onların yaradıcılığı üçün səciyyəvi hal deyildi. Bu cəhət XIX əsr şairlərindən M.İ.Qasir, S.Əzim, M.H.Qarabaği, M.A.Bixud və başqalarında daha da qüvvətlənir, səciyyəvi hal alır. Bu baxımdan Bixud xüsusilə diqqəti cəlb edir. Şairin aşağıda bir hissəsini verdiyimiz müstəzadı bu mövzu ilə əlaqədardır:

*Firdovsi-bərin, qəsri-tila, çeşmeyi-təsnim,*
*Olsun sənə təslim,*
*Çəkdim əlimi, lölövü-mərcan sənin olsun,*
*Sən olma mükəddər.*
*Əlminnətə lillah ki, könül yetdi muradə,*
*Qalmışdı aradə,*
*Sən get dolan avarə, biyaban sənin olsun,*
*Bi-hadiyü-rəhbər.*

*Bixud ki, məlamətlərə xəlq içrə boyandı,*
*Yatmışdı, oyandı.*
*Get, dəhrdə, zahid, sərü-saman sənin olsun*
*Əl çək dəxi, kafər!*

Molla Ağa Bixud qəzəllərində olduğu kimi rübailərində də cəmiyyətin tüfeyli ünsürlərini tənqid atəşinə tutur, onların əməllərini üzlərinə deməkdən çəkinmirdi:

*Zahid bizi görcək tüpürür, ar etməz,*
*Bilməz ki, tüpürcəyi bizə kar etməz.*
*Biz bəhri-mühit qılmışıq kendimizi,*
*Bir zərrə nəcasət bizi murdar etməz.*

Farsca yazdığı bir rübaisində o, mərsiyəxana belə deyir:

ای مرثیه خوان حسین بیزار از تو
آشفته و خسته، دلفکار از تو
يك باربه دست شمر شد کشته ا گر
هر سال شود کشته به صد بار از تو

*(Mərsiyəxan, Hüseyn bizar əlindən,*
*Olmuş pərişan, dilfikar əlindən,*
*Əgər yek bar Şümr öldürmüşsə onu,*
*Olmuş həlak sənin yüz bar əlindən).*

Göründüyü kimi, rübailərində daha açıq çıxış edən Bixud zahirdə özünü Hüseyn aşiqi kimi göstərən, batində isə məhərrəm ayını özü üçün gəlir mənbəyi hesab edən, pul və var-dövlət yolunda dəridən-qabıqdan çıxan mərsiyəxanları Şümrdən də alçaq hesab edirdi. Məhz buna görə də Qumri, Şüai kimi mühafizəkar şairlərin onu görməyə gözü yox idi. onlar şairi «kafir» adlandırır və addımbaşı lənətləyirdilər. Bixud qəzəllərindən birində

*Əldə əbnayi-zaman səngi-məlamət götürüb,*
*Gör nə şövq ilə baxırlar məni-divanə sarı*

- deməklə məhz belələrini nəzərdə tutmuşdu.

Bir tərəfdən Seyid Əzim kimi yaxın həmdəmin vəfatı, bundan sonra isə «Beytüs-Səfa»nın az-az toplaşması, məclis üzvlərinin müşairələrdən soyuması, digər tərəfdən şairə düş-

mən kəsilən ruhanilərin fitvası ilə avam camaatın soyuq münasibəti onda bədbinlik yaratmışdı. Həmişə nikbin əhvali-ruhiyyəli şeirlər yazan Bixud bu dövrlərdə dünyanın əzəldən qəmxanə və dost-aşnanın əfsanə olduğunu, özünə dərd-qəmdən başqa bir yari-vəfadar qalmadığını aşağıdakı iki beytini verdiyimiz qəzəlində belə ifadə etmişdir:

*Aşinalıq bu fəna mülkdə əfsanə imiş,*
*Ah, səd ah, bu viranə əcəb viranə imiş!...*

*... Könlüm, etmə bu qədər ah, gözüm, tökmə sirişk*
*Ki, cəhan ruzi-əzəldən bizə qəmxanə imiş...*[179]

Füzuli məktəbinin davamçılarından olan Bixudun qəzəllərində nikbin ruh, təmiz eşq, saf məhəbbət tərənnüm edilir, huri, mələk, behişt, cənnət kimi dini-əfsanəvi ifadələrə, demək olar ki, rast gəlinməyir. Bunun əksinə, şairin təsvir etdiyi gözəlin sifəti ay, günəş, saçları reyhan, sünbül, yanağı lalə, boyu sərv kimi təbiətdə mövcud olan şeylərə təşbeh tutulur. Dilinin anlaşıqlı, qəliz ifadələrdən uzaqlığı, rəvan və ahəngdar olması, ifadələrin obrazlılığı onun qəzəllərinə xüsusi bir səmiyyət və şirinlik verir. Onda ağır qafiyə, rədif və ifadələrə nadir hallarda rast gəlmək olur. Misal üçün aşağıdakı iki beytə nəzər yetirək:

*Arzu eylər könül kim, can ara min can ola,*
*Ta ki, xaki-payına hər dəm biri qurban ola.*
*Qanımı tök, canımı al, leyk yıxma könlümü,*
*Çünkü öz mülkündü, ey məh, istəmə viran ola*[180].

---

[179] ƏYİ, Arx. 38, Q – 5 (147).
[180] Yenə orada.

Adi bir qəzəldən tutmuş iri həcmli dastanlara qədər hər bir bədii əsər yarandığı dövrün ictimai fikrinin surətidir, onu yaradan xalqın təfəkkürünün bir qismidir. Bu cəhətdən Bixudun əldə olan qəzəlləri də ictimai fikir tədqiqatçıları üçün maraqlı materialdır.

## Mirzə Nəsrullah Didə

XIX əsrdə yazıb-yaratmış Şamaxı şairləri içərisində Seyid Əzim və Bahar Şirvanidən sonra diqqəti cəlb edən şəxsiyyətlərdən birisi də Mirzə Nəsrullah Didədir.

Mirzə Nəsrullah Qurban bəy oğlu Qurbanbəyov Didə 1797-ci ildə Şamaxıda anadan olmuşdur. Mustafa xanın sarayında münşi (katib) işləyən atası Qurban bəy küçədə savaşan iki nəfərə harayçılıq edəndə təsadüfən öldürülmüşdür. Qurban bəyin xatirini çox istəyən Mustafa xan qatili tutub kiçik Nəsrullaha təqdim etmiş və buyurmuş ki, atasının qisasını alsın. Lakin təmkin və ağıl sahibi olan Nəsrullah bu işdən boyun qaçırmışdır. Yetim qalan qardaşların – Nəsrullah ilə Əsədullahın bu alicənab hərəkəti onların Şamaxı camaatı arasında hörmət və nüfuzunu qat-qat artırmışdır.

Hər iki uşağın təlim-tərbiyəsi ilə maraqlanan Mustafa xan bir qədər sonra bütün xərci öz üzərinə götürərək onları təhsil almaq üçün Təbrizə göndərmişdir. Təhsildən qayıtdıqdan sonra Mirzə Nəsrullah Şamaxıda mirzəlik və müəllimlik etmişdir.

Ərəb-fars dillərini mükəmməl bilən Mirzə Nəsrullah müstəqil olaraq rus və erməni dilini də öyrənmiş, rus dilini yaxşı bildiyi üçün bir müddət Şamaxıda quberniya idarəsində katib vəzifəsində çalışmışdır.

1859-cu ildə Azərbaycanın mərkəzi Şamaxıdan Bakıya köçdükdən sonra o, Şamaxının Şeyx Minazlı məhəlləsində bir məktəb açıb, ömrünün sonuna kimi pedaqoci fəaliyyətini davam etdirmişdir.

Didənin həyatının son illəri məşəqqətlə keçmişdir. O, şeirlərinin birində güzəranından şikayətlənərək yazmışdı:

*Yığılıb övrət-uşaq hər biri bir zad dilər.*
*Tökülübdür bu qədər murü məgəs canım üçün.*
*Bir deyil fikrü müsibət, birinin fikrin edim,*
*Yüz bəlalər yeriyir haləti-piranım üçün*[181].

Yaxud:

*Niyə yarəb, məni xəlq elədin acü fəqir?*
*Niyə yarəb, məni xəlq elədin müflisi-mal?*
*Niyə bu mərtəbədə eyləmisən ruzimi təng?*
*Niyə bu payə qılıbsan günümü qarə lial?*
*Hansı gün ruzim olub, ol günü eyd eyləmişəm,*
*Hansı şəb nanım olub, yatdım o şəb farüğbal*[182].

Həmişə ehtiyac içərisində yaşayan şair 1870-ci ildə Şamaxıda vəfat etmişdir. Didə haqqında ilk dəfə Seyid Əzim, sonra isə Azərbaycan ədəbiyyatının görkəmli tədqiqatçılarından Salman Mümtaz məlumat vermişdir. 1928-ci ildə Salman Mümtaz «Mirzə Nəsrullah bəy Didə» adlı bir kitabça nəşr etdirmişdir. Burada Didənin həyatına aid qısa məlumatla yanaşı, müəllif onun bir neçə qəsidəsi və bir mənzum hekayəsini də vermişdir. Görünür, S.Mümtaz, Seyid Əzim təzkirəsindən xəbərdar olmamışdır ki, şairin orada göstərilən əsərlərindən heç birinin adını çəkməmişdir. Salman Mümtazın yazdığına görə, Didə «ömründə heç bir qəzəl və həcv söyləməmişdir». Ola bilər ki, Didə, doğrudan da, təbiətinə müvafiq olaraq həcv yazmamışdır. Lakin qəzələ gəldikdə bunu demək olmaz. Şairi yaxşı tanıyan və haqqında yüksək fikirdə olan S.Əzimin onun qəsidə və qəzəldən ibarət bir «Divan»ı

---

[181] ƏYİ, C – 265, vər. 26 a.
[182] Salman Mümtaz. Nəsrullah Didə. Bakı, 1928, s. 7.

olduğunu qeyd etməsi S.Mümtazın fikrini rədd edir. S.Mümtaz Didənin bir mənzum hekayəsinin həm müxtəlif millətlərdən olan surətlərini, həm də onların hər birinin öz dillərində danışdırmasını əsas tutaraq onu beynəlmiləlçi bir şair kimi qələmə verir və həmin müləmməni beynəlmiləl ruhda yazılmış «təraneyi-dahiyanə» adlandıraraq müəllifi bu xidmətlərinə görə ədəbiyyat tariximizdə unudulmaz bir şəxsiyyət kimi səciyyələndirir.

Kitabçanın əvvəlində Azərnəşr tərəfindən «Bir neçə söz» başlığı ilə yazılmış müqəddimədə doğru olaraq göstərilir ki, Didə həmin əsərində beynəlmiləl fikir irəli sürmür. O, ərəb, türk, fars, erməni və rusdan ibarət olan beş nəfər yoldaşın bir tikə çörək üstündə dalaşmalarını və sonra barışmalarını yazsa da, əsərin sonunda «Hər şeyi fələki-kəcrəftarın şıltaqlığına rücu ilə acizcəsinə

*Eyləməyib bir kəs ilə ittihad*
*Şaki ondan Xosrovü Cəm, Keyqubad*

deməklə mühitinin ruhunu bir halda ortaya qoymuş olur[183]».

Müqəddimənin sonunda göstərilir ki, «millətləri savaşdırmaq, sonra da barışdırmaq məsələsi köhnə ədəbiyyatımızda şairlərin arasında çoxdan mütədavül bir inşa yoludur. Hər birisi müəyyən bir fikir ifadə etmək üçün hekayəni nəzmə çəkərdi. Bu da onların birisidir».

Bizə elə gəlir ki, hər bir xalqın görkəmli nümayəndələri bir xalqı, bir milləti dalaşdırıb, sonra barışdırmaq kimi zərərli mövzunu qələmə almaz. Əgər həyatda belə hallar olmuşsa da bunu qələmə alanlar «dalaşan millətləri» əbədi barışdırmaq kimi nəcib bir əmələ, fikrə xidmət etmişlər. Xalq arasında söylənən bir lətifəni nəzmə çəkən Didə heç də onları dalaşdırıb, barışdırmaq fikrində olmamışdır. Belə bir ədəbi

[183] Salman Mümtaz. Nəsrullah Didə. Bakı, 1928, s. 5.

üsul bəlkə də heç onun xəyalına gəlməmişdir. Müəllif sadəcə olaraq bir lətifəni nəzmə çəkmişdir. Şeirin özündə də bir millətin nümayəndəsini digərinə qarşı qoymaq fikri yoxdur. Lakin bununla belə müqəddimədə doğru olaraq göstərildiyi kimi, S.Mümtaz Didəni «Heç ölməyən yeni bir fikir təlqin edən xidmətdə bulunmaq və beləliklə də «mücərrəd bir vücud» kimi səciyyələndirməklə, əlbəttə, çox ifrata varmış, həddindən artıq mübaliğəyə yol vermişdir.

Seyid Əzimin Qarabağ şairlərinə və başqalarına yazdığı mənzum məktublarında Didənin adını «Beytüs-Səfa» şairləri ilə bir sırada çəkməsi göstərir ki, Mirzə Nəsrullah da həmin məclisin iştirakçısı olmuşdur. S.Əzim Didəni ərəb-fars, rus dillərini gözəl bilən, «hər bir lisan ilə danışmağa qadir, arifül-həqayiq və kaşifüd-dəqayiq, şeyxuş-şüəra və qütbül-ürəfa Mövlana Mirzə Nəsrullah» kimi səciyyələndirir», məktəb uşaqları üçün tərtib etdiyi «Kitabün-nəsihətül-ətfal», Kərbəla müsibətinə dair «Məqtəl», qəzəl və qəsidələrdən ibarət «Divan»ı olduğunu qeyd edir.

«Beytüs-Səfa» məclisində müntəzəm iştirak edə bilməyən Didənin şeirləri orada oxunar və yüksək qiymətləndirirlərdi. Belə ki, Seyid Əzim «divani-qəsaid və qəzəliyyatının məşhur» olduğunu və «ariflər məclisini nurlandırdığını» yazır və öz təzkirəsində onun Azərbaycan dilində yazdığı bir neçə şeirini (bir qəsidə, iki qəzəlini) nümunə verir.

Əldə olan bir neçə şeirindən görünür ki, Didə yoxsul ilə varlılar arasında olan kəskin ziddiyyətə və yaşadığı dövrün digər təzadlarına biganə qalmamış, yeri gəldikcə bütün bunlara qarşı öz narazılığını bildirmişdir:

*Füqəra cümlə baxır, ey gözü ac dövlətmənd,*
*Sən yığırsan bu qədər mal, əcəb malamal…*
*Füqarə hər gecə tədad qılır əşki-sirişk,*

*Sən sayırsan gecələr simü zərü imperial*[184].

Bir şeirinin əvvəlində şair dünyanın puç olmasını, onda «vəfa və etibarın» yoxluğunu göstərdikdən sonra insanların bəd əməllərindən bəhs edərək yazır ki, kimisi qaziliyə tənə etdiyi halda, qərəzi qəzavətdə əyləşməkdir, birisi dünyaya uymamağı nəsihət edirsə də, fikri-xəyalı həmişə dövlət toplamaqdır, müəzzinin məqsədi özünə «dən» toplamaqdır, adını həkim qoyanın əlindən xalqı qətlə yetirməkdən başqa bir iş gəlməyir, ziyarətə gedənin məqsədi ancaq camaat arasında özünə hörmət qazanmaqdır, hər kim fəqir malından toplanan var-dövlətdən bir zəkat verirsə, özünü səxavətli kimi göstərir, bununla fəxr edir:

*Kimisi rüşvət alıb həq sözü edər nahəq,*
*Kimisi zərb tutur, fitnəcu, xəsarətdir.*
*Kimisi pul gətürüb Kəbəyə iradə edər,*
*Muradı hörmətidir, zahiri ziyarətdir.*
*«Cənab-Hacı» demək şəninə büənd gəlir,*
*Xitabi-məclisi-ülya böyük fəxarətdir,*
*...Kimisi qət qılıb mürvət ilə insafın,*
*Adını təbib qoyub, qətl binihayətdir.*
*Ölüncə xəlqi soyur, hər qədəm olur zalim,*
*Məriz fövtü ona guyiya zərafətdir*[185].

Müəyyən dərəcə Q.Zakirin satiraları ilə səsləşən bu şeirin məzmunundan görünür ki, şairdə yaranan küsüklük, bədbin əhvali-ruhiyyə cəmiyyətdə hər addımbaşı rast gəldiyi ədalətsizlik, haqsızlıq, riyakarlıq və məişətinin ağır keçməsindən doğmuşdur. Didənin bu şeiri hansı mövqedən yazılmasından asılı olmayaraq oxucunu düşündürür, onda

[184] Salman Mümtaz. Nəsrullah Didə. Bakı, 1928, s. 7.
[185] Yenə orada, s. 66.

cəmiyyətin zərərli ünsürlərinə qarşı nifrət oyadır. Bizcə şeirin əvvəlində şairin «dünyayi-faniyə etibar etməyib» ölümü yada salması onun qiymətini o qədər də azaltmayır. Çünki şairin məqsədi insanları bəd əməllərdən çəkinməyə, hiylə və fəsaddan uzaq olmağa çağırırsa demək bu, ancaq cəmiyyət üçün faydalı, namuslu bir üzv olmaq xatirinə və dövrün tələbinə görə məhz belə edilmişdir.

Mirzə Nəsrullah Didənin yaradıcılığında əsas yeri tutan onun müdərrislik fəaliyyəti ilə əlaqədar olaraq Azərbaycan dilində yazdığı «Kitabün-nəsayeh»* («Nəsihətlər kitabı») əsəridir. Gözəl nəstəliq xətti ilə 1857-ci ilin fevral ayında yazılmış 150 səhifəlik bu əsərin avtoqrafı AMEA Əlyazmalar İnstitutunda saxlanılır[186]. Qafqazda məktəblərin açılmasını alqışlayan müəllif yerli əhalinin türk dilində danışdığını nəzərə alaraq, məktəb uşaqları üçün ana dilində qiraət kitabı kimi həmin əsərinin çap olunmasını arzu edirdi. Həmin əsər haqqında qısa olsa da ilk dəfə A.Abdullayev məlumat vermişdir[187]. «Bir sıra dini və sxolastik fikirlər olmasına baxmayaraq… bir çox mühüm həyati və tərbiyəvi məsələləri əhatə etdiyindən» «Kitabün-nəsayeh»i yüksək qiymətləndirən prof. A.Abdullayev əsərin ayrı-ayrı fəsillərinin və sərlövhələrinin adlarının çəkməklə kifayətlənmişdir.

«Kitabün-nəsayeh» iki fəsil və bir xatimədən ibarətdir. Müəllif hər fəsli on iki baba bölmüşdür.

Birinci fəsildə insanın şərəfini ucaldan və gözəl xasiyyətlərini təcəssüm etdirən, ikinci fəsildə isə onun şəxsiyyətini alçaldan sifətlərdən bəhs edilir. Xatimədə isə ibrətamiz hekayət və hikmətli sözlər verilmişdir. Kitabı yazmaqda müəllifin əsas məqsədi o olmuşdur ki, «oxuyanlar təcrübə və fərasət götürüb,

---

* Mirzə Nəsrulla Didə. Kitabün-nəsayeh. Bakı, Nurlan, 2008, 212 s. **(red. – V.M.)**

186 ƏYİ, D – 353.

187 Abdullayev A. Azərbaycan dilinin tədrisi tarixinə dair. Bakı, 1958, s. 57.

onların hüsn və qübhini istinbat etsinlər, bundan sonra yamanlarını tərk edib, yaxşılarının dalınca getsinlər[188]».

Əsərin birinci fəslində on iki yaxşı sifətlər göstərilir ki, bunlar ağıl, həya, şücaət, sədaqət, təvazökarlıq, səbr, şükr, ədəb, əhdə vəfalıq, sirr saxlamaq, rəhmlilik və əmanət barəsindədir. Müəllif hər bir babda irəli sürdüyü fikri təlqin etmək üçün müvafiq misallar gətirir. Çox maraqlıdır ki, onun gətirdiyi misalların hamısı tarixi və ya əfsanəvi şəxsiyyətlərin həyatı haqqında söylənən rəvayətlərdəndir.

Həyatı insanın zinəti hesab edən Didə Nuşirəvan haqqında belə bir rəvayət söyləyir: bir bağban hədiyyə almaq məqsədilə Nuşirəvana bəxşiş olaraq üç nübar xiyar gətirir. Nuşirəvanın bir adəti var idi ki, ona gətirilən hər bir şeyi məclisdəkilərə paylayardı. Lakin bu dəfə xiyarlardan heç kəsə verməyib, üçünü də özü yeyir. Yaxın adamlardan biri bunu hiss edir və səbəbini soruşur. Nuşirəvan ona cavab verir ki, mən xiyarın üçündən də daddım, gördüm hamısı acıdır. Ona görə də heç kəsə paylamayıb özüm yedim ki, birisi qəflətən onların acı olmasını bildirər, bağban xəcalət çəkər.

Və yaxud səxavət barəsində yazılmış ikinci babdan bir misal: Bir nəfərdən soruşurlar ki, sən bu səxavəti kimdən öyrənmisən? – O, - Ev tikən bənnadan – deyə cavab verir və deyir: Gördüm ki, usta əlində bir kərpiç tutub, ta onu sərf etməsə başqasını verməyirlər. Bundan sonra həmin səxavətli şəxs belə bir rəvayət danışır: Bir dəfə Soltan Mahmud güzgüyə baxıb özünün çox çirkin olduğunu gördükdə qəmgin olur. Vəzir bunun səbəbini soruşduqda deyir: Mən ki bu qədər çirkinəm, qorxuram baxanların gözünü kor edəm. Vəzir isə ona çoxlu bəxşişlər verməsini və beləliklə, tamam gözlərdə ziba kimi cilvələnməsini məsləhət görür. Didə onu da göstərir ki, əsl səxavətli adam özgənin yox, öz malını paylayar və bəxşişi yerində vermək, onu sonradan minnət yükünə

---

[188] ƏYİ, D – 353, vər. 5 a.

çevirmək lazım deyildir. Müəllif bunların hər birinə dair müvafiq misallar gətirməklə fikrini tamamlayır.

Şücaətdən danışan müəllif göstərir ki, əsl igidlik müharibə meydanında, döyüşdə göstərilməlidir. Özünü təhlükəli mərəkəyə salmaq şücaətdən deyildir. Tədbiri də şücaətin bir hissəsi hesab edən müəllif müharibə meydanında hiylə işlətməyi də qoçaqlıq sayır. O yazır ki, iki ərəb sərkərdəsi qoşunlarını üzbəüz saxlayıb əvvəlcə özləri meydanda döyüşmək üçün bir-birinə yaxın gəlirlər. Əlbəyaxa məqamında biri o birinə deyir ki, «bəs sən söz vermişdin, mənim müqabilimə tək gələcəksən, arxandakı kimdir?» O, çevrilib arxasına baxanda bu biri tez onun başını bədənindən ayırır.

Sədaqət babında bir neçə dünya görmüş şəxslərdən misallar gətirir. Onların hər biri sədaqəti insanın ən yaxşı sifətləri kimi tərif edirlər. Bu şəxslərdən birisi danışığı elə bir qoşuna bənzədir ki, doğruluq, sədaqət həm onun bayrağı, həm də qələbəsidir. Başqa birisi isə danışığı elə bir həqiqət divanına oxşadır ki, doğruluq onun nicat fərmanıdır.

Təvazökarlıqdan bəhs edərkən müəllif deyir ki, o, insanın zatının kəraməti və nəciblik nişanəsinin böyük əlamətidir. Təvazökarlıqda şikəstlik varsa da, şikəstəxatirləri dürüst eylər, üftadəlik olsa da, sahibinin mərtəbəsini ucaldar. Böyüklərin təvəzökarlığı kiçiklərə ulduzların şüası kimidir.

Səbr haqqında öz mülahizələrini söyləyərkən xalq arasında işlənən məşhur «turş qoradan şirin halva, tut yarpağından yaşıl atlas olar» məsələlərindən istifadə edən müəllif göstərir ki, səbr acı olsa da, onun nəticəsi şirindir.

Şükr babında hər şeyi bir növ qəza-qədərlə bağlayan Didə hər nemətə qane və razı olmağı məsləhət bilir. Səbr babında olduğu kimi, burada da bir çox dini xarakterli rəvayətlər vardır.

Müəllif ədəb və mərifət babında çoxlu misallar gətirərək göstərir ki, ədəbli olmaq hər millət içərisində mərğub sayılan gözəl sifətlərdəndir.

Sirr saxlamaqdan bəhs edilən babda deyilir ki, bir sirri iki adam bildisə, o, daha sirr deyildir. İki adamdan, ya iki dodaqdan bayıra çıxan sirri saxlamaq olmaz. Hər kəs sirri saxlarsa, sirr də onu saxlar. Ağıllı adamların qəlbi sirrin zindanıdır. Sirr saxlamağa dair qədim rəvayətlərdən çoxlu misallar gətirən Didə oxucusunu ağzı bərk olmağa çağırır.

Əhdə vəfadan danışan müəllif vədə xilaf olmağı yalançılığın sərdəftəri hesab edir. Didəyə görə, əhdə vəfasızlıq qızıl gülü çıxarıb yerinə tikan əkmək kimi bir şeydir. Əhdinə vəfa edən şəxsin sözünə bütün el inanır.

Əmanət saxlayanı etibarlı xəzinədara bənzədən Didə qeyd edir ki, əmanətə sadiq olan hər bir şəxs millət içində mötəbər olar. Müəllif bu barədə də maraqlı rəvayətlər danışır.

Nəhayət, on ikinci babda rəhmdillikdən, xeyirxahlıqdan, əlacsızlara köməkdən danışılır. Müəllif qeyrət və namusun ayrılmaz hissəsi olan rəhmdilliyin ibadətdən də əfzəl olduğunu göstərir.

«Kitabün-nəsayeh»in ikinci fəsli yuxarıda deyildiyi kimi, yaman sifətlərdən bəhs edir. Burada şair insanın şərəfini alçaldan yalançılıq, xəsislik, tamahkarlıq, lovğalıq, xəyanətkarlıq, hərzəguluq (boşboğazlıq), həsəd, tələsmək, xəbərçilik, kinayəçi olmaq, qeybət və tündməzaclıq kimi on iki pis sifətdən bəhs edir.

Müəllifə görə, yalan elə bir şeydir ki, o, insanın istedadının məhv edir. Yalançı adamda istər-istəməz qeyri-insani, mənfi sifətlər də yaranır. Yalançı – nadan memar kimidir ki, tikdiyi evin əsası olmaz.

Xəsisliyin pisləndiyi ikinci babda deyilir ki, belə adam öz malından heç bir ləzzət görməz. Xəsisin dostu mal-dövlət toplamaq, düşməni isə onu xərc etməkdir. Burada da maraqlı misal və rəvayətlərdən istifadə edən Didə mənfi sifətlərin hər birinə oxucuda  nifrət oyatmağa çalışır. Məsələn: Xəsis bir dövlətlinin xəsis də bir nökəri var imiş. Aralarında hansının daha çox xəsis olması haqqında mübahisə gedir. Ağası deyir

ki, xörək hazırla, qapını ört, gəl yeyək. Nökər isə əvvəl qapını örtüb, sonra xörək hazırlamağı məsləhət görür.

Müəllif xəsisliyi dörd yerə ayırır: xəsis var, malını özünə sərf edər, özgəyə yox; xəsis var ki, malını özünə də sərf etməz, özgəyə də; xəsis də var ki, hər kimə bir şey versə, diltəng olar. Nəhayət, elə xəsis var ki, ona bir şey bağışlasalar qəmgin olar, fikir edər ki, bəlkə, bunun əvəzində o da bir şey verəsi oldu. Bu fikir onu rahat qoymaz.

Tamahkarlıq babında müəllif onu ən böyük zəlillik hesab edir. Didə, tamah ucundan başqasının qapısına gedən ayağı, yaltaqlıqla dövlətlinin qapısına qoyulan başı xəncərlə kəsməyə də layiq bilməyir. O deyir ki, tamahkarlıq kimi rəzil xasiyyəti sənət öyrənməklə dəf etmək olar. Əgər insanın bir sənəti olarsa, əliboş qalmaz və heç kəsə möhtac olmaz. Halal zəhmətin mayası olan sənət və peşəni təbliğ edən müəllif belə bir misal gətirir. Bir dəfə Kəştasib atasından acıq eyləyib, Rum elinə gedir və orada pulu qurtarır. Atası əvvəllər onu dəmirçilik sənətinə öyrətdiyi üçün orada həmin sənətin sayəsində heç kəsə əl açmayıb firavan dolanır.

Müəllif tarixdə öz sənəti ilə məşhur olan bir çox əfsanəvi şəxsiyyətlərdən misallar gətirir və bunu da qeyd etməyi unutmur ki, hər kəs öyrəndiyi sənəti kamil bilməlidir. Belə ki, insanın hansı sənəti varsa, onunla da məşhur olacaqdır.

Kibr və qürurdan danışarkən müəllif göstərir ki, nəcabətinə, gözəlliyinə, mənsəbinə, bilik və kamalına, var-dövlətinə, nəhayət, güclü olduqlarına görə lovğalanarlar. Lakin bunların heç biri lovğalanmaq və qürur etmək üçün əsas verməz. Çünki hamının əsəb-nəsəbi birdir. Mənsəblə də qürur etmək düzgün deyil. Belə ki, mənsəb sahiblərinin böyüklüyü kiçiklərin himmətindəndir. Onların məişətinin xoş keçməsi əli darda olanların hesabınadır. Həmişə hakimlərin işi mərdimazarlıq, gədaların işi ahü zardır. Amma hərə bir yol tapıb dolanır. Gözəllik də ki, bahar kimi şeydir, vaxt gələndə solub gedəcək. İnsanın əsl gözəlliyi onun xasiyyətindədir. Elm də sənətkarlıq

kimidir. Alim sənətkarlığı bilmədiyi kimi, sənətkar da onun işini bilmir. Didəyə görə, insanlıq heç də elmli olmaqlan ibarət deyildir. Çünki «molla olmaq asandır, adam olmaq müşkül…». İnsanın tək elmi yox, əxlaq və əməlləri də gözəl olmalıdır. Var-dövlət də elə bir şeydir ki, insan onunla lovğalanmamalıdır. Qüvvət və cavanlığa da etibar eləmək olmaz. Çünki iki günün xəstəliyi ilə qüvvət də yox olub gedər.

Xəyanətkarlıq və xain adamlar haqqında olan beşinci babda deyilir ki, bütün pis xasiyyətlər xain adamda cəmləşir. O, fürsət düşən kimi adamı çalan əfi ilana bənzəyir. İnsan üçün ən mühüm cəhət odur ki, heç kəsə xəyanət etməsin. Maraqlıdır ki, müəllif belə xasiyyətləri birinci növbədə padşah və onun məmurlarına, həmçinin yerli hakimlərə aid edir.

Növbəti fəsildə hərzəguluq pislənir və müəllif belə adamlardan uzaq olmağı məsləhət görür.

Yeddinci və səkkizinci bablarda paxıllıq, ölçüb-biçməmiş iş görməyin ziyanından, belə şəxslərin bəd əməllərindən bəhs edilir.

Xəbərçilik, söz gəzdirmək kimi xasiyyətləri pisləyən Didəyə görə, bir-biri ilə küdurəti olanın yanında elə söz danışmaq lazımdır ki, onlar barışandan sonra xəcalət çəkməyəsən.

Birisinə xəbər verirlər ki, filankəs sənin haqqında pis söz danışdı. O isə cavab verir ki, sən həmin adama xəyanət etmisən. Çünki o, sənə etibar edib yanında söz danışdı, sən isə həmin sözü mənə dedin. İndi həm onun yanında xəcalət çəkəcəksən, həm də mənim qəlbimi incitdiyin üçün mənə xoş gəlməyəcəksən. Əsərin on bir və on ikinci bablarında istehza, kinayə ilə birisinə gülmək, birisi haqqında qeybət etmək pislənir.

«Kitabün-nəsayeh» əsərinin xatiməsi hikmətli sözlər, ibrətamiz hekayətlər, faydalı nəsihətlər və lətifələrdən ibarətdir. Burada verilən nəsihətlər xüsusilə maraqlıdır. Həmin hissədə deyilir ki, bir nəfər mərifətli şəxs həqiqət danışan bir nəsihətçiyə yadigar saxlamaq üçün bir neçə nəsihətamiz söz

yazıb göndərməsini xahiş edir. O da iyirmi iki faydalı nəsihət yazıb göndərir. Bu nəsihətlərin hər biri yuxarıdakı fəsillərdə verilmiş məsələlərdən çıxarılan qısa nəticələrdən ibarətdir ki, onların bəzisi mühitin, dövrün təsiri ilə əlaqədar olaraq dini xarakter daşıyır. Oradakı nəsihətlərin əksəriyyəti indi də öz əhəmiyyətini itirməmişdir və müəllifin dünyagörüşünü təyin etmək üçün əhəmiyyətlidir.

Mirzə Nəsrullah Didənin bütün əsərləri, xüsusən Seyid Əzimin təzkirəsində adı çəkilən divanı əldə olmadığına görə, başqa şeirlərinin ümumi məzmunu və digər keyfiyyətləri haqqında qəti fikir söyləmək çətindir.

## Ağaəli bəy Naseh

«Beytüs-Səfa»nın gənc üzvlərindən olan Ağaəli bəy Naseh haqqında ilk məlumat F.Köçərli vermişdir[189]. Doğrudur, Seyid Əzim öz təzkirəsində Nasehin şeirlərindən nümunələr vermişdir, lakin həmin təzkirə pərakəndə olduğu üçün burada şairin həyatına aid bir məlumat yoxdur. Bu göstərilənlərdən başqa, AMEA Əlyazmalar İnstitutunda saxlanılan bəzi əlyazmalarında da onun bir neçə şeirnə rast gəlmək mümkündür[190].

Ağaəli bəy 1856-cı ildə Şamaxıda tacir ailəsində anadan olmuşdur. O, təhsilini molla məktəbində almış, ana dili ilə yanaşı fars dilini də mükəmməl öyrənmişdir. Məktəbi bitirdikdən sonra bir müddət ticarətlə məşğul olan atasının yanında işləmiş, ona kömək etmişdir. Atasının başqa övladı olmadığına görə o, ticarət məqsədilə uzaq yerlərə gedəndə evin təsərrüfatı və bazar işləri Ağaəlinin üzərinə düşürdü. Bununla belə avam camaatın qınağına və ata-anasının narazılığına baxmayaraq, Ağaəli on altı yaşından sonra rus dilini öyrənmək məqsədilə şəhər məktəbinə daxil olur və həmin məktəbin üçüncü sinfini

---

[189] F. Köçərli. Materiallar. II c. I hissə. s. 139.
[190] Bax: ƏYİ, D – 379, vər. 97 a – 101 a; B – 1585, vər. 3 b.

qurtarır. Rus dilinin yaxşı bildiyi və xüsusi qabiliyyəti olduğu üçün Şamaxıda məhkəmə idarəsinə katib vəzifəsinə işə düzəlir. İşdən sonra boş vaxtlarını mütailəyə sərf edən Ağaəli dövrünün tədris vəsaiti olan ərəbcə sərf-nəhv və məntiq kitablarını oxumaqla həmin elmləri mükəmməl öyrənir.

Xoş xasiyyəti, təmkinliyi, qeyrəti və şəxsi mütaliəsi sayəsində qazandığı biliyi ilə yaşıdlarından seçilən Ağaəli hələ gənc yaşlarından şəhər camaatının hörmətini qazanır. Ədəbiyyata, şeirə olan marağı onu Şamaxıda ədəbi yığıncaqlara, şairlərin, ariflərin məclislərinə çəkir. S.Əzim, Bixud, Qafil, Zöv'i, Didə və başqalarının söhbətləri onun ədəbiyyata olan həvəsini daha da artırır və az sonra «Beytüs-Səfa» ədəbi məclisinə qoşulur.

Ağaəli bəy Naseh F.Köçərli ilə yaxın dost olmuş, hətta ona Şirvan şairlərinin əksəriyyəti haqqında xeyli material vermişdir. «Beytüs-Səfa» məclisinin son dövründə Şamaxı şairləri tez-tez bir-birlərinin evlərinə toplaşar, yazdıqlarını oxuyub müzakirə edərdilər. Bir zamanlar M.Ə.Sabir, A.Səhhət və Tərrah da yeni yazdıqları şeirlərini müntəzəm olaraq «Mizanüş-şüəra» adlandırdıqları Nasehin yanına gətirər, onun məsləhətlərini və rəyini bilmək istərdilər. Naseh də həmişə onlara qaneedici cavab verərdi[191].

O, dövlət məhkəməsində katib işləməsinə baxmayaraq, mövcud quruluşun qayda-qanunlarından narazı idi. Dövrün ictimai haqsızlıqları şairi çox düşündürmüş və bu onun şeirlərində də öz əksini tapmışdır.

1905-ci il inqilabından sonra çar hökuməti tərəfindən açıq fikirli adamların təqib edilməsi, Nasehin də rahatlığını pozur. Onu tez-tez təqib etməyə başlayırlar. Naseh daha istədiyi vaxt öz həmfikirləri ilə görüşə bilməyir. 1911-ci ildə A.Səhhətin evində axtarış aparıldıqdan sonra Naseh daha da ehtiyatlı dolanır. Bundan sonra şeirlərinin bir qismini, çox güman ki,

[191] ƏYİ, B – 1585, vər. 4 a.

mövcud quruluş əleyhinə yazdığı əsərlərini evinin zirzəmisində yerə basdırır[192]. Beləliklə də, onun əsərlərinin əksəriyyəti itib batmış, bizə qədər gəlib çatmamışdır.

Ağaəli bəy Naseh 1914-cü ildə 58 yaşında vəfat etmişdir.

Naseh ömrünün son vaxtlarında «Nakam» adlı bir əsər yazmaq təşəbbüsündə olmuşdur. Azərbaycan qadınlarının həyatından, nadanlar əlində ağır məhrumiyyətlər və hüquqsuz yaşamasından, onların nakam taleyindən bəhs edən bu əsərin qəhrəmanı Qəmər adlı bir qadın olmuşdur. Əsərin tam mətni əldə deyildir. Bu haqda AMEA Əlyazmalar İnstitutunda saxlanılan bir əlyazmasında məlumat verilir və əsərdən bir neçə misra misal gətirilir[193]. Vəfasız gözəllərdən şikayət, sədaqətli və dəyanətli məşuqə yolunda sabitqədəm olmaq, saf məhəbbətin tərənnümü onun əldə olan qəzəllərinin əsas məzmununu təşkil edir.

Klassik üslubda yazan Nasehin işlətdiyi özünəməxsus orijinal ifadələri, obrazlı dili onun fərdi keyfiyyətlərindəndir. Şairin işlətdiyi bu ifadəyə nəzər salaq:

*Əridib könlümü gözdən tökən, ey çeşmi-qəzəl,*
*Müttəsil dideyi-aşiq kimi giryan olasan*[194].

Gözdən qanlı yaşın tökülməsi klassik ədəbiyyatda çox rast gəlinən ifadələrdəndir. Lakin aşiqin ürəyinin əriyib göz yaşına dönərək gözündən tökülməsi ədəbiyyatımızda az işlədilən mübaliğələrdəndir. İlqarı dönük, vəfasız gözəllər haqqında dediyi bu qəzəlində şair məşuqəsinin cövrü cəfasından şikayətlənərək onu öz zülfü kimi pərişan və ya ceyran

---

192 Yenə orada.
193 Yenə orada, vər. 3 b.
194 F. Köçərli. Materiallar. II c. I hissə. s. 140.

gözlüləri vəfasız olduqları üçün həmişə aşiqin gözləri kimi ağlar olmasını arzulayırsa da məqtədə:

*Naseha, sən də fəğan eyləmə, canın çıxsın,*
*Kim dedi aşiq olub hicrdə nalan olasan*[195]*?!*

deyərək yenə də özünü təqsirkar görür.

Məşuqəsi nə qədər sitəm etsə də, şairin lirik qəhrəmanı yenə ondan əl çəkməyib, sədaqətli, sabitqədəm aşiq olaraq qalır, onu təbiətin bütün nemətlərindən üstün tutur.

Şairin başqa qəzəlindən aldığımız bir beyti götürək:

*Şəhidi-navəki-mücganın olmaqçün kəfənləndim,*
*Könül, qan ilə qüslü vüzuə ehtiyacım var*[196]*.*

Şairin lirik qəhrəmanı sevgilisinin mücgan oxunun şəhidi olmaq üçün əvvəlcədən kəfən geymişdir. Lakin burada maraqlı bir cəhət şairin kəfən geymək əvəzinə işlətdiyi «kəfənlənmək» ifadəsidir ki, bu, danışıq dilində işlənmişsə də, yazılı ədəbiyyata ilk dəfə, bəlkə də, Naseh tərəfindən gətirilmişdir.

Natəvanın məşhur «Ölürəm» rədifli qəzəlinə nəzirə yazanlardan biri də Nasehdir[197].

Naseh məhəbbət mövzusu ilə yanaşı, yaradıcılığının son dövrlərində ictimai mövzulara da toxunmuş, dünyada haqq, ədalət, vəfa, rəhm və sədaqət əvəzinə haqsızlıq, zülm, hiylə, rəhmsizlik, zalimlik hökm sürdüyünü «Görürəm» rədifli müxəmməsində belə təsvir etmişdir:

*...Basıb aləmləri bidadü, ədalət yoxdur,*
*Qövllər kizb, əməl ləğv, sədaqət yoxdur.*
*Həsədü büğzdən özgə dəxi adət yoxdur.*

---

[195] Yenə orada, s. 141.
[196] Yenə orada.
[197] Yenə orada, s. 141 – 142.

*Hiç bir kəsdə vəfa, sidq, dəyanət yoxdur.*
*Nəsazə, fəhşü əza, qeybətü böhtan görürəm…*[198]

Şeirdə Nasehin dinə, şəriət qaydalarına, onun ehkamlarına əməl edilməsinə müsbət münasibəti görünür.

Təəssüf ki, «Beytüs-Səfa» ədəbi məclisinin üzvü, böyük Sabirin və Səhhətin həmməsləki Nasehin ədəbi irsindən bu gün əlimizdə çox az nümunə vardır.

## Molla Mahmud Zöv'i

«Beytüs-Səfa»nın bütün üzvləri kimi Molla Məhəmməd Zöv'i haqqında da ilk məlumata S.Əzimin «Təzkirə»sində rast gəlirik. Burada da qeyd edildiyinə görə, Zöv'i 1843-cü ildə Şirvanda anadan olmuşdur. S.Əzim sonra qeyd edir ki, ta bu günlərdə 25 sinninə qədəm basmışdır. Müəllifin bu son qeydindən onun təzkirəsini yazdığı ilini də təxmin etmək mümkün olur ki, bu da hesablandıqda 1867-ci ilə təsadüf edir (əlbəttə, S.Əzim təzkirəsini bir neçə ilə yazmışdır).

Təlim-tərbiyəsini Şamaxıda alan Mahmud bütün tələbələr içərisində fərqlənmişdir. O, fars və ərəb dillərini mükəmməl öyrənmiş, hətta Azərbaycan və fars dillərindən əlavə, ərəb dilində də şeirlər yazmışdır[*].

S.Əzimin yazdığına görə, Zöv'inin xəttatlıqda da xüsusi məharəti olmuşdur. Təzkirə müəllifi onun nəstəliq xəttini Mir İmada, nəsx və təliq xəttini isə Rəşid və Yaquta bərabər tutmuşdur[199]. Bu fakt Azərbaycanda xəttatlığın inkişafı tarixini öyrənmək nöqteyi nəzərindən maraqlı olsa da, təəssüflə demək lazımdır ki, S.Əzim kimi müqtədir bir şairin yüksək qiymətləndirdiyi Molla Mahmud Zöv'inin xəttindən əlimizdə

---

[198] F.Köçərli. Materiallar. II c. I hissə. s. 143.

[*] Qarayev N. Molla Mahmud Zui və onun divanı // Əlyazmalar xəzinəsində. C.5. – Bakı, 1979, s. 39-44. **(red. – V.M.)**

[199] ƏYİ, Arx. 5, Q – 3 (29), vər. 82 a.

bir nümunə yoxdur. S.Əzimin təzkirəsində Zöv'inin ədəbi irsindən canan fəraqında şikayət təriqilə Füzulinin «Leyli və Məcnun» əsərinin bəhrində yazılmış bir məsnəvisi və on dörd qəzəli verilmişdir.

Təzkirə yazılarkən Zöv'inin 25 yaşına qədəm qoymasından məlum olur ki, həmin şeirlər şairin gəncliyində qələmə alınmışdır.

Seyid Əzimdən sonra Zöv'i haqqında məlumat verən F.Köçərlinin yazdığından anlaşılır ki, tədqiqatçı öz «Materialları» üçün məlumat toplayarkən Zöv'i həyatda olmuşdur. F.Köçərlinin yazdığına görə, şair bir zaman Ə.Nəbatinin vətəni Xanlıq kəndində məktəbdarlıq edirmiş. Onun nə cür, hansı yolla Muğanın Xanlıq kəndinə getməsi, orada məktəbdarlıq etməsi məlum olmasa da, oradan Ağaəli bəy Nasehə göndərdiyi bir məktubda doğma şəhərini, «Beytüs-Səfa»nı, bir vaxt musiqi ilə keçirdiyi məclisi arzulayaraq yazırdı:

*Xarü xaşakü qarağan Muğandan qutarıb,*
*Gülü gülzari-Şamaxidə gülüstanə gedəm.*
*Qurtarıb səbhəşümar olmaqdan məsciddə,*
*Səhni-meyxanadə nuş etməyə peymanə gedəm.*
*Təngə gəldim bu riyaməslək olan zahiddən,*
*Ey xoş ol bəzmi-Səfa məşrəbi-rindanə gedəm.*
*Zöv'i tək bangi-mövzundan olub asudə,*
*Nəğmeyi-tarü dəfü bərbətü-xoşxanə gedəm*[200].

S.Əzimin M.M.Zöv'iyə xüsusi hörməti var idi. O, Şamdan «Beytüs-Səfa»nın üzvlərinə yazdığı məktubda «naməyə» xitabən

*Zöv'inin ayağından öpüb kəsbi-ziya qıl,*
*izhari-səna qıl*[201].

---

[200] F.Köçərli. Materiallar. II c. I hissə. s. 138.
[201] Seyid Əzim Şirvani. Şeirlər. II c. Bakı, 1950, s. 360.

- deməsi də bunu sübut edir.

Vaxtilə iştirak etdiyi «Beytüs-Səfa»nı, oturub-durduğu əhli-dilləri, keçirdiyi eyş-işrətli günləri xatırlayan şair şeirlərinin birində deyir:

*Xoş ol ki, meykədədə aşiyanımız var idi,*
*Müdam qülqüli-meydən təranəmiz var idi.*
*Edəndə məscidə dəvət bizi müəzzinlər,*
*Suali rəddinə yüz min bəhanəmiz var idi,*
*...Əgərçi olmuşuq indi əsiri-qeydi-əyal,*
*Deyildi böylə, bizim də zəmanəmiz var idi*[202]*.*

Zöv'inin dünyagörüşünü təyin etmək üçün «Bilmədim» rədifli şeiri xüsusilə maraqlıdır. Bu şeirdə o, dünyada, təbiətdə olan bəzi hadisələrin səbəbini axtarır. Gözəlin hüsnünün cazibəli olması, badədəki nəşənin səbəbi, yuxuda görünən bir əhvalatın ancaq yuxuda ikən həqiqət olması kimi sirlərin dərk edilməsi şairi düşündürür. O, bunların səbəbini bilmək istəyir. Dünyanı dərk etməyə çalışan şair «göz görməyən cəvahiri necə dərk edim» deyərək, özü-özünə verdiyi sualların cavabında aciz qalır. Hətta o nədən yaranmış və öləndən sonra necə olacağını, başqa sözlə desək, həyatın əvvəli və sonunu bilməyə can atır. Bütün bu fəlsəfi fikirlər şairi rahat buraxmayır.

*Bimərifət qənidi, fəqr əhli-mərifət,*
*Fəqrü qina nədəndi bu dünyadə, bilmədim.*

*Xab içrə hər nə görsə yəqindir oyanmamış,*
*Nə sirr var bu aləmi-röyadə, bilmədim.*

---

[202] F.Köçərli. Materiallar. II c. I hissə. s. 137.

*Nə gəldiyim məqamımı, nə getdiyim yerim,*
*Gəlmək, bu getməyə nə var ortadə, bilmədim*[203].

Zöv'inin ədəbi irsi bütünlüklə əldə edilməmişdir. Şairin bizə çatan qəzəllərinin məzmununu vəfasız yarından şikayət edən aşiqin giley-güzarı təşkil edir.

Ömrünün müəyyən hissəsini müdərrisliklə keçirən Zöv'i məktəb uşaqları üçün bir neçə mənzum hekayətlər də yazmışdır. Bunlardan «Düzd və qazi» («Oğru və qazi») və «Nəsihəti-Loğman» kitabçaları 1913-cü ildə Tiflisdə Şərq mətbəəsində Mirzə Müzəffər Əfəndizadə tərəfindən nəşr edilmişdir.

F.Köçərlinin yazdığına görə, onda Zöv'inin çox qəzəlləri olmuşdur. Hər halda bu maraqlı şəxsin bütün əsərlərindən xəbərdar olmadan onun haqqında tam fikir söyləmək mümkün deyildir.

## Məhəmməd Səfa

Seyid Əzimin yaxın dostu, «Beytüs-Səfa» ədəbi məclisinin gənc üzvlərindən olan Məhəmməd Məşədi Hüseyn oğlu Səfa 1851-ci ildə Şamaxıda anadan olmuşdur. O, təhsilini mollaxanada almışdır. Şeirə çox erkən həvəs göstərməyinə baxmayaraq, Səfa o qədər də məhsuldar və həmməclislərindən fərqlənən şair olmamışdır. Lakin arifanə söhbətləri çox xoşlaması və S.Əzimin rəğbətini qazandığı üçün «Beytüs-Səfa» şairləri onun evinə toplanırdılar. Simaca gözəl, xasiyyətcə isə çox tündməcaz olan Səfa həmməclislərinin sevimlisi idi. Onun vaxtsız ölümünə də bu xasiyyəti səbəb olmuşdur. Belə ki, Şamaxıda Hüseyn adlı bir nəfərlə onun arasında mübahisə baş vermiş, bu zaman çox güman ki, Səfanın tünd xasiyyəti adi

[203] Yenə orada, s. 136.

mübahisəni ədavətə gətirib çıxarmışdır. Sonra da həmin şəxs 1876-cı ildə gecə Səfanın evinə gələrək onu bayıra çağırmışdır. Səfa evdən bayıra çıxan kimi Hüseyn xaincəsinə onu vurub öldürmüşdür.

Seyid Əzim onun vəfatı münasibətilə aşağıdakı beyti demişdir:

صفا برفت دیگر جام عشرتم بشکست
مگربرای من ای پیر بددعا کردی؟[204]

*(İşrətimin camı sındı öləndə Səfa,*
*Etmiş idin məgər, ey pir, mənə bəd-dua?)*

Səfanın həcv deməkdə xüsusi səriştəsi var imiş, hətta öz evində cəm olan və üzvü olduğu «Beytüs-Səfa» şairlərini də həcv etməkdən çəkinməzmiş. O, hətta məclisin rəhbəri S.Əzimi də həcv etmişdir. Qafil Səfayayazdığı bir şeirində ona təhmətamiz şəkildə deyir.

*Axiri həcv elədin Seyyid ilə Qafili sən*
*Ki, bu həcvinlə olar şöhreyi-Şirvan olsun.*
*Seyyidi həcv elədin, sən bilisən, həm Seyyid,*
*Mən nə etdim ki, mənim adıma hədyan olsun[205]?*

F.Köçərli öz «Materiallar»ında Səfanın ancaq Füzulinin «Olmaz» rədifli qəzəlinə nəzirə olaraq yazdığı

*Bu ahu gözlülər dünyada hər səyyadə ram olmaz,*
*Və gər xud olsa da, kami-dili-aşiq təmam olmaz[206].*

---

[204] F.Köçərli. Materiallar. II c. I hissə. s. 135.
[205] ƏYİ, B – 132, vər. 166 a.
[206] F.Köçərli. Materiallar. II c. I hissə. s. 135.

mətləli qəzəlini vermişdir. Görkəmli tədqiqatçının yazdığına görə, Səfanın şeirləri özündən sonra itib-batmışdır.

«Beytüs-Səfa» ədəbi məclisinin qalan üzvlərindən Mirzə Ələkbər Qafil, Qafar Rağib, Ağababa Zühuri və başqaları istər məclisin gedişində, istərsə də ədəbi yaradıcılıqlarında mühüm bir mövqe tutmadıqları üçün onlardan xüsusi və ayrıca bəhs etməyi burada məqsədə müvafiq bilmədik.

## VI Fəsil

## «MƏCLİSİ-ÜNS»

XIX əsrin ikinci yarısında təşkil edilən ədəbi məclislər içərisində həm iştirakçılarının sayına, həm də başqa ədəbi məclislərlə əlaqələrinə görə “Məclisi-üns» xüsusi yer tutur. Bu məclisin səsi-sədası nəinki Azərbaycan rayonlarına, hətta Tiflis, İrəvan, Təbriz, Tehran, Aşqabad və başqa şəhərlərə belə yayılmışdı.

“Məclisi-üns» Şamaxı və Lənkəran ədəbi məclislərinin qızğın fəaliyyət göstərdiyi bir zamanda şair, müğənni və sənət-karlar beşiyi olan Şuşa şəhərində təşkil edilmişdir.

XIX əsrin birinci yarısnda Şuşada və Qarabağın kəndlərin-də onlarca şair yazıb yaradırdı. Bu zaman Qasım Bəy Zakir, Məhəmməd bəy Aşiq, Cəfərquluxan Nəva (Arif), Mirzə Əsəd, Aşıq Pəri kimi şairlər bir yerə toplaşar, qızğın müşairələr, deyişmələr keçirərdilər. Bunlardan başqa, Şuşada yeni ədəbi qüvvələr də yetişməkdə idi. Yaşlı və cavan Qarabağ şairlərinin mənəvi ehtiyacı və poeziyaya rəğbətinin artmasından irəli gələn zərurət nəticəsində başqa şəhərlərdə olduğu kimi burada da şairlər məclisi yaranması fikri doğdu. Bu zaman Şuşada alim və müdərris kimi şöhrət qazanmış Mirzə Əbdülqasımın yanında təhsil alanların içərisində çoxlu şair və şeir həvəskarları var idi. Onlar dərs zamanı və yaxud məşğələdən sonra bir yerə toplaşıb ədəbi mübahisə və arifanə söhbətlər aparırdılar. Bu mübahisələrə getdikcə daha çox iştirakçı toplandığı və müntəzəm şəkil aldığı üçün onun məşğələlərini kənar yerə və xüsusi təyin olunmuş bir vaxtda keçirmək zərurəti meydana gəldi. Belə yer ilk dəfə şair Hacı Abbas Agəhin mənzilinin üst mərtəbəsi seçilir. Mirzə Rəhim Fəna yazır ki, mən belə bir yer üçün Hacı Abbas Agəhə müraciət

etdim. O da evini nişan verdi[207]. 1864-cü ildən etibarən Agəhin evinə toplaşan gənclər şeirdən, ədəbiyyatdan bəhs açar, tarix və musiqi haqqında mübahisə və müzakirələr keçirərdilər. Bu kiçik məclisə toplaşan və şeir-sənətə xüsusi maraq göstərən Fəna, Agəh, Novrəs, Məmai və başqaları özləri də şeirlər yazır, yazdıqlarını oxuyub bir-birlərinin rəylərini öyrənirdilər. 1864-cü ildən 1872-ci ilə kimi adsız olan bu məclis həmin ildə Xurşidbanu Natəvanın evinə köçür[208].

Mirzə Rəhim Fənanın atası Mirzə Məmmədbaqi Qarabağ xanlığının dərbar münşisi kimi Natəvanın xanlıq mülkünü idarə edir, onun hesabat işlərini aparırdı. 1872-ci ildə o vəfat etdikdən sonra Natəvan bu işi gənc və bacarıqlı Mirzə Rəhim Fənaya həvalə edir. Beləliklə, Fəna Natəvanın ailəsinə yaxınlaşmış olur. Vaxtının çoxunu Natəvanın sarayında keçirən Fəna, nəhayət ora köçür. Natəvanın şairlik qabiliyyəti, şeir-sənətə olan marağı, Həm də Fənanın onun sarayında yaşaması şairlər məclisinin Agəhin mənzilindən Natəvanın sarayına keçməsinə səbəb olur.

Az bir müddətdə orada iştirak edənlərin sayı da çoxalır. Əksər vaxt M.R.Fənanın yanında olan İsgəndər bəy Rüstəmbəyov, Xudadad bəy, Natəvanın böyük oğlu gənc Mehdiqulu xan Vəfa və başqaları tez-tez məclisdə iştirak edirdilər. O zaman Şuşanın ariflərindən hesab edilən Əbdülkərəm bəy Haqverdiyev, Mehdi bəy Sarıcallı, Talıb bəy Vəzirov, Mirzə Kərim bəy Nəsirbəyov, Abbas bəy Pəri oğlu, Mirzə Həsən bəy Hacıyev və qeyriləri həmin məclisə gələr, öz şeirlərini oxuyar, gənclərlə mübahisəyə girişərdilər.

---

[207] ƏYİ, arx. 14, Q – 1(3), 7068 (M. Fənanın arxivi).

[208] Mirzə Cəfərin "Təzkireyi-Nəvvab"ın avtoqraf nüsxəsində (ƏYİ, M – 67, vər. 403 a) öz əliylə yazdığı qeydindən görünür ki, "Məclisi-üns"ün toplanışları heç də həmişə Natəvanın mənzilində keçirilməyirdi. Əvvəllər olduğu kimi, belə yığıncaqlar hərdən yenə də Hacı Abbas Agəhin evində olurdu. Mirzə Cəfər yazır: "Müşairə Molla Əbdürrəzzaq Lahicaninin dediyinin müqabilində Hacı Abbasın mənzilində, yəni "Məhfili-üns"də deyilib (N.Q).

Şuşada arifanə və məzəli söhbətləri sevən şəxslər də tez-tez bir yerə toplaşaraq şirin söhbətlər edər, zərif lətifələr söyləyirdilər. Ədəbi məclislərdə müşairə zamanı bədii söz ustalığına xüsusi diqqət verilirdisə, lətifələr söyləməkdə hazırcavablıq, itifikirlilik məharət sayılırdı. Mayor Əbdürrəhim bəy, Səfi bəy, Alı yüzbaşı, Dəli Xudu bəy, Kəblə Şirin və başqaları məzəli əhvalatlar, duzlu lətifələr söyləyənlərdən hesab edilirdilər. Onlar lətifələrin çoxunu özləri yaradır, yaxud adi bir əhvalatı ustalıqla lətifə xarakterinə salırdılar. Adi söhbət zamanı ustalıqla söylənən aforizmlər və yaxud bir suala məharətlə verilən mənalı cavablar, duzlu lətifələr getdikcə yayılır, bəzən zərbiməsəl kimi xalqın şifahi malına çevrilirdi.

Şuşada şairlər məclisi belə yığıncaqlardan fərqlənirdi. Xüsusilə onun toplanışları müntəzəm xarakter aldıqdan sonra məclisin məşğələlərində bir ciddilik yaranmağa başlayır. Klassik Şərq və Azərbaycan ədəbiyyatının öyrənilməsi, musiqi, hikmət, nücum, tarixə aid söhbətlər məşğələlərin əsas məzmununu təşkil edirdi. Məclisə toplaşanlar hətta ona müəyyən ad qoymağı qərara alırdılar. Şairlər orada iştirak edənlərin dostluq və səmimi ünsiyyətlərinə müvafiq olaraq onu “Məclisi-üns» və ya «Məhfili-üns» (Ünsiyyət, dostluq məclisi») adlandırırlar. Məclisin təşkilatçı və təşəbbüskarlarından biri olan Mirzə Rəhim Fənanın AMEA Əlyazmalar İnstitutunda saxlanan arxivində onun “Məclisi-üns» haqqında bir avtoqraf xatirəsi vardır. Həmin xatirə indiyə kimi bütünlüklə heç bir yerdə dərc edilmədiyindən onu eynilə aşağıda verməyi məqsədə uyğun bildik:

“Məclisi-üns» - bu ismilə müsəmmi Qarabağ şüərasının məcməi təfsili-zill üzrə mövcudiyyət bulmuş: Şuşa qələsindən raqim tədris etdiyi mədrəseyi-islami üç sinifli vasiteyi-müsəlmani və rusi təlim olunurdu. 1862-ci tarixdə bərhəm olduğuna görə şagirdlər pərakəndə oldular. Raqim-i məzkur mədrəsədə türk və fars dillərində sahib-i rüşd olduğuna mədrəsə moquf olandan sonra fəzil, mütəbəhhir mərhum Mirzə

Əbülqasım Qazi hüzurunda təhsili-ədəbiyyati-ərəbi və tədrisi-təsnifati-müşkileyi-farsiyyə və sair müvazib olar. Və neçə nəfər həmdərslər ilə müttəfiqən ta 1866-cı ilin axırınadək o cənabın xidmətində hər kəs öz istedadınca neməti-istifadə bular. Zəmani-tədris müzakireyi-dərsi-ədəbi kənar bir mərhələ lazım olduğuna raqim öz yavuq əqvamından mərhum Hacı Abbas Məhərrəm oğluna müraciət edər və o mərhum püştibazarə müttəsil mülkündə fövqani mərtəbədə bir otaq nişan verər.

Raqim həmdərsləri ilə dərs kitabları və sair hər qism kitab o nöqteyə cəm edərlər. Parə vəqt müzakireyi-dərs və pareyi-söhbəti-əşarü tarix və məqulatilə keçir, ta 1864-cü tarixədək. Bu sənədən zövqi-şeir inşa etmək həvəsi dəxi zahir olar. Məsləki-şeirdə həmsöhbət Hacı Abbas mərhum Agəh təxəllüs, Mirzə Ələsgər Növrəs və raqimin təxəllüsü Aşiq olur, zövqi-şeirguluqda cavan Məmo bəy Məmayi təxəllüs dəxi o zamanlar həvəsnak olur. Çünki əqrabalıq möcibincə həmevəqt dairədə bulunurdı. Raqim, məzkur həmdərslər şerdust müsahibələr ilə 1866-cı ilədək. Rus dili fəramuş olmamaqdan ötrü o sənədən ta 1872-ci ilədək hökümət xidmətində iştiğal bular. Əz qəza bu ildə pədəri-bozorgvari ki, ülya mükərrəmeyi-qızının cəmi mülk və məaş əməlini idarə edərdi, vəfat edər və o mərhumə bu mühüm və ümdeyi-əməli idarə etməyə raqimi münasib gördüyünə məhəlli-hökumətdən onu cəlb edər. Bu məqamda lazımdır yadavər olmaq ki, xan qızının fərzəndi-əzizi Mehdiqulu xan sani nabaliği-söhbəti-şeir savaddust olduğuna necə ki, sabiqən həmçinin o astanədə iştiğal bulduğu halda əksər övqat raqim ilə həmcəlis və munis olardı. Öz həmsöhbəti pir Mirzə Sadıq İmanxan oğlunun mabeynində o əsrin şeir avazəsindən xoşdil olub həvəsi-şeirguluqda bulunan müsahiblər cümləsində var idilər: cavan İsgəndər bəy Əsədbəy oğlu, Xudadad bəy Fuladov və sairin. Bu nəhv ilə məsələyi-şeir xalq arasında bir ihəyəcan və məbusi-məcalisə müsahibə peyda etdi.

Arifini-əyani-vilayət mərhum Əbdülkərim bəy Haqverdiyev, Mehdi bəy Sarıcallı, Talıb bəy Vəzirov, Mirzə Kərim bəy Nəsirbəyov, Abbas bəy Pəri oğlu, Mirzə Həsən bəy Hacıyev və sairin şüəra məcmuunu əyadət edirdilər. Övza bu şəkli tutduqda əczayi-həman dairə istedadi-şairlikdən ənbüsati-xatir bulub öz məcmələrini bir ad ilə təsmiyyə etməyi lazım gördülər və onu "Məclisi-üns» adilə müsəmmi etdilər.

Həman övqat Qarabağda hazırda olan şüərayi-namdar bunlar idi: Mirzə Əbdül Şəhid, Mirzə Hüseyn Salar, İbrahim bəy Azər, qardaşı Abdulla bəy Asi, Mirzə Məhəmməd Katib, Mirzə İsmayıl Sərrac, Dizaq mahalından Mirzə Mehdi və sairin. Bu zaman Ağahəsən Yüzbaşov dəxi əhli-"Məclisi-üns» cərgəsinə daxil olur. Ondan sonra şüərayi-məclis çoxaldı. Əsamiyi-əczayi-"Məclisi-üns» təqəddüm və ta axir riayətilə zillən zikr olunacaqdır.

"Məclisi-üns»ə müqabil məscid hövzəsində bir məclisi-şüəra dəxi tərtib tapdı. Nəvvab Mir Möhsün ağa, Xan Qaradaği, Məşədi Əyyub Baki, məclisə daxil olmuş və son zamanlar şüəra ağa Mirzə Cəlal, Səməd bəy, Bəhram bəy Vəzirovlar, Mirzə Əbdül Şahin, Həsən Qara Hadi, Mirzə İbrahim Tahir, Mirzə Fatı xanım Kəminə.

"Məclisi-üns» sədası Qafqaziyə şəhərlərində iştihar tapdığına ən əvvəl şüərayi-Şirvan cənab Hacı Seyid Əzim, Bixud, Səfa, Zühuri qəzəllər yazıb, təhniyyət izhar qıldılar. Əczayi – "Məclisi-üns» şeirlə cavabi-dustanə əda etdilər. Şəkidən İsmayıl bəy Sədrəddinbəyov raqim adına şeir yazdı, cavab aldı. Naxçıvandan mərhum Sidqi izhari-məhəbbət etdilər. İbtidai-kəlamda zikr olunası bir əhəmmi-mətləbdən əgərçi qələm uzaq düşdü, nəhayət xatimeyi-bəyanda tərqim tapası vaqiə onunla mərbut və bəlkə mütəmməm haman məna olduğuna əvvəl qərəzimiz olan əmr öhdeyi-təxirə düşmüyübdür.

İbtidadə deyiləsi mətləb ibarətdir ondan ki, raqim həme vəqt, yəni Mehdiqulunun on-on iki yaşında olan zamandan

onunla munis və həmcəlis olduğuna xani-cəvan raqimin hamiyi-təflisi-halatından və şeirə mayil olduğundan baxəbər idi və məsləki-şeirü ürfan xatirinə nişəst etdikdə əvvəl raqimdən xahiş etdilər ki, öz təxəllüsünü ki, «Aşiq» idi, bir özgə ismilə əvəz edib və onun üçün dəxi bir təxəllüs zikr etsin. Odur ki, xani-cəvan üçün Vəfa və raqim üçün Fəna təsəvvür olunub Mirzə Sadıq Piranın təsvibilə şərəfi-qəbula yetdi.

Zaman keçdikcə mərhum xan "Məclisi-üns» əhlinə iltifat göstərməyə illət etdi. Valideyi-möhtərəməsinin dəxi şeir aləminə meyil və şövq yetirməyinə əksər övqat xasi - "Məclisi-üns» şam və nahar sərf etmək üçün hüzura dəvət olunardılar və söhbəti-maarifdən məhzuz olardılar. Bu qism halatın təsiri təhtində və raqim daimülhüzur olduğu səbəbə o mərhumənin xatirində xəyalati-şeir cilvə etdiyinə bəzi öz qəlbi zəxmlərinə işarə etmək qəsdilə raqimdən özü üçün təxəllüs xahiş edər. Və çox vəqtlər məzacən nasaz olduğuna münasib «Natəvan» kəlməsini təxəllüs qəbul edər. Mərqum cərəyan təhti-təsirində zaman getdikcə Qarabağda digər şairlər dəxi zühur etdilər. "Məclisi-üns» əczasının əşarını təqdir etmək mütaliə əhlinin öz istedadına rücu olunur. Əsamiyi-əczayi – "Məclisi-üns» be qərari-zill: Hacı Abbas Agəh, Mirzə Ələsgər Növrəs[*], Məmo bəy Məmayi, Ağa Həsən Yüzbaşov, Məhəmmədəli bəy Məxfi, İsmayıl bəy Daruğə, Mirzə Cəfər Köhnəfüruş, Mirzə Sadıq İmanxan oğlu, Fəna (qarimi-hüruf) Mirzə Rəhim.

Məzkur əsrdə təsiri-gərdişi-kövkəb və etidali-«məvvadi-ünsüriyyə» nə qüvvətilə hissiyyat və təxəyyülati-nasə təsirbəxş olduğunu və xəlayiqin kəmalat tərəfinə meyli-vafir yetirdiyindən (pozulub – N.Q.) ruhani onların nəfsində heycanə gəldiyindən təsəvvür etmək olar. Bu mətləbin təfsilini özgə məqamda zikr etməyi təəhhüd ediriz. Ər-raqim Mirzə Rəhim Fəna. 20 oktyabr, 1925[209]».

---

[*] Bax: Mirzə Ələsgər Növrəs / tərt. Ş.Cəmşidov, N.Növrəsli. Bakı, 1985, 158 s. **(red. – V.M.)**

[209] ƏYİ, Arx. 14, Q – 1 (3).

“Məclisi-üns»ün fəaliyyəti müntəzəm şəkil aldıqca və üzvlərinin sayı çoxaldıqca onun sədası Şamaxı, Şəki, Bakı, Naxçıvan, Lənkəran, Gəncə və digər şəhərlərə yayılır. Şamaxıdan S.Əzim, M.A.Bixud, A.Zühuri, Şəkidən İ.Nakam*, Bakıdan A.Müniri, Naxçıvandan M.T.Sidqi, Lənkərandan M.İ.Qasir, Şuşaya – “Məclisi-üns» ün adına məktub yazıb bu yeni ədəbi məclisi təqdir və təbrik edirlər.

Fənanın xatiratından göründüyü kimi, şairlik təbi, həvəsi və istedadı onlara təxəllüs seçilərkən hər bir şəxsin fərdi xüsusiyyətləri, təbiəti, təbinin səciyyəsi də nəzərə alınırmış. Şairliyə başlayan şəxs təxəllüsü təkbaşına yox, müəyyən yoldaşları ilə məsləhətləşib seçər və onu bir nəfər ağsaqqal şairin qarşısında təntənəli surətdə qəbul edərmişlər. Məclis təşkil olunana qədər «Aşiq» təxəllüsü ilə yazan Mirzə Rəhim öz təxəllüsünü dəyişib «Fəna» qoyur. Mirzə Rəhim Fəna tərəfindən Xurşidbanuya «Natəvan» və onun oğlu Mehdiquluya «Vəfa» təxəllüsü seçildikdə onları qocaman şair Mirzə Sadıq Piran təsdiq etmişdir.

Mirzə Rəhim Fəna xatiratında “Məclisi-üns»ün doqquz nəfər üzvünün adını çəkmişdir. Lakin bizim tədqiqatımıza görə onun əsas üzvləri aşağıdakılardan ibarətdir: Xurşidbanu Natəvan (1832-1897), Mirzə Rəhim Fəna** (1841-1931), Mirzə Ələsgər Növrəs (1836-1912), Mirzə Həsən Yüzbaşov (1824-1904), Məmo bəy Məmai (1842-1918), Hacı Abbas Agəh (? -1892), Məhəmmədəli bəy Məxfi (1821-1892), İsmayıl bəy Daruğə (1842-1891), Məşədi Nəsir Lövhi (? -1891), Mirzə Sadıq Piran İmamxan oğlu (1811-1892), Hüseyn ağa Cavanşir (1856-?), Bəhram bəy Fədai, Mirzə Haqverdi Səfa (?-1881), Məhəmməd ağa Müştəri (1875-1956), Mahmud bəy

---

* Nakam İsmayılbəy. Məcnun və Leyli. Nəşrə hazır.: Y.Piriyev. Bakı, Nurlan, 2007, 190 s. **(red. – V.M.)**

** Mirzə Rəhim Fəna. Tarixi-cədidi-Qarabağ. – Qarabağnamələr. II kitab. Bakı, Yazıçı, 1991, s. 247-268. **(red. – V.M.)**

Mahmud, Mirzə Cəfər (Köhnəfürüş, 1839-1903), Səməd bəy Səməd, İsgəndər bəy Rüstəmbəyov (1845-1918) və başqaları.

F.Qasımzadənin göstərdiyi kimi, «Təzkireyi-Nəvvab» və «Riyazül-aşiqin»də adları çəkilən şairlərin çoxu "Məclisi-üns» və ya "Məclisi-fəramuşan»ın üzvləri olmuşlar[210]. Getdikcə "Məclisi-üns»ə yeni-yeni şairlər gəlsə də, bunların, əlbəttə, hamısı eyni dərəcədə fəaliyyət göstərmirdilər. "Məclisi-üns» üzvlərinin tərtib etdikləri cünglərdə və qeyri əlyazmalarında olan müşairələrdən görünür ki, Natəvan, Agəh, Növrəs, Həsən, Məmai, Mirzə Sadıq Piran, M.H.Səfa, İ.Rüstəmbəyov məclisin əsas nümayəndələri olmuşlar.

Məclis şairlərinin şeirlərində deyildiyi kimi, «kibr, riya və qürurdan uzaq», dostluq, sədaqət, alicənablıq və humanizm ruhunda ünsiyyət etmək "Məclisi-üns»ün səciyyəvi xüsusiyyəti olmuşdur.

Şairlərin, xanəndələrin və qeyri ariflərin iştirak etdiyi "Məclisi-üns»də ciddi qanun var idi. 1891-ci ildə "Məclisi-üns»ün yığıncaqlarından birində o zaman Tiflisdə qulluq edən Mehdiqulu xan Vəfa da iştirak etmişdir. Abbas bəy Vəzirov sərxoş halda buraya gəlmiş, məclisdə xoşagəlməyən sözlər danışmışdır. Yoldaşları onu məzəmmət etdikdə M.Vəfa bu məsələyə xüsusi şeir həsr edib demişdir:

"چند بار گفتم، ای عباس، مرداری مکن،
هر چه خواهی کن در این مجلس، دلازاری مکن!...
باده خور چندان که خواهی، بخور چندان که هست،
لیك بدمستی و بد گفتاری و بدکاری مکن!

گر ترا راه باشد اندر مجلس انس صفا،
قدر خود بشناس، بی قدری و بی عاری مکن!..."[211]

---

[210] Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 1956, s. 7.
[211] ЯЙИ, Б-236, вяр. 44а.

*(Neçə dəfə demişəm ki, ey Abbas, murdarlıq etmə,*
*Bu məclisdə nə edirsən et, ürəkləri incitmə!...*
*Nə qədər istəyirsən, nə qədər ki var, badə iç,*
*Amma bədməstlik etmə, pis söz demə, bəd əməl törətmə!*
*Əgər sənin bu səfalı "Məclisi-üns»ə yolun düşübsə,*
*Öz qədrini bil, qədirsizlik və arsızlıq etmə!...).*

"Məclisi-üns»də "Məclisi-fəramuşan»ın üzvlərindən də iştirak edəni olurdu. Bir dəfə "Məclisi-üns» ün üzvləri Növrəsi Fatma xanım Kəminənin xidmətinə göndərərək onu məclislərinə dəvət edirlər. Növrəs Kəminənin hüzurunda namünasib söz dediyi üçün şairə incimiş və M.Məmaini yanına çağırıb şikayətlənmişdir[212]. Məmai də bu münasibətlə Növrəsə farsca bir şeir yazmışdır. "Məclisi-üns»ü xarakterizə edən Məmai şeirində yazır ki, "Məclisi-üns» bizim ali məclisimizdir. Hamıya hörmət göstərmək bizim borcumuzdur. Bura əhli-dil məskənidir. Korlar buraya gələ bilməzlər. Qafillərin bu məclisə yolu yoxdur.

Başqa bir misal, bir dəfə H.A.Agəh və M.R.Fəna "Məclisi-üns»də nə danışmışlarsa, Natəvana xoş gəlməmişdir. Onların hərəkətini tənqid edən Həsən Yüzbaşov "Məclisi-üns»ü belə səciyyələndirirdi:

*...Bu bəzmi-nişatü eyşi-ali,*
*Kim, gəlməz ona kədər xəyali.*
*Əlbəttə, rəva deyil ki, bir dəm,*
*Əfsanə söz ilə ola bərhəm.*
*Lazımdı bu bəzmə nəzmü əşar,*
*Əzbəs ki, o dürrə var xiridar...*

*Bu bəzm ki, zövqdür sərapa,*
*Yox munda qəmü küdurət əsla.*
*Lazımdı bu bəzmi-eyşə layiq,*

---

[212] ƏYİ, B – 1478, Əlyazma pərakəndə haldadır, səhifələnməmişdir.

*Bu bəzmi-nişatə həm müvafiq,*
*Əşar oxuna müvafiqi-hal,*
*Xoşnud ola ol xocəstə əhval...*[213]

Yuxarıdakı misallardan aydın olur ki, “Məclisi-üns» də ciddi qayda-qanun, ədəb-ərkan gözlənilməsinə, nizam-intizama riayət olunmasına xüsusi diqqət yetirilirdi.

Bütün bunlar göstərir ki, Şuşada hər iki məclisin qabaqcıl, mədəni üzvləri sənətkar, gözüaçıq qadınlara yüksək qiymət vermişlər. Heç də təsadüfi deyildir ki, məhz qabaqcıl fikirli məclis üzvlərinin yaxından köməyi sayəsində Şuşada olan hər iki məclisdə Natəvan və Kəminə kimi şairələr yaxından iştirak etmiş və bütün Azərbaycan şairləri arasında xüsusi hörmət qazanmışlar.

Hətta bu dövrdə hər iki şairənin köməyi ilə qadınlar arasında şeirə, ədəbiyyata xüsusi maraq yaranmağa başlamışdı ki, bu işdə Natəvanın xüsusi rolunu qeyd etmək lazımdır. Məsələn: Ü.Hacıbəyovun anası Şirinxanım Əliverdibəyovanın musiqiyə, şeirə, ədəbiyyata meyil və maraq göstərməsində Natəvanın xüsusi köməyi olmuşdur.

“Məclisi-üns»ün rəhbərliyi Natəvanın ixtiyarına keçməsi onun iştirakçılarının sayının artmasına səbəb olduğu kimi, şairənin məclisi vaxtı-vaxtında maddi cəhətdən təmin etməsi, müşairələrdə iştirakı həm məclisin, həm də şairənin nüfuzunu daha da artırmışdı.

Ə.Müznib doğru olaraq göstərir ki, Aşıq Pərinin şeri və ədəbiyyat aləmində oynadığı rolu XIX əsrin ikinci yarısında Natəvan oynamışdır[214]. Natəvanın Qarabağ şairləri arasında bu qədər nüfuz qazanmasının səbəbi, Ə.Müznibin dediyi kimi, bir tərəfdən onun xan ailəsinə mənsub olması idisə, digər tərəfdən isə müstəsna istedad və qabiliyyəti, hazırcavablığı, səxavət və

---

[213] Həsən Qarabaği Yüzbaşov. Divan. Avtoqraf. vər. 140 a. (Həsən Qarabağinin bu divanı şairin oğlu Qasım Yüzbaşovun şəxsi arxivindədir.

[214] ƏYİ, C – 218, s. 50.

ictimai işlərdə xalqa çox yaxından köməklik göstərməsi olmuşdur.

“Məclisi-üns» şairlərinin əsərlərindən belə qənaətə gəlmək olur ki, onlar Natəvanın rəsmlərinə şeirlər yazdıqları kimi, aşiqanə qəzəllərinin bir hissəsini üstüörtülü olsa da bu gözəl qadına həsr etmişlər. Natəvan müasiri olduğu Şuşa şairləri üçün bir ilham mənbəyi idi.

Məlum olduğu kimi, xəstəliyi ilə əlaqədar olaraq Natəvan tez-tez Bakı, Tiflis və başqa şəhərlərə müalicəyə getməyə məcbur olmuşdu. Bu zaman məclis bir növ başsız qalır, onun üzvləri isə özlərini kimsəsiz hesab edirdilər. Bunu Məmai, Həsən, Agəh, Növrəs, İsgəndər bəy və başqalarının şeirlərindən daha aydın görmək olur. Şairəyə bir bədbəxtlik üz verdikdə məclis üzvlərinin hər biri ürək dağlayan şeirlər yazıb, şairənin dərdinə ortaq olur, belə qəmli günlərdə ona ürəkdirək, təsəlli verirdilər. Yeri gəlmişkən onu da qeyd etmək lazımdır ki, belə mənəvi yardımların heç biri şairənin acı həyatını və sarsılmış ruhunu sakit edə bilməmişdir. Odur ki, Natəvanın əksər şeirlərində ağır bir kədər, iztirab içərisində çırpınan bir ürəyin məhzun fəryadı eşidilməkdədir.

Natəvan bir yana getməyə hazırlaşdıqda Məmai, Həsən, Növrəs və başqaları xüsusi şeirlər yazıb şairəyə olan dərin hörmətlərini səmimi ürək sözləri ilə izhar edərdilər. Yuxarıda adları çəkilən şairlərin «Getmə», «Sənsiz» və başqa şeirləri məhz bu münasibətdən yazılmışdır. “Məclisi-üns» şairlərinin çoxu Natəvana bu və ya başqa münasibətlə onlarca qəzəllər, mədhnamələr həsr etmişlər. Bu şeirləri onlar ya Natəvan müalicəyə gedəndə, ya da müalicədən qayıdıb, “Məclisi-üns»ün yığıncaqlarına gələndə yazırdılar. Onu da göstərmək lazımdır ki, bu şeirlərin bəzisi elə oradaca bədahətən deyilirdi.

Bəzən Natəvana həsr edilən şeirlərin yazılma səbəbləri tam dürüst göstərilməyir. Ə.Müznib yazır ki, İ.Rüstəmbəyov Natəvanın «Ölürəm» rədifli qəzəlini görüncə, təsəlli olmaq

üzrə özünün «Ölməyəsən» qəzəlini yazıb ona göndərmişdir[215]. Lakin İ.Rüstəmbəyov özünün tərtib etdiyi cüngündə həmin qəzəlinin əvvəlində farsca yazdığı qeyd bu fikri daha da aydınlaşdırır. O yazır:

"در سال يكهزار و هشتصد و هشتاد و شش سركار خورشيد بانو بيگيم گويا در مفارقت پسر ارشد خود سركار مهدى قلى خان يك غزل گفته بود. آخر و مضمون كلام اين بود كه در جدائى تو ميميرم، يعنى اؤلؤرم. در جواب اين غزل اؤلؤرم، عزيز الوجود ميرزا رحيم فنا تخلص و ميرزا صادق پيران و بسى ديگران خوب غزلها گفته بودند. آخر غزلها اين طور بود كه اؤلمه، يعنى ماه دودمان اؤلمه، ناتوان اؤلمه! اين طور بود. سركار خورشيد بانو بيگيم هر روز مرا تعكيد كرده و شب و روز نوكر فرستاده قسم داد كه بايد فلانى هم در اين باره غزل گويد. هى من هاشا كردم كه من شاعر نيستم و حالت ندارم كه شعر بگويم، ممكن نشد. آخر الامر اين چند افراد را گفته فرستادم. هرچند در ظاهر بى معنى است، لاكن در باطن پر معنى است و بسيار اشاره و كنايه دارد. در تاريخ هزار و هشتصد و هشتاد و شش"[216].

«1886-cı ildə sərkar Xurşidbanu bəyim, deyəsən, öz böyük oğlu sərkar Mehdiqulu xan ayrılığında bir qəzəl demişdi. Qəzəlin məzmunu və axırı bu idi ki, «sənin ayrılığından ölürəm». Bu «Ölürəm» qəzəlinin cavabında əzizül-vücud Mirzə Rəhim Fəna təxəllüs və Mirzə Sadıq Piran və bir çoxları yaxşı qəzəllər dedilər. Qəzəllərin axırı bu cür idi ki, «Ölmə!», yəni «mahi-dudiman, ölmə, Natəvan, ölmə!». Bu cür idi. Sərkar Xurşidbanu bəyim hər gün mənə təkid edirdi və gecə-gündüz nökər göndərib and verirdi ki, gərək filankəs də bu barədə qəzəl desin. Mən hey haşa elədim ki, şair deyiləm, mümkün olmadı. Axırda bu bir neçə fərdi deyib göndərdim. Hərçənd zahirdə mənasız görünür, amma batində məna ilə doludur və çox kinayə və işarələr vardır. 1886».

İsgəndər bəyin qəzəli belə başlanır:

---

[215] ƏYİ, C – 218, s. 52.
[216] ЯЙИ, Б-236, вяр. 79б.

*Xudadan istərəm, ey can, hələ sən ölməyəsən,*
*Be həqqi-şahi-Xorasan, hələ sən ölməyəsən.*

Buradan həm də Natəvanın «Ölürəm» qəzəlinin yazılma səbəbi və tarixi də aydın olduğu üçün İ.Rüstəmbəyovun həmin qeydi xüsusi əhəmiyyət kəsb edir.

Şairənin Şuşadan gedişi məclis üzvlərini nə qədər kədərləndirirdisə, qayıtması və məclisə gəlməsi bir o qədər şadlığa səbəb olurdu. Natəvana həsr edilən hər bir şeir ona olan məhəbbətin səsi və "Məclisi-üns» şairlərinin öz ustadlarına göstərdikləri ehtiram və hörmət nişanəsi idi. Bu şeirlərdə Natəvan təkcə məclis şairlərinin yox, eyni zamanda bütün Şuşa əhlinin iftixarı, zəmanəsinin fəxri kimi səciyyələndirilir. Həsən Qarabağinin şairənin "Məclisi-üns»ə gəlməsi münasibətilə yazdığı bir qəzəlində deyilir:

*Lütf edib "Məclisi-üns»ü çün ağa yad etmiş,*
*Bizi bu yad ilə qəmdən əcəb azad etmiş.*
*"Məclisi-üns» nə müddətdi ki, viranə idi,*
*Şükrilillah kim, onu tazədən abad etmiş.*

Şeirin məzmununda anlaşılır ki, Natəvan uzun müddət müalicə üçün bir yana getdiyindən məclisə gələ bilməMişdir. Lakin o, Şuşadan kənarda olduqda belə, "Məclisi-üns»ü yaddan çıxarmazdı. Məmainin qəzəllərindən birinin əvvəlində belə bir qeyd vardır: «Əliyyə-aliyyə Xurşidbanu bəyim Tiflisdə olan vəqt teleqraf ilə eydi-Novruz mübarəkbad edib «Məhfili-üns»dən əhvalpürsan olan vəqt calisani-üns hər biri qəsideyi-üzürr ilə cavab verib o banuyi-mükərriməni tovsif etmişdir». Mirzə Həsənin farsca yazdığı bir qəzəlindən da şairənin Gürcüstanda olmasından, bayram münasibətilə Şuşaya təbrik teleqramı göndərməsindən bəhs edilir[217].

---

[217] ƏYİ, B – 724, vər. 50 a.

“Məclisi-üns» yalnız şairlərin yox, Şuşa xanəndələrinin də çox sevdikləri yer idi. Hacı Hüsü, Məşədi kişi, Kaştazlı Haşım və başqa xanəndələr “Məclisi-fəramuşan»la yanaşı, onun da yığıncaqlarında iştirak etmişlər[218]. Şuşalı Ağamirov Həsən Mirhaşım oğlunun xatiratından məlum olur ki, yuxarıdakı xanəndələrdən əlavə Molla Vəli, Molla Abbasqulu, Məşədi Dadaş, Hacı Məmməd Alı oğlu, Muxtar Kərbəlayi Məmməd oğlu, Məhəmməd Qaryağdı oğlu, tarzən Sadıq kimi sənətkarlar da “Məclisi-üns»ə çox yaxın olmuşdur[219].

“Məclisi-fəramuşan»da Kəminə olduğu kimi[220], “Məclisi-üns»də də Natəvan musiqi ilə maraqlanmış, onu ürəkdən sevmiş, hətta «musiqidə böyük məharəti olmuşdur[221]».

Natəvan Bakıya gələrkən Şamaxıda məşhur musiqişünas Mahmud ağanın görüşünə getməsi, «bir neçə gün onun qonağı olub, müsahibədə bulunması[222]» da məhz şairənin musiqiyə marağı və həvəsi ilə əlaqədar idi.

“Məclisi-üns»ün üzvləri Novruz bayramlarını xüsusi təntənə ilə qeyd edərdilər. Belə günlərdə onlar bir yerə cəm olar, bayram münasibətilə qəzəllər, bahariyyələr, bayram qəsidələri yazardılar. Bayram məclislərinə musiqi xüsusi şənlik və ruh verirdi. Bir qayda olaraq musiqi məclislərinə başçı seçilər və məclisin gedişinə, qayda-qanuna əməl edilməsinə «padşah» adlandırılan həmin şəxs rəhbərlik edərdi. Mirzə Ələsgər Növrəs də belə başçılardan olmuş[223], “Məclisi-üns»ün yığıncaqlarına musiqi ilə keçdikdə ona rəhbərlik etmişlər.

XIX əsrdə musiqi məclislərinin çoxunun xüsusi başçısı olmuşdur. Mir Möhsün Nəvvab, Mirzə Ələsgər Növrəs (Şuşa), Seyid Əzim (Şamaxı), Kərim ağa Salik (Bakı) belə başçılardan

---

[218] Rahim M. Natəvan // “Vətən uğrunda” curnalı, 1943, N 8-9.
[219] ƏYİ, Y – 200, s. 5.
[220] ƏYİ, B – 5007, s. 256.
[221] ƏYİ, C – 218, s. 7.
[222] ƏYİ, B – 5007, s. 267.
[223] Yenə orada, s. 216.

idilər. Demək, şeir (xüsusilə klassik Şərq poeziyası) musiqinin ayrılmaz bir hissəsi olmuş, şairlər musiqini şeir qədər, musiqiçilər də poeziyanı musiqi qədər sevmişlər.

“Məclisi-üns» digər ədəbi məclislərlə yaxından əlaqə saxlamışdır. H.A.Agəh Şamaxıya gələrək, Seyid Əzimə qonaq olmuş, onunla məktublaşmışdır. Yeri gəlmişkən onu da qeyd etmək lazımdır ki, S.Əzimin Agəhə məktubu[224] onun əsərlərinin heç birinə düşməmişdir.

M.Məmai də bir neçə dəfə Şamaxıya gəlmiş, orada şeir və musiqi məclisində iştirak etmişdir[225].

Şirvan şairlərindən Mirzə Əbdüləli Hilali Şirvani dəfələrlə Şuşaya gələrək, “Məclisi-üns»də iştirak etmişdir. O, Növrəs, Məmai, Həsən, Agəh və digər Qarabağ şairləri ilə xüsusi dostluq etmişdir. Agəh şeirlərindən birində onun Şuşaya gəlişini Yaqubla Yusifin görüşünə bərabər tuturdu[226]. M.Ə.Hilali Şirvani “Məclisi-üns» şairlərinin hər birinin səciyyələndirən şeir yazmış, burada adları çəkilən Məmai, Səməd bəy, Agəh, Məxfi və Növrəs də öz növbəsində ona cavab vermişlər. Onların şeirlərində Hilali Şirvani arif və nüktəşünas kimi səciyyələndirilir, onun sənətkarlığına yüksək qiymət verilirdi.

Mirzə Əbdüləli Hilali şairliklə yanaşı, həm də gözəl səsə malik xanəndə olmuşdur. O hər dəfə “Məclisi-üns»də iştirak edəndə duzlu şeirləri ilə bahəm məlahətli səsi ilə də məclisdəkiləri heyran edərmiş. Hilalinin xoş səsi, xanəndəlik qabiliyyəti musiqi beşiyi olan Şuşa şairlərini çox mütəssir edirdi. Onun avazını Davudun səsindən də artıq hesab edən Agəh yazırdı:

ای قامت موزون تو چون سرو، رخت گل
در نغمه سرایی نبود مثل تو بلبل

---

224 ƏYİ, M – 134, s. 1122, 1124 – 1126.
225 ƏYİ, D – 306, vər. 217 a.
226 ƏYİ, B – 724, vər. 71 a.

*(Qamətin sərvi-mövzun, rüxsarın sanki bir gül*
*Nəğməkarlıqda sənə* ola *bilməz tay bülbül).*

Başqa yerlərdən Şuşaya gələn şair və alimlər “Məclisi-üns»ə baş çəkməmiş olmurdular. Həsən Yüzbaşovun «Mirzə Əli Lənkəraninin mədhində» adlı şeirindən görünür ki, dövrünün bütün elmlərinə bələd olan Mirzə Əli Lənkərani Şuşada olarkən “Məclisi-üns»ün qonağı olmuşdur.

شد از رخ تو محفل ما پر گل و پرنور
چن هشت بهشت از رخ پیغامبر خاتم
امروز توان گفت که این محفل انس است
که افکنده بر او سایه چو تو شخص معظم
شد محفل انس از اثر فیض وجودت
آسوده ز هر محنت و آزاده ز هر غم

*(Səkkiz qatlı cənnət* sonuncu *peyğəmbərin üzündən işıqlandığı kimi,*
*Bizim məclisimiz də sənin üzündən gül və nur ilə* doldu.
*Bu gün demək* olar ki, bu, *«Məhfili-üns»dür,*
*Çünki* onun *üzərinə sənin* kimi *bir müəzzəm şəxs kölgə salıb.*
*Sənin feyzinin mövcudluğu ilə «Məhfili-üns»,*
*Hər möhnətdən asudə və qəmdən azadə* oldu).

“Məclisi-üns»ün müzakirəyə qoyduğu məsələlər, onun yığıncaqlarının məzmunu heç də hamıya xoş gəlməyirdi. Hətta orada qonaq sifətilə iştirak edənlər belə öz mühafizəkar münasibətlərini gizlədə bilməyib üzvlərinə öz etirazlarını bildirirdilər.

Belə ki, bir dəfə “Məclisi-üns»də şeir-sənət, musiqi, mey və sair dünyəvi məsələlərdən söhbət edilməsi, dini ehkamlara müğayir məzmunlu şeirlər söylənməsi orada qonaq olan

Əbdürrəzzaq Lahicinin xoşuna gəlməmiş və o, görünür, bunu Mirzə Cəfərlə olan müşairəsində qəti və açıq şəkildə büruzə vermişdir. Mirzə Cəfər də bir şeirində ona cavab verərək demişdir ki, sən şeir deməkdə sağlam təbinə dərd vermə, əgər sənin nəzmin fəsahətdə Kamal Xocəndiyə bərabər olsa da, sakit ol, şeir demə, ondan əl çək. "Məclisi-üns» üzvlərinə səs edərəm, abi-rəvan kimi hövzə gələrlər[227].

"Məclisi-üns»ün digər üzvləri kimi Natəvan da Azərbaycanın müxtəlif yerlərində yaşayan şairlərlə müntəzəm əlaqə saxlamış, onlarla məktublaşmışdır. AMEA Əlyazmalar İnstitutunda saxlanılan bir sənəddə Şamaxının Udulu kəndindən Molla Musa Şirvaninin aşağıdakı iki bəndini verdiyimiz şeirinin əvvəlində yazılmışdır:
(Xurşidbanunun cavabında yazılmış).

*Yetişdi xoş namən bizə, xan qızı,*
*Sən ağlarsan, mən gülmərəm, sızdaram.*
*Dərddidən dərddiyə salam eylərəm,*
*Sən ağlarsan, mən gülmərəm, sızdaram.*

*Kim bilər işini çərxi fələyin,*
*Qoymaz bir hasilə yetə diləyin,*
*Dərdin bəyan etdin, yandı ürəyim,*
*Sən ağlarsan, mən gülmərəm, sızdaram*[228].

Şeirin əvvəlindəki «Xurşidbanunun cavabında yazılmışdır» qeydindən, habelə «Yetişdi xoş namən bizə, xan qızı», «Dərdin bəyan etdin yandı ürəyim» misralarından görünür ki, Natəvan bizə məlum olmayan hansı bir səbəbə görə isə Udulu Musaya məktub yazaraq, öz dərdlərindən şikayətlənmişdir. Udulu Musanın şeirinin 1870-ci ildə yazılması göstərir ki, Natəvan da ona məktubunu həmin ildə yazmışdır. Adətən

---

[227] ƏYİ, M – 67, vər. 40 a – 40 b.
[228] ƏYİ, D- 556, vər. 3 b- 4 a.

məclis şairlərinin bir-birilərinə göndərdikləri məktublara eyni qafiyə və vəznlə cavab verilməsindən ehtimal etmək olar ki, Natəvandan Molla Musaya yetişən xoş namə də qoşma formasında və eyni qafiyədə yazılmışdır.

Ədəbiyyatşünaslıqda çox vaxt eyni rədifli qəzəllərin hamısına nəzirə kimi baxılır. Lakin XIX əsrdə yazılmış bir neçə eyni qafiyəli qəzəllərin yaranma səbəbilə tanış olduqdan sonra biz belə qənaətə gəlirik ki, bu cür qəzəlləri ucdantutma nəzirə hesab etmək düzgün deyildir. Bu baxımdan XIX əsrdə Şuşa şairlərinin yazdıqları «Ağlaram», «Ağlama», «Ağlasın», rədifli qəzəlləri və onların yaranma səbəbi ilə tanış olmaq yerinə düşərdi.

Məlumdur ki, Natəvan

*Hicrin edibdi könlümü bərbad, ağlaram*
*Çoxlar tutar bu halıma irad, ağlaram*[229]. -

mətləli qəzəlini oğlunun fərağında yazmışdır. Bundan sonra M.A.Fəna pünhan sevdiyi Natəvanı nəzərdə tutaraq

*Hicrin edibdi könlüm evin qarət, ağlaram,*
*Bu ağlamaq olubdu mənə adət, ağlaram*[230].

qəzəlini yazıb, Səməd bəy də

*Ey piri-xəstədil, belə bitaqət ağlama,*
*Əğyar görsə giryən, edər töhmət, ağlama*[231].

beyti ilə başlanan çox zərif və incə rəmzlərlə dolu qəzəlini yazaraq, Fənaya bir növ nəsihət etmişdir. Bu əhvalatdan xəbər tutan “Məclisi-üns»ün bir neçə üzvü də Səməd bəy kimi hə-

---

[229] Natəvan. Qəzəllər. Bakı, 1956, s. 22.
[230] ƏYİ, A – 9, vər. 27 a – b; C – 218, s. 42.
[231] ƏYİ, C – 218, s. 43; M – 67, vər. 77 a – 77 b.

rəkət edərək, «Ağlama» rədifli qəzəllə Fənaya cavab vermişlər. "Məclisi-fəramuşan»ın üzvü H.Qaradaği də məsələdən hali olub zarafat təriqi ilə həm də Fənaya nəzirə olaraq

*Yox məndə səbr firqəti-cənanə, ağlaram,*
*Düşdüm nə edim bu atəşi-hirmanə, ağlaram*[232].

beytilə başlanan qəzəlini yazıb Fənaya yox, M.Ə.Növrəsə göndərir. Növrəs də öz növbəsində ona cavab olaraq

*Səbr eylə cövri-firqəti-cananə, ağlama,*
*Salma özün bu atəşi-hirmanə, ağlama*[233].

mətləli qəzəlini yazır. Yeri gəlmişkən qeyd etmək lazımdır ki, Nəvvab, onun oğlu Mir İbrahim və başqaları da «Ağlaram» rədifli qəzəl yazmışlar.

Bir tərəfdən Fənanın «Ağlaram» rədifli qəzəl yazmasını və «Ağlama» deyə ona verilən cavabları, digər tərəfdən də H.Qaradaği ilə M.Ə.Növrəsin zərifanə tərzdə Fənayə etdikləri eyhamlarını və ümumiyyətlə, məsələnin başqa bir şəkil almasını görən Natəvan müşairəyə yekun vuraraq, onlara belə cavab vermişdir:

*Ey əhli-dil, Fənanı qoyun barı ağlasın,*
*Əğyarə çünki yar olub yarı, ağlasın.*

*Mən etmək aşiqi nə rəva ahü zardən,*
*Çox dərdi var, qoyun sizi tarı ağlasın.*

*Gözləyən xəyalı var ki, belə ahü zar edir,*
*Öz halına qoyun bu dilfikarı ağlasın…*[234]

---

[232] ƏYİ, B – 1486, vər. 8 a.
[233] ƏYİ, B – 1486, vər. 8 b.
[234] ƏYİ, Arx. 14, Q – 2 (""), s. 30 -31; Natəvan. Qəzəllər. s. 42.

Beləliklə, Natəvan həm Fənaya, həm də «Ağlama» rədifli qəzəl yazan «əhli-dillərə» ustalıqla cavab vermişdir. Bundan sonra Fəna yersiz müşairəyə səbəb olan namünasib hərəkətindən peşiman olaraq, «Hər tərəfdən üzərinə olan bu hücumu görüncə cürmünə etiraf edən mücrüm və ya hakimi-mütləq hüzurunda dayanan bir əsir və ya həsrətdən ürəyi yana-yana məşuqəsinə dərdini deyən aşiq kimi[235]» (Müznib) yazmışdır:

*Bir dil ki, qəm düçarı ola, ağlar, ağlamaz?*
*Ənduhü qüssə yarı ola, ağlar, ağlamaz?*[236]

Bunlardan başqa, Şuşa şairlərinin «Ölmə», «Getmə» rədifli qəzəlləri də belə yaranmışdır. Oğlu Mehdiqulu xan Tiflisdə olarkən Natəvan

*Varımdı sinədə dərdü qəmi-nihan, ölürəm,*
*Fəda olum sənə, gəl eylə imtəhan, ölürəm*[237].

beyti ilə başlanan məşhur qəzəlini yazdıqda, yerbəyerdən ona «Ölmə», «Ölməyəsən» və yaxud müalicəyə gedərkən «Gedirəm»[238] rədifli qəzəlini "Məclisi-üns»də oxuduqda, oradakılar «Getmə» rədifli qəzəl yazaraq,[239] şairəyə öz hörmət və ehtiramlarını bildirmişlər.

---

[235] ƏYİ, C – 218, s. 52.
[236] ƏYİ, A – 9, vər. 28 b.
[237] Natəvan. Qəzəllər. Bakı, 1956, s. 36.
[238] B – 1293 şifrəli cüngdə şairənin "Gedirəm" rədifli qəzəl yazdığı göstərilmişsə də bu hələlik əldə edilməmişdir.
[239] ƏYİ, B – 1293, vər. 39 a. Qeyd: Şuşa şairlərindən Məmai, Həsən Yüzbaşov, Agəh və başqalarının hər biri "Getmə" rədifli bir neçə qəzəl yazmışlar. Bu qəzəllərin bəzisi öz oğlu Mir Abbasın vəfatı münasibəti ilə Natəvanın dediyi qəzələ nəzirə olaraq yazılmışdır.

Nümunə üçün Məmai və Həsənin «Getmə» rədifli qəzəllərinin bir neçə beytini aşağıda veririk:

Məmai:

*Ey gözüm nuri, qərari-dili-ürfan, getmə,*
*«Məhfili-üns» sənin canına qurban, getmə.*

*Sən ilən gülşəni-ümmiddə güllər açılır,*
*Qönçə tək etməgilən gəl ürəyim qan, getmə*[240].

Həsən:

*Sən ağa, bizlər üçün ruhi-rəvansan, getmə,*
*Nə həmin bizlər üçün, aləmə cansan, getmə.*

*Arzum oldu ki, çox ömr edəsən aləmdə,*
*"Məclisi-üns»də sən virdi-zəbansan, getmə*[241].

Yuxarıdakı misallardan, istərsə də müxtəlif cüng və əlyazmalarında olan qeydlərdən asanlıqla müəyyən etmək olur ki, ədəbi məclis şairlərinin qəzəllərinin əksəriyyəti heç də xəyalən yox, müəyyən münasibət və əhvalatla əlaqədar olaraq deyilmişdir. Bəzən bir şairin eyni rədifli üç-dörd qəzəlinə rast gəlinir[*]. Doğrudur, bunların bəziləri forma və məzmunca eyni olduqları üçün ilk baxışda nəzirə kimi nəzərə çarpır; ancaq müxtəlif əlyazmalardakı qeydlərlə tanış olduqda aydınlaşır ki, nəzirələrlə yanaşı, bir çox eyni rədifli qəzəllər nəzirə yox, müstəqil, orijinal əsərlərdir.

Deməli, Natəvan və Fənanın «Gedirəm», «Ölürəm», «Ağlaram» qəzəllərinin müqabilində Həsən, Məxfi, Məmai,

---

[240] ƏYİ, B – 1293, vər. 39 a.
[241] Həsən Qarabaği. Divan. Avtoqraf. Vər. 288 b – 289 a.
[*] Həsən, Məmayi və başqalarının hər birinin eyni rədifli bir neçə qəzəli vardır (N.Q)

Agəh, Səməd bəyin «Getmə», «Ölmə», «Ağlama» qəzəlləri heç də ədəbi yarış zamanı «Beytüs-Səfa» şairləri tərəfindən sənətkarlıq istedadı yoxlanmaq məqsədilə Füzulinin məşhur «Olmaz» qəzəlinə deyilmiş nəzirələr kimi yaranmamışdır.

Natəvanın qəzəllərinə yazılan nəzirələrə gəldikdə isə, bunu şairənin qüvvətli təbi, rəvan dili və həyatına müvafiq hüznlü qəzəllərində qazandığı sənətkarlıq müvəffəqiyyətilə əlaqələndirmək lazımdır. Təkcə Qarabağ şairləri yox, Şəki, Şirvan, Bakı şairləri də onun bir çox qəzəllərinə nəzirələr yazmışlar.

Məlum olduğu kimi, Natəvanın həyatı müsibətlərlə dolu keçmişdir. İlk müsibət onu sevmədiyi bir nəfərə ərə verməsi ilə başlanmışdı. Şuşa kimi təbiətin füsunkar qoynunda həyata göz açan, şairlər, müğənnilər vətənində tərbiyə alan, şair təbiətli, həssas qəlbli, Qarabağ xanlığının son varisi olan gənc qızın ilk məhəbbəti uğursuz olmuşdu. Cəmi bir neçə il Xasay xanla yaşayan şairə oğlu Mehdiqulu və qızı Xanbikə ilə ömrünün ən gözəl çağlarında dul qalmışdır. Dalbadal gələn elçiləri rədd etsə də, gənc və simaca çox gözəl olan şairə tək qalmağın çətin olduğunu yaxşı başa düşdüyü üçün, məhz buna görə də dedi-qoduların ucbatından Hüseyn adlı bir seyidə ərə getməyə məcbur olmuşdu. Lakin şairənin bədxahları, xüsusən təəssübkeş bəyzadələr onu rahat qoymurdular. Xan nəslindən olan bir qızın adi seyidə ərə getməsi yalan şaiyələr üçün onların əlində bəhanə olur. Məhz belələrinin təhriki ilə A.Asi imzasız həcv yazaraq, onu Natəvana çatdırmışdı. 1885-ci ildə ikinci ərindən olan sevimli oğlu Mir Abbasın çox cavan ikən ölümü də Natəvana ciddi təsir etmişdi.

Natəvanın adi bir seyidə ərə getməsindən oğlu Mehdiqulu xan da narazı olmuş, bu izdivacı öz nəsli üçün təhqir saymış, anasından küsmüş, ona kinayəli məktublar yazmışdı. 1881-ci ildə Natəvan acı taleyindən şikayətlənərək «Bax» rədifli qəzəl yazıb, Tiflisə, oğlu Mehdiqulu xana göndərmişdi. O da cavabında aşağıda üç beytini verdiyimiz eyhamla və rəmzi

işarələrlə dolu eyni rədifli qəzəlini anasına yola salmaq istərkən İ.Rüstəmbəyov mane olmuşdur.

*Ey Natəvan, bu hali-dili natəvana bax,*
*Könlüm kimi xəzanə qalan xanimanə bax.*

*Biçarə bülbülün qəmin bağban bilir,*
*Gülçinə söylə kim, dağılan aşiyanə bax.*

*Zağü zəğən nişimən edib gülsitan ara,*
*Bülbül yerində məskən edən pasibanə bax*[242].

Mehdiqulu xan sonralar da öz yersiz inadından əl çəkməyərək, gah anasına, gah da atalığına kinayəli məktublar göndərməkdə davam etmişdi. Onun 1889-cu ildə Seyid Hüseynə yazdığı farsca bir şeirinin əvvəlində İ.Rüstəmbəyovun belə bir qeydi vardı: «Bu bir neçə fərdi Mehdiqulu xan ağa Seyid Hüseynə deyir və mən iyirmi fərddən çox, uzun cavab yazıb göndərdim. Mənim cavabım öz yanımda olmadı, Mehdiqulu xanın yanındadır. İyun ayı, 1889»[243]. Mehdiqulu xanın bundan başqa, anasına eyni məzmunda farsca bir məktubu da vardır[244].

Bütün bu mənəvi sıxıntılar və cismani zəiflik şairənin əhvali-ruhiyyəsinə ciddi təsir göstərmişdi. Belə bir vəziyyətdə olan Natəvanın yeganə təsəlli yeri ariflər yığıncağı – "Məclisi-üns» idi. Lakin mənəvi sıxıntılar və xəstəliyi ilə əlaqədar olaraq o, son illər "Məclisi-üns»ün yığıncaqlarında iştirak edə bilməyir. Bu, "Məclisi-fəramuşan» şairlərini də çox mütəəssir etmişdi. M.M.Nəvvab hicri tarixlə 1309-cu il zilqədə ayının 15-də

*Əliyyə-aliyyə, ağa cəlilə,*

---

[242] ƏYİ, 236, vər. 70 a.
[243] Yenə orada, vər. 79 a.
[244] Yenə orada, vər. 31 b.

*Neçün əşarınız olmaz hüveyda?*
*Qamu əşarlər əncamə yetdi,*
*Sizinkindən əsər olmazmı peyda?*[245]

deyə şairəyə yazdığı məktubunda onun son illər səsi-sədası gəlməməsinin və təzkirəyə daxil etmək üçün şeirlərindən nümunələr göndərməməsinin səbəbini soruşmuşdu. Natəvan isə həmin məktubdan təxminən 15-20 gün sonra, 1309-cu ilin zilhiccə ayında Nəvvaba cavab verərək yazmışdı:

*Qəmi-əyyamdən çox natəvanəm,*
*Əliləm, naxoşam, əfsürdə haləm,*
*Bu tətildən özüm də bədgümanəm,*
*Məgər kuhi-qəmə Fərhad oldum!*

*Unutma sən duadən Natəvanı,*
*Əlilü naxoşü əfsürdəcanı,*
*Cənabından səva yoxdur gümanı,*
*Əgər yaddan çıxam, bərbad oldum*[246].

Miladi tarixdə 1892-ci ilin may-iyun aylarında təsadüf edən bu məktublaşmadan görünür ki, hələ vəfatından çox əvvəl onun əhvalı pozğun olmuş və mənəvi cəhətdən sıxıntı çəkmişdir. Şairənin son zamanlar səsi-sədası gəlməməsinin səbəbi də «əfsürdəhal, əlil və naxoşluğu» olmuşdur.

Bu illərdə "Məclisi-üns» əvvəllər olduğu kimi qızğın fəaliyyət göstərmirdi. Burada şeir-sənət, musiqi ətrafında qız-ğın mübahisə və müşairələr əvəzinə Natəvanın xəstəliyi ilə

---

245 ƏYİ, M – 67, vər. 542 a.

246 Yenə orada, vər. 542 b. Qeyd: Nəvvabın məktubu Natəvanın 1928, 1956 və 1962-ci illərdə buraxılmış kitabında "Müasirlərinin Natəvan haqqında şeirləri" hissəsində getdiyi halda onun Nəvvaba cavabı ilk dəfə bu sətirlərin müəllifi tərəfindən aşkara çıxarılaraq nəşr edilmişdir. Bax: "Azərbaycan" curnalı, 1962, N 8. (N.Q).

əlaqədar söhbətlər gedir, ona şeirlər həsr edərək, tezliklə sağalmasını arzulayırdılar. 1891-ci ildə Nəvvabın “Məclisi-üns»ün üzvlərinə bir neçə mənzum məktubu və onların suallarına verdiyi cavabı nəzərə alınmazsa, onun başqa məclislərlə əlaqəsi də kəsilmişdi.

Beləliklə, “Məclisi-üns» 1897-ci ilədək, Natəvanın vəfatına qədər davam etmişdir. Onun üzvləri artıq «şeir bazarının gülləri solduğunu», «bülbüllərin susduğunu», «dostluq məclisi başçısının aralarından getdiyini» - məclisin dağıldığını təəssüflə qələmə almışdılar.

“Məclisi-üns»ün dağılması hamıdan çox onun yaşlı üzvlərinə təsir etmişdi. Mirzə Həsən Yüzbaşov, Məmo bəy Məmai, Mirzə Rahim Fəna, Mirzə Ələsgər Növrəs bir-birinin ardınca vaxtilə orada keçirdikləri xoş günləri xatırlayaraq, təəssüflə dolu qəzəllər yazmışlar.

1897-ci ilədək davam edən “Məclisi-üns»ün poeziya qapıları bağlandı. Təqribən 33 il fəaliyyət göstərən bütün üzvlərindən bəhs etmək imkan xaricindədir. Biz onun ancaq bir neçə görkəmli üzvü haqqında məlumat verməklə kifayətlənəcəyik ki, bunlardan biri də Mirzə Həsəndir.

## Mirzə Həsən

Həsən Əli oğlu Yüzbaşov 1824-cü ildə Şuşa şəhərində doğulmuşdur. O, burada mükəmməl mollaxana təhsili almış, ərəb və fars dillərini öyrənmiş, Firdovsi, Nizami, Sədi, Hafiz, Cami, Nəvai və Füzuli kimi böyük şairlərin yaradıcılığına dərindən bələd olmuşdur.

Həsəndə hələ kiçik yaşlarından şeirə xüsusi maraq oyanmışdır. Gənc yaşlarından xırda alverlə məşğul olan Mirzə Həsən boş vaxtlarını şeir məclislərində keçirər, müşairə və mübahisələrə girişərdi. O, şeirlərini Həsən imzası ilə yazmışdır.

Mirzə Həsənin adına tədqiqatçı alimlərin əsərlərində də az təsadüf edilir.

Məmmədəli Tərbiyət «Danişməndani-Azərbaycan» əsərində «Hədiqətüş-şüəra» adlı təzkirəyə əsaslanaraq, Kaşif Qarabaği adlı bir şairin adını çəkmiş, onu XIX əsrin «söz ustadlarından biri» kimi səciyyələndirmişdir[247].

Tədqiqat zamanı məlum oldu ki, M.Təbiyətin öz təzkirəsində adını çəkdiyi Kaşif Qarabaği, haqqında danışdığımız Mirzə Həsən Qarabağidir.

Mir Möhsün Nəvvab öz təzkirəsində yazır ki, «mən ona (Mirzə Həsənə – N.Q.) Kaşifi ləqəbi seçdim, lakin ləqəbi yoxdur, Həsən imzası ilə şeir yazır». Bir şeirində Nəvvab Mirzə Həsənə müraciətlə yazırdı: «…sənin adına Kaşifi ləqəbi qoyuldu, ləqəb ilə şeir demək yaxşıdır… ey həqiqətin sirrlərini kəşf edən Kaşif, sənin məqsədin günəş kimi şəfəqlidir». Lakin özünə təxəllüs qəbul etmək arzusunda olmayan M.Həsən ona belə cavab vermişdi: «Sən mənə Kaşifi ləqəbi verdin. Ey müəzzəm pir, ey ədəb ərkanı, Kaşifi gərək gizli sirrlərdən xəbərdar ola, sirrlər, mətləblər kəşf edə. Mən hara, belə sirrlərdən xəbərdar olmaq, belə işlərin kəşfi hara? Mən ölüm, bu Kaşifi ləqəbini özün üçün seç».

Mirzə Həsən Şuşada olduğu vaxtlarda həmişə "Məclisi-üns»də iştirak edər, yazdığı şeirləri orada oxuyar, ədəbiyyata, sənətə dair söhbət və mübahisələrə qoşulardı.

Mirzə Həsən 1904-cü il fevral ayının əvvəllərində, təxminən 80 yaşında Şuşada vəfat etmişdir.

Şairin ədəbi irsi nəinki tədqiq edilməmiş, indiyədək onun (M.Nəvvab və M.Müctəhidzadənin təzkirələri nəzərə alınmazsa) ancaq «Rəsmi-vilayəti-Qarabağ və şəhri-Şişə» əsəri (1926) nəşr olunmuşdur[*].

---

[247] Məmmədəli Tərbiyət. Danişməndani Azərbaycan. Bakı, 1987, s. 182.

[*] Bax: Mirzə Həsən Qarabaği. Seçilmiş əsərləri / Müqəddimə, şərh və qeydlərin müəllifi: N.Qarayev. Bakı, 1973. **(red. – V.M.)**

Mirzə Həsən Qarabağinin AMEA Əlyazmalar İnstitutunda M-91 şifrə altında bir «Divan»ı saxlanılır. Şairin oğlu Xəlil Yüzbaşov[248] tərəfindən vaxtilə üzü köçürülmüş bu divanın avtoqrafı isə onun başqa oğlu Qasım Yüzbaşovun şəxsi arxivindədir. Mirzə Həsən bu divanı 1893-cü ildə tərtib etməyə başlamışdır. Buradakı şeirlərin ümumi ruhundan anlaşılır ki, o gənclik illərində yazdığı əsərlərinin az hissəsini divanına daxil etmişdir. Avtoqraf divanda altı min beytdən çox Azərbaycan və fars dillərində yazılmış qəzəl, məsnəvi, tərkibbənd, tərcibbənd, rübai, qitə, təmsil və təxmis vardır… Bütün bunlar Mirzə Həsəni klassik Şərq ədəbiyyatına dərindən bələd olan bir şair kimi səciyyələndirməyə imkan verir.

Mirzə Həsən müasirləri arasında gözəl məsnəvi ustası kimi tanınmışdır. Onun məsnəvi yazmaqda "Məclisi-üns» və "Məclisi-fəramuşan» şairlərindən fərqlənməsini M.Nəvvab da qeyd etmişdir. «Rəsmi-vilayəti-Qarabağ və şəhri-Şişə» («Qarabağ vilayəti və Şuşa şəhərinin adətləri»), «Oğluma nəsihət» əsərləri, Natəvana, Nəvvaba, Hacı Abbas Agəhə yazılmış məktubları və təmsilləri Mirzə Həsənin rəvan dildə, sənətkarlıq məharəti ilə yazılmış məsnəvilərindəndir.

Mirzə Həsən yaşa dolduqca, həyat təcrübəsi artdıqca sənətkarlığı yetkinləşdiyi kimi, onda həyatın ictimai eyiblərinə, ziddiyyətlərinə qarşı tənqidi münasibət də qüvvətlənmişdir. Bu hal onun H.A.Agəhə məktubunda və ömrünün son çağlarında yazdığı «Rəsmi-vilayəti-Qarabağ…» əsərində özünü bariz şəkildə göstərir. Dövrün eyiblərinin tənqid və ifşasında bu iki əsərlə kifayətlənməyən şair «əcəldən macal olsa» yaşadığı cəmiyyətin «nə eyibləri varsa onları bir-bir» qələmə alacağını bildirir. Lakin xəstə şairin buna macalı olmadı.

Həsənin yaradıcılığının əsas ruhunu məhəbbət mövzusunda yazılmış qəzəl təşkil etsə də, dövrandan şikayət, ədalət-

---

[248] Xəlil Yüzbaşov da "Xəlil" təxəllüsü ilə şeirlər yazmışdır. O, həm də Nəvainin əsərlərindən bir çoxunu Azərbaycan dilinə tərcümə etmişdir ki, hazırda onlar AMEA Əlyazmalar İnstitutunda mühafizə olunur (N.Q).

sizliyin və tüfeyliliyin tənqidi, yoxsulların hüquqsuzluğu əsərlərində müəyyən dərəcədə öz bədii əksini tapmışdır. «Rəsmi-vilayəti-Qarabağ…» əsəri bu cəhətdən xüsusilə səciyyəvidir. Burada əsasən XIX əsrdə Qarabağda yas və toy mərasimlərinin keçirilməsi təsvir və tənqid olunmuşdur. Əsərin müqəddiməsində şair zəmanəsindən şikayətlənərək yazır:

*Qoyub avarə bizi kəcrəvişi-dövri-zəman,*
*Şüğlimiz rəncü məşəqqət, işimiz ahü fəğan.*

*Xahişi-nəfsimiz olmuş bizə bir şeri-mübin,*
*Harda var fasiqü facir odu xəlq içrə əmin.*

*Ehtiram ondadı ki, onda olur kibrü qürur,*
*Möhtərəm ol kişidir kim, edə çox fisqü fücur.*

*Sərfəraz oldu o kəslər kim, olub xeyli şərir*
*Xəlqə daim yetə ondan qəmü ənduhi-kəsir*[249].

Daha sonra şair göstərir ki, kim birinə qız verərsə və ya oğlan evləndirərsə, hələ toydan çox-çox əvvəl şəhərin «mütəşəxxis adamları», bəylər toy tədarükünə hazırlaşmaq üçün məsləhət axşamlarına toplaşar, ev sahibini nahaq yerə xərcə salarlar. Onlardan biri xanəndə, o bir zurnaçı tapmağı, digəri şərab almağı öhdəsinə götürər, bir başqası da qumar məsələsi ilə məşğul olar. Toya bir neçə gün qalmış bəylər beş-beş, on-on olub gecələr sübhə kimi toy sahibinin evində qumara qurşanarlar. Pul uduzan vəziyyətdən çıxmaq üçün ev yarar, oğurluq edər. Hələ bu harasıdır, bir də görərsən ki, içkidən sərxoş olub bir «alçanın üstündə» müharibə edərlər. Ara elə qızışar ki, biri digərini vurub Öldürər. Onu da tutub Sibirə – katorqaya göndərərlər.

---

[249] Həsən Qarabaği. Divan. Avtoqraf. vər. 169 a.

Həsən bu əsərində XIX əsrdə yas və nigah mərasimlərinin, eləcə də toy şənliklərinin real mənzərəsini oxucuların gözü qarşısında bacarıqla canlandıra bilmişdir.

Əlbəttə, M.Həsən Azərbaycan xalqının gözəl ənənələrindən bir olan toy şənliklərinin və yaxud digər milli adətlərin əksinə deyildi. O, bu adət-ənənələrdən sui-istifadə edən, israfçılığa şərait yaradan tüfeylilərə qarşı çıxırdı. Öz xalqının təəssübünü çəkən şair təəssüflə qeyd edirdi ki, başqa millətlər elm-sənət ardınca getdikləri bir zamanda biz faydasız işlərlə məşğul oluruq.

Əsər Mirzə Həsənin maarifpərvər bir şair olduğunu sübut edir. Ümumiyyətlə, «Rəsmi-vilayəti-Qarabağ…» əsərində Azərbaycanın, xüsusilə Qarabağ həyatının öz dövrünə görə aktual və tipik xüsusiyyətləri təsvir edilmişdir.

Mirzə Həsən həyatda hər gün şahidi olduğu faciələrin, ictimai fəlakətlərin əsas səbəbini, mahiyyətini dərk edə bilmirdi. Ona elə gəlirdi ki, yaşadığı cəmiyyətdə olan ictimai bəlaların əsas səbəbi insanların elm və mədəniyyətə etinasızlığıdır. Odur ki, şair hər bir şəxsin elmə sahib olmaq və özündə nəcib insani keyfiyyətlər tərbiyə etmək məsələsini irəli sürürdü. Onun «Oğluma nəsihət» əsəri bu cəhətdən maraqlıdır. Beş hissədən ibarət olan bu əsərdə insanın ləyaqətini, şərəfini alçaldan ikiüzlülük, lovğalıq, təkəbbürlülük, xəyanətkarlıq, qumarbazlıq, sərxoşluq kimi mənfi sifətlər pislənir; elm, təhsil, sənətin faydasından, yoldaşlıq və dostluq etməyin, kimlərlə oturub-durmağın qaydalarından bəhs edilir.

Mirzə Həsənin «Rəsmi-vilayəti-Qarabağ…» əsəri, H.A.Agəhə məktubu və təmsil-hekayələri mündəricə və məzmun etibarilə Qasım Bəy Zakirin əsərləri ilə səsləşir.

Şairin satirik əsərlərində tənqid hədəfləri konkret olmasa da, onları oxuduqda o dövr ictimai həyatının mənzərisi bütün eybləri ilə gözümüz önündə canlanır. Lakin təqiblərdən çəkinən şair mövcud cəmiyyətin kəsir tərəflərini daha qabarıq şəkildə deməyə ehtiyat etdiyini söyləyir və bu cəhətdən

Zakirin «xoş günlər» keçirdiyini yazırdı. Mirzə Həsənə görə, yaşadığı dövrdə istədiyini, ürək sözlərini deyə bilmək şair üçün böyük xoşbəxtlikdir. O, sələfi Zakirə sanki həsəd apararaq yazırdı:

*Nə xoş günlər keçirmiş ol zaman kim, Zakiri-mərhum,*
*Deyərdi hər kəsin eybin nə ki, onda ləyaqətdir.*

*Yazardı hər kəsin eybini bixofü bipərva,*
*Deməzdi bu gədadır, ya bəyü xani-vilayətdir.*

*Var indi ondan artıq bihəya, bişərmlər, billah,*
*Nedim, zikr edə bilməm, çünki əyyami-cəhalətdir*[250].

Şairi daha çox narazı edən o idi ki, birinə hörmət etdikdə o, təkəbbürünü daha da artırırdı, naəhl adamlar şad, əhli-hallar isə qəm dəryasında boğulurdular, doğrular xəyanətkar, xəyanətkarlar isə əmanətkar olmuşdular. Belə bir cəmiyyətdə yaşayan Həsən bu eyiblərin əsas ictimai kökünü açıq dərk edə bilməsə də, belə bir cəmiyyətin mövcud olmasını da istəmirdi. Əlacsız qalan şair:

*Görüm, yarəb, dağılsın bu vilayət, tarümar olsun,*
*Zebəs kim, bu dağılmış məcməi-əhli-şərarətdir*[251].

deyərək vilayətdən baş götürüb qaçmaqdan başqa çarə tapmırdı.

Haqsızlıq və zülmə etiraz, zəmanədən şikayət motivlərinə Mirzə Həsənin, demək olar ki, aşiqanə qəzəllərindən tutmuş “Məclisi-üns»ün üzvlərinə yazdığı mənzum məktublarına kimi bütün şeirlərində təsadüf olunur. Şair bir qəzəlində yaşadığı mühitdə yoxsula rəhmi gələn, məzlumun imdadına yetən bir

---

[250] Həsən Qarabaği (Yüzbaşov). Divan. Avtoqraf. vər. 204 a.
[251] Yenə orada.

nəfərin də olmadığını ümumiləşdirilmiş şəkildə belə ifadə etmişdir:

*Əfsus ki, aləmdə bir imdadə yetən yox,*
*Fəryad qılan çoxdu, vəli dadə yetən yox*[252].

Mirzə Həsən oğruları, qumarbazları, təkəbbürlü var-dövlət sahiblərini tənqid etdiyi kimi, bəzi saxtakar din xadimlərinə qarşı çıxırdı.

*Gör şeyxə inandım nə əcəb bir neçə müddət,*
*Aldatdı məni ondakı təsbihü əmmamə*[253].

Mirzə Həsənin satirik məzmunlu əsərlərində olduğu kimi, təmsillərində də Qasım bəy Zakirin təsiri açıq görünməkdədir.

Mirzə Həsənin təmsilləri və satirik əsərlərinin dili qəzəllərinə nisbətən daha sadə və anlaşıqlıdır.

Mirzə Həsənin yaradıcılığında qəzəl əsas yer tutur. O, Şərqin iki görkəmli şairi – Ə.Nəvai və M.Füzuli yolunun davamçılarındandır. Nəvainin əsərlərini orijinaldan dönə-dönə mütaliə etməklə cığatay dilini gözəl öyrənən Həsən ustadının qəzəllərinə nəzirələr yazmaqla bərabər həmin dildə bir neçə qəzəl də qoşmuşdur. Həsənin yaradıcılığında Nəvai və Füzulinin təsiri eyni dərəcədə görünməkdədir. Ana dilindən başqa fars, ərəb və özbək dillərini bilməsi şairin yaradıcılığında da özünü göstərmişdir. O, fars dilinə daha çox meyil etmiş və demək olar ki, divanının yarısını həmin dildə yazmışdır. Həsənin fars dilində orijinal əsərlərindən başqa Hafiz, Cami, Sədi kimi klassiklərin qəzəllərinə həmin dildə ustalıqla yazılmış təxmisləri vardır.

---

[252] Həsən Qarabaği (Yüzbaşov). Divan. Avtoqraf. vər. 122 a (haşiyədə).

[253] Həsən Qarabaği (Yüzbaşov). Divan. Avtoqraf. vər. 246 b (haşiyədə). Qeyd: Burada vəznə görə “əmmamə” sözü “əmamə” kimi işlənmişdir.

Həsənin avtoqraf divanındakı bəzi qəzəllərin yazılma səbəbləri də göstərilmişdir ki, bu baxımdan onlar oxucuda maraq oyadır.

Dediyimiz kimi, XIX əsrin ikinci yarısında yaşamış Azərbaycan şairlərinin əksəriyyəti Natəvanın qəzəllərinə çoxlu nəzirələr yazmışlar. Lakin "Məclisi-üns» şairləri nəzirələrlə yanaşı, onun özünə də onlarca şeirlər həsr etmişlər. Bu cəhətdən Məmai, Agəh, Fəna kimi Mirzə Həsən də fərqlənir. Natəvana böyük ehtiram və hörmət bəsləyən və onun bütün münasibətlərinin şahidi olan Mirzə Həsən hər dəfə şairənin ağır günlərində xüsusi şeirlər yazıb ona təsəlli vermiş, dərdinə şərik olmuşdur. O, Natəvanın müalicəyə getməsi və Şuşaya qayıtması münasibəti ilə bir neçə şeir yazmışdır. Şairə müalicədə olarkən ona yazdığı bir şeirində Həsən şairələr məclisinin ruhani rəhbərini belə səciyyələndirmişdir:

*Sənsiz nədi Şişənin nəmudi?*
*Gəlməz nəzərə onun vücudi...*
*Gülşən gül ilə olubdu dilşad,*
*Gül olmasa kim edər onu yad?*
*Ey «Məhfili-üns»ə rükni-əvvəl,*
*Hicranını vəslə qıl mübəddəl.*
*Sən «Məhfili-üns» üçün səfasən,*
*Mətlubisən, eyni müddəasən.*

*Müddətdi bu bəzmi-zövqi-müşrib,*
*Sənsiz dəxi olmuyub mürəttib...*[254]

Natəvanın Şuşada olmaması onun həmməclislərini nə qədər məyus edirdisə, gəlişi də bir o qədər sevindirirdi. Həsən:

---

[254] Həsən Qarabaği (Yüzbaşov). Divan. Avtoqraf. vər. 158 a.

*Sən ey süruri-dili-biqərar, xoş gəldin,*
*Bu şəhri-Şişəni qıldın bahar, xoş gəldin*[255].

beytilə başlanan qəzəlini məhz şairənin müalicədən qayıtması münasibətilə yazmışdır.

Məlumdur ki, Natəvan istedadlı şairə olduğu kimi həm də gözəl rəssam idi. Onun əldə olan şəkilləri müasir sənətşünaslarımız tərəfindən yüksək qiymətləndirilmişdir. Mirzə Həsən Natəvanın çəkdiyi bənövşə, süsən, qönçə, qızılgül şəkillərinə xüsusi qəzəllər həsr etmiş, onun sənətkarlığını Şərqin məşhur rəssamlarına, çəkdiyi şəkilləri isə onların nəqşlərinə bərabər tutmuşdur. Bir dəfə «Məhfili-üns»ün yığıncaqlarından birində Natəvan çəkdiyi qızılgül şəklini Mirzə Həsənə bağışlamış, o da həmin münasibətlə aşağıda üç beytini verdiyimiz qəzəli yazmışdır.

*Ey gül, səni bilməm necə ustad çəkibdir,*
*Nəqqaşi-əzəl sünin edib yad, çəkibdir!*

*Guya qələmi-qüdrətilə sanei-piçün,*
*Bu nəqşi özü eyləyib icad, çəkibdir.*

*Min səy ilə hərgiz belə təsviri-dilara,*
*Nə Maniyi-Ərcəngü nə Behzad çəkibdir*[256].

Mirzə Həsənin şeirlərində rast gəldiyimiz gözəl təşbeh, cinas, istiarə, qüvvətli mübaliğə və başqa obrazlı ifadələr diqqəti cəlb edir. Bədii ifadə vasitələrini özünəməxsus ustalıqla işlədən şair adi təbiət hadisələrinə oxucunu düşündürən dərin mənalar verə bilir. Məsələn, günəşin səhərlər çıxıb, axşamlar batmasına məcazi məna verən şair sevgilisinə deyir ki, sənin gözəlliyin göydə günəşi də sərgərdan etmişdir. Odur ki, hər

[255] Yenə orada, vər. 133 a.
[256] Yenə orada, vər. 124 b.

gün səhərlər çıxanda sənin camalını görüb xəcalətindən gizlənir:

*Arizin görmüş məgər çərx üzrə sərgərdan gəzər,*
*Xiclətindən üz tutar daldayə hər bir gün quyaş?*[257]

Şərq poeziyasında çox zaman qadın gözəlliyini günəşə oxşatmış, günəşlə müqayisə etmişlər. Göründüyü kimi, burada Həsən vəsf etdiyi gözəlin günəşdən artıq olmasını orijinal tərzdə ifadə etmişdir. Başqa bir misal, klassik ədəbiyyatda Yusifin gözəllik simvolu kimi işlədilməsi məlumdur. Mirzə Həsən burada da heç kəsi təkrar etməmiş, orijinal yolla getmişdir. O əfsanəvi Yusifin Misir bazarında satılmasına başqa məna verərək, aşiqin dili ilə məşuqəsinə deyir ki, sənin gözəlliyin Yusifin hüsnünə xələl gətirdi, onu bazarda satılacaq dərəcəsinə endirdi: Həsən yazırdı:

*Mahi-Kənanı ki, olmuşdu cəhan içrə əziz,*
*Saldı bazarə üzün hüsnü, ona verdi ziyan*[258].

Mirzə Həsənin Natəvana yazdığı məktubda işlətdiyi cinaslar da diqqəti cəlb edir. Həmin məktubun bir yerində şairin işlətdiyi «müştəri» ifadəsinə diqqət edək:

*Ey Müştəriruyü mehri-sani,*
*Vey müştəriyi-dürri-məani,*
*Sən gövhəri-nəzmə müştərisən,*
*Nəzmin fələyində Müştərisən*[259].

---

[257] Yenə orada, vər. 162 a. (haşiyədə). Qeyd: “quyaş” cığatay dilində günəş deməkdir (N.Q).
[258] Yenə orada, vər. 142 a.
[259] Yenə orada, vər. 158 b.

Birinci misradakı «müştəri» ifadəsi ilə şairənin gözəl sifəti, siması Saturn planetinə təşbih edilmiş, ikinci və üçüncü misralarda müstəqim olaraq mənalar gövhərinin xiridarı, şeir-sənət qədri bilən, dördüncü misrada isə yenə də planet mənasında işlədilmişdir. Lakin burada Müştəri (Saturn) gözəllik timsalı kimi yox, yüksəklik, ucalıq mənasında götürülmüşdür.

Klassik poeziyanın istedadlı davamçılarından olan Mirzə Həsən bu poeziyanın gözəl ənənələrini sadəcə olaraq yaşatmamış, ləyaqətli bir varis kimi onun məzmununa yaşadığı dövrünün ruhunu, səsini-sədasını gətirmiş sənətkarlardan biri olmuşdur.

## Məhəmmədəli bəy Məxfi

Məhəmmədəli bəy Əsədulla oğlu Vəlizadə Məxfi təxminən 1821-ci ildə Şuşada anadan olmuşdur. Təhsilini Şuşada alan Məmmədəli bəy ana dilindən başqa fars və rus dillərini də gözəl bilirdi. Məhz rus dilini gözəl bilməsi sayəsində o, bir müddət Şamaxı, Tiflis, İrəvan və Şuşada dövlət idarələrində qulluq etmişdir.

Məxfi haqqında ilk məlumata M.Nəvvabın[260], M.Müctəhidzadənin[261] və F.Köçərlinin[262] əsərlərində rast gəlirik. İstər M.Nəvvabın, istərsə də M.Müctəhidzadənin əsərlərində şair haqqında çox qısa məlumat verilmişdir. Onun həyatından nisbətən geniş bəhs edən F.Köçərli şairin Azərbaycan və fars dilldərində nəzm və nəsr əsərləri olduğunu, lakin əldə edilmədiyini yazmışdır. Nəvvab və Köçərli Məxfinin ruscadan Azərbaycan dilinə təmsillər tərcümə etdiyini yazmışlarsa da, bu haqda hələlik əlimizdə bir dəlil yoxdur.

Müctəhidzadə Məxfinin 1305 (1887), İ.Tahir 1308 (1890), F.Köçərli 1310 (1892), Nəvvab isə 1309 (1891)-ci ildə vəfat

---

[260] ƏYİ, M – 67, vər. 235 a.
[261] Müctəhidzadə M. Riyazül-aşiqin. İstanbul, 1910, s. 161.
[262] Köçərli F. Materiallar. II c. II hissə.s. 186.

etdiyini yazırlar. Bizcə, bunlardan Nəvvabın göstərdiyi tarix daha düzgündür. Belə ki, məclis üzvlərindən biri vəfat etdikdə bir qayda olaraq digəri bu münasibətlə maddeyi-tarix yazırdı. Həsən Qarabaği (Yüzbaşov) da Natəvanın, Mirzə Sadıq Piranın və Məhəmmədəli bəy Məxfinin vəfatından maddeyi-tarix yazmışdır. Onun Məxfi haqqında fars dilində yazdığı maddeyi-tarixin son misralarında deyilir:

مخفی که بود شمع شبستان اهل دل
خاموش گشته از ستم باد روزگار
در بزم انس بود مرا یار و غمکسار
ناگه ربود گرگ اجل برد آشکار
تاریخ رحلتش اگر جستجو کنی
دگر هزار و سیصد و نهم شمار

*(Məxfi ki, əhli-dilin şəmi-şəbistanı idi,*
*Külək ilə xamuş etdi onu zalım ruzigar.*
*"Məclisi-üns»də mənim yaru-qəmküsarım idi,*
*Nagah götürdü əcəl qurdu, apardı aşikar.*
*Onun vəfat ilini axtararsa hər kim əgər,*
*Bunu bil ki, tutar o, min üç yüz doqquzda qərar).*

Hicri 1309 isə miladi tarixlə 1891-ci il (əslində 1891-ci ilin axırı və 1892-ci ilin əvvəlinə – red.) təsadüf edir.

F.Köçərli yanlış olaraq Məxfini "Məclisi-fəramuşan»ın üzvü hesab etmişdir. Lakin M.R.Fəna, Həsən Qarabaği (Yüzbaşov) və başqa məclis şairlərinin şeirlərindən aydın olur ki, o, "Məclisi-üns»ün üzvü olmuşdur.

Məxfinin «Riyazül-aşiqin»də on dörd, «Təzkireyi Nəvvab»da (əlyazma nüsxəsində) on, «Azərbaycan ədəbiyyatı tarixi materialları»nda üç qəzəli getmişdir. Bunlardan başqa AMEA Əlyazmalar İnstitutunda saxlanılan müxtəlif cüng və məcmuələrdə onun Azərbaycan və fars dillərində yetmişdən artıq qəzəli vardır. İbrahim Tahir Musayevin arxivindəki bir

sənəddə Məxfinin «Hər bəhrdə və hər səpkidə şeirləri olduğu, amma divanı olmadığı» göstərilmişdir. Şairin dostu, onunla dəfələrlə müşairələrdə iştirak etmiş Nəvvab isə Məxfinin türkcə və farsca divanı olduğunu yazmışdır.

AMEA Əlyazmalar İnstitutuna «Əhvalati-Qarabağ»* adlı bir əlyazmasının fotosurəti mühafizə olunmaqdadır[263]. 1888-ci ildə Şuşada yazılmış, on iki fəsildən ibarət olan bu əsərin birinci, ikinci fəsilləri və üçüncü fəsildən bir hissə qalmışdır. Odur ki, yarımçıq olduğundan onun müəllifi hələlik müəyyən edilməmişdir. Lakin əsərin məzmunundan məlum olur ki, onun müəllifi Mirzə Vəli Baharlının nəslindən olub, Qarabağ mahalı rəisinin dəftərxanasında qulluq etmişdir. M.Nəvvab və F.Köçərli, yuxarıda qeyd edildiyi kimi, Məhəmmədəli bəy Vəlizadənin Mirzə Vəli Baharlının nəvəsi olduğunu, Şuşa və İrəvanda dövlət qulluğunda işlədiyini və nəsrlə də əsər yazdığını qeyd etmişdir. Biz güman edirik ki, «Əhvalati-Qarabağ» əsəri Məhəmmədəli bəy Məxfinin qələmindən çıxmışdır.

Böyük maarifçi H.Zərdabinin «Əkinçi» qəzetində M.F.Axundov, N.Vəzirov, Hacı Rza Dilməqani Əhsənül-Qəvaid, S.Ə.Şirvani və başqa tanınmış ziyalılar kimi, M.Məxfi də iştirak etmişdir. Həmin illərdə İranda şah recimi zülmündən dilənçi vəziyyətinə düşmüş kənd və şəhər yoxsulları axın halında vətənlərini tərk edərək, Rusiya, Türkiyə və Avropa ölkələrinə gedir, çətinliklə iş taparaq, bir təhər ailələrini dolandırırdılar. 1875-ci ildə Nəsrəddin şah Avropa səfərindən qayıtdıqdan sonra bu axının qarşısını almaq üçün xüsusi fərman verməyə məcbur olmuşdu. Həmin ildə İrəvanda qulluqda olan M.Məxfi «Əkinçi» qəzetinin oxucularına bu

---

* Bax: Qarabağnamələr. II kitab (tərtib edəni və çapa hazırlayanı: N.Axundov). Bakı, Yazıçı, 1991, s. 269-308 **(red. – V.M.)**

[263] ƏYİ, 19929. Həmin əsər haqqında ilk məlumatı Əlyazmalar İnstitunun sabiq əməkdaşı mərhum Sulduz Rüstəmov vermişdir. Bax: Respublika Əlyazmalar Fondunun əsərləri. II c. Bakı, 1963. (N.Q)

haqda məlumat verərək yazmışdı: «İranın Qarapapaq tayfasından beş yüz ailə Osmanlı dövlətinin Şoragil adlı yerinə köçüb. Şah əmr edib ki, onlar İrana köçsünlər. Bunu şah Avropaya səfərdən sonra edib ki, zülm əlindən ölkədən qaçanlar qayıdıb asudə yaşasınlar[264]». Məxfi məqaləsinin sonunda yarı kinayə ilə belə deyirdi: «Ümidvarıq ki, şahın bu binagüzarlığından sonra İran dövlətinin rəiyyətləri hakimlərin zülmündən xilas olub, sair dövlətlərin rəiyyətləri kimi öz vətənlərində kəsbkarlıqla məşğul olsunlar».

Klassik poeziyanın qayda-qanunlarına dərindən bələd olan Məxfinin qəzəllərinin dili şirin, sadə və axıcıdır. Bunlarda klassik qəzəl canrının bütün gözəl xüsusiyyətlərinə rast gəlmək mümkündür.

Məxfi qəzəllərində həyat və dünyəvi hisslər tərənnüm olunur. Onun vəsf etdiyi gözəllər huri, mələk kimi əfsanəvi surətlər deyil, həqiqi hiss və duyğuları olan canlı insanLardır.

Məşuqəsindən nə qədər cövr, sitəm görür-görsün Məxfinin təsvir etdiyi aşiq:

*Çıxsa yarın möhnətü dərdi bu canımdan mənim,*
*Nə gərəkdir ta mənə bu cismü bu can, ey təbib*[265].

Deyərək sevgilisinin möhnət və dərdini canı üçün fəxr bilir. Məxfinin ən çox sevdiyi şairlərdən biri Füzuli olmuşdur. Onun qəzəllərində Füzuli təsiri aydın görünməkdədir. Lakin Məxfi Füzulidən aldığı ideyanı eyniylə təkrar kimi yox, özünə məxsus bir orijinallıqla ifadə etmişdir. Məsələn, Füzulinin Məcnunu Allaha müraciət edərək özünü «bəlayi-eşq ilə aşina qılmasını, bir dəm bəlayi-eşqdən ayırı etməməsini» iltimas edirsə, Məxfinin aşiqi təbibə müraciət edərək deyir ki, «yarın dərdü möhnətin canımdan çıxarma, onsuz bu cism, bu can mənim nəyimə gərəkdir».

---

[264] "Əkinçi" qəzeti, 1875, 18 noyabr, N 4.
[265] ƏYİ, 867, vər. 125 a.

Məxfinin qəzəllərində giley-güzar, həsb-hal əsasən iki surət - aşiqlə məşuq arasında gedir. Şairin təsvir etdiyi aşiq «təriqi-eşqdə» sabitqədəmdir, vəfalıdır. O, məşuqəsinin işvə-nazına, «cövrü cəfasına» mərdliklə dözür, hətta bu dəyanəti ilə fəxr edir. Lakin bir şeyə tab gətirə bilməyir. O da sevgilisinin möhnəti-hicranıdır. Bütün həyatını yarına həsr edən, onsuz yaşamağın lazım olmadığına qərar verən aşiqin qəlbi həmişə intizarda, gözləri yoldadır.

*Tikmişəm göz yollara, can intizarındır sənin,*
*Kəsməzəm göz yollarından, gər gedə göz qarəsi*[266].

Məxfinin bütün ədəbi irsi əldə edilmədiyindən onun kəskin ictimai məzmunlu əsərləri olub-olmudığını demək çətindir. Lakin əldə olan aşiqanə qəzəllərində ötəri də olsa belə motivlərə rast gəlinir. Üstüörtülü şəkildə olsa da, şair yeri gəldikcə zəmanədən, yaşadığı mühitdən, o zaman Qarabağda olan haqsızlıqlardan narazılığını biruzə vermişdir. Açıq fikirli şair özünə bir həmdəm tapmır. Hər kəsin öz dərdi-sərinin harayında olduğu bir diyarda o heç kimi şad görmür. Bu cəhətdən Məxfinin aşağıdakı misraları səciyyəvidir:

*Məhşərə qaldı könüldə qəmi-dil,*
*Tapmadım bir kəs ola həmdəmi-dil.*

*Hər kəs öz boynuna bir qeyddədir,*
*Görmədim aləmara xürrəmi-dil.*

*Hiç kəs bilmədi dil mülkü nədir,*
*Qeyri aləmdi, bəli, aləmi-dil*[267].

---

[266] ƏYİ, B – 867, vər. 124 b.
[267] Yenə orada, vər. 131 b.

Bu cür şikayət motivləri onun məhəbbət mövzusunda yazılmış bəzi qəzəllərində də özünü göstərir. O, qəzəllərindən birinin son beytini belə tamamlayır:

*Bu Qarabağdə xoş keçmədi övqati-əziz,*
*Nə durubsan, başını, Məxfi, götür bir yana qaç*[268].

Dövründən narazı elə bir yer axtarır ki, orada «şah ilə gəda» bir olsun. Onun fikrincə, belə bir yerdə, belə bir məclisdə hiylə, riyakarlıq olmaz:

*Görgəc ol meyxanədə həmbəzmdir şahü gəda,*
*Eylədim təşxis kim, yox orda bir zöhdü riya*[269].

Məxfinin qəzəllərində işlənən ərəb-fars tərkiblərinin çoxu dilimizdə vətəndaşlıq hüququ qazanmış sözlərdir. Onun qəzəllərinin əksəriyyəti sadə, anlaşıqlı və rəvan dildə, oynaq bəhrdə yazıldığından ilk dəfədən yadda qalır. Bu cəhətdən aşağıdakı beytlərə nəzər salaq:

*Köksüm üstə çəkilən yar oxunun yarəsidir,*
*Sinəmə bir də bir ox vursa, onun çarəsidir.*

*Yarı bimar eşidib, canımı qurban demişəm,*
*Necə qurban deməyim, gözlərimin qarəsidir*[270].

Şairin qəzəllərində oxucunu vəcdə gətirən, həm də mənaca bir-biri ilə bağlanan belə misra və beytlər istənilən qədərdir.

Məxfi klassiklərdən Füzulinin, Hafizin, müasirlərindən isə Natəvan və başqalarının qəzəllərinə nəzirələr yazdığı kimi,

---

[268] Yenə orada, vər. 128 a.
[269] Yenə orada.
[270] Yenə orada, vər. 130 a.

“Məclisi-üns»ün üzvlərindən Həsən Qarabaği, Mirzə Ələsgər Növrəs, Məmo bəy Məmai, Bəhram bəy Fədai və Hacı Abbas Agəh də onun qəzəllərinə nəzirələr demişlər.

### Məmo bəy Məmai

“Məclisi-üns»ün tanınmış şairlərindən olan Məmo bəy Məmai haqqında ilk dəfə məlumat verən M.M.Nəvvabın yazdığına görə, onun 1892-ci ildə əliyyə yaxın yaşı olmuşdur[271]. Buradan da şairin təxminən 1842-ci ildə anadan olduğu müəyyən edilir. Prof. F.Qasımzadə isə şairin 1834-cü ildə doğulduğunu göstərir[272]. Bizcə bu tarixlərdən Nəvvabın yazdığı daha düzgün hesab edilməlidir. Belə ki, Nəvvab öz təzkirəsində Məmai haqqında məlumat verdikdən sonra elə həmin vərəqdən (M-67, vər. 215 b) başlayaraq avtoqraf kimi yadigar olaraq şairin bir neçə şeirini özünə yazdırmışdır. Çox güman ki, yaşının neçə olmasını da təzkirə müəllifinə o, özü demişdir.

Təlim-tərbiyəsini Şuşada alan Məmo bəy fars, ərəb dillərini öyrənmiş, Şərq ədəbiyyatına dərindən bələd olmuşdur.

Sövdəgərlik edən Məmo bəy bir müddət ticarətlə əlaqədar olaraq Aşqabad, Səmərqənd, Peterburq, Şimali Qafqazı, həmçinin Türkiyə və İranın bir sıra şəhərlərini gəzMişdir. Onun pərakəndə halda qalan əlyazmaları içərisində Bakı milyonçusu H.Z.Tağıyevə yazıldığını güman etdiyimiz bir məktubu vardır. Bu məktubdan məlum olur ki, o, gəzdiyi yerlərdə gördüklərini, söhbət etdiyi sahib-kamal şəxslərdən eşitdiklərini qələmə alaraq «Səyahətnamə» adlı bir əsər yazmışdır. Məktubun bir yerində deyilir: «Bu axır vəqtdə yazdığım «Səyahətnamə» ki, öz səyahətimdən ibarətdir, o kitabda hər şəhərdə rüəsayi-millət ilə görüşüb etdiyim gəftguni və onların keyfiyyəti-halların, əhval və məqalın səbt edib,

[271] ƏYİ, M – 67, vər. 215 b.
[272] Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. Bak, 1966, s. 385.

yaxşıların tovsifi-mədh və pislərin qəth etmişəm, oxuyanlar üçün məzəmmətdən ibrət və mədhdən ləzzət olsun»[273].

Təəssüf ki, bu maraqlı əsər hələlik əldə edilməmişdir.

Məmai “Məclisi-üns»lə yanaşı, tez-tez “Məclisi-fəramuşan»da da iştirak edər, onun rəhbəri M.M.Nəvvabla müşairələr keçirərdi. O, bir neçə dəfə Şamaxıya gəlmiş, «Bey-tüs-Səfa»da və məşhur musiqişünas Mahmud ağanın məclislərində iştirak etmişdir[274]. Şamaxı şairi Mirzə Əbdüləli Hilalinin (Rövzəxan) “Məclisi-üns»ə göndərdiyi mənzum məktublarından birində Məmai haqqında dediyi xoş sözlər bu iki şəxsin yaxın dost olduğunu göstərir[275].

Gəncliyində aşiqanə qəzəllər yazan Məmainin yaradıcılığında getdikcə ictimai motivlər güclənir, dünyagörüşü inkişaf etdikcə həyati məsələlərə daha çox meyil edir.

Peterburqa səyahət zamanı Məmai orada Olqa Sergeyevna adlı bir nəfər qadınla tanış olmuş, ona farsca bir şeir ithaf etmişdir. Şeirin müqəddiməsindən aydın olur ki, Olqa Sergeyevna imperator sarayına yaxın olan, Şərq ölkələri, xüsusən Qafqaz müsəlmanlarının tarixi ilə maraqlanan qadın olmuşdur. Məmai Peterburqda olarkən xüsusi məqsəd üçün O.Sergeyevnanın hüzuruna getmiş, həmin şeirini ona oxumuşdur. Məmai «elm, fəzilət, kamal sahibi» olan Olqa Sergeyevanın ərəb və farsca savadlı olduğunu göstərir və qeyd edir ki, «ona Rusiyada Olqa Sergeyevna, İstanbulda isə Gülxanım deyirlər. Həmişə müsəlmanların irəli getməyinə səy və kuşiş edir»[276]. Məmainin yazdığına görə, əri imperator sarayının xidmətçilərindən olan O.Sergeyevna hər il İstanbula gedib, orada Türkiyə sultanı ilə görüşür, məsləhət və məşvərətlər edir.

---

[273] ƏYİ, B – 1478, vər. 47 a.
[274] ƏYİ, D – 306, vər. 217 a.
[275] ƏYİ, B – 724, vər. 70 a.
[276] ƏYİ, B – 724, vər. 5 a- 5 b.

O.Sergeyevnaya həsr etdiyi şeirində gah elm-sənət karvanının ardınca qaçan, gah İran və Ruma səfər edən şair öz millətini xar və zəlil görəndə yaşamağı belə özünə ar bilərək yazırdı:

گهی گریان گهی نالانم     گهی افتان گهی خیزانم
نیست در دهر کسی دادرسم     هیچ کسم نیست من هیچ کسم
باخبر نیست کس از علم دل     که رو آرم و گویم غم دل
دل پر از مهنت و اندوه و ملال     مانده ام بیخود و آشفته خیال
نکته ها دارم در دل پنهان     نتوان شرح نمایم به اعیان
گر نه گویم نتوان جان میسوزد     و گر بگویم دهان میسوزد[277]

*(Gah sızlayar, gah ağlaram,    Gah yıxılar, gah qalxaram.*
*Dünyada dad-rəsim yoxdur,  Heç kiməm, heç kəsim yoxdur.*
*Kimsə bilməyir halımı,           Kimə deyim məlalımı?*
*Möhnətlə dolmuş ürəyim,      Dərdliyəm, yoxdur köməyim.*

*Qəlbimdə gizli sirlər var,        Söyləyə bilmərəm aşkar.*
*Əgər desəm, ağzım yanar,      Deməsəm, canım odlanar).*

Ürəyi dərd-qəmlə dolu şair narahatdır. O qorxur ki, milləti, xalqı üçün bir şey etməmiş ömrü sona yetə, arzuları qəlbində qala. Xalqının «heyran və sərgərdan» qalması, «millətin qabağında gedənlərin» onu irəli aparmaması şairi həmişə düşündürmüşdü: Fikri-zikri yeyib-yatmaq olan millət başçılarını tənqid edərək şair yazmışdı:

خورد و خواب است مگر فکر انسانی؟
این صفت هست به هر هیوانی[278]

*(Yeyib-yatmaq üçün yaşayır insan?*
*Bu xasiyyətə malikdir hər heyvan).*

---

[277] Yenə orada, vər. 5 a.
[278] Yenə orada.

Sonra Məmai həmvətənlərinə müraciətlə deyirdi ki, «Ey dənə və suya giriftar olan, bu dən sənə tələ, su isə dərya selidir. Müqəddəs gülşənin quşu, nə üçün canına giriftarsan? Vətənin üstünə qanad sər, axı sən vətənin əzizisən!»

Vətənin, vətən övladının halına ağlayan şair Olqa Sergeyevnaya müraciət edərək deyirdi: «Ey mənim ürəyimin ümidi, səndən başqa mənim bu müşkül dərdimi heç kim həll etməz». Şairin dərdi isə xalqın birliyi idi. Bu birliyi isə o, müasiri olduğu maarifçilər kimi elm və təhsildə görürdü:

اتحاد اول آخر علم است
مایه هر دو تلاش هلم است[279]

*(Bil ki, əvvəl-axır ittihad elmdədir,*
*Hər iki təlaşın mayəsi helmdədir).*

Məmai elmi aydın işıqlı, fəzl və hünərin sərmayəsi, bütün xəbərlərin qapısı adlandırır və göstərirdi ki, insanın zinəti, yaraşıq və bəzəyi libasda yox, onun elmindədir. Şair yaponların «36 il bundan əvvəl vəhşi oluqlarını», sonra məktəb açmaları, elm öyrənmələri, «mətləblər kəşf etmələri» sayəsində çinliləri zəlil etmələrinin səbəbini də elmdə görürdü.

Zəmanədən şikayət, ictimai həyatdan narazılıq, yaşadığı Şuşa şəhərində haqq-ədalətin yerli-yerində olmaması Məmaini daim düşündürən məsələlərdən olmuşdur. Bu cəhətdən onun aşağıdakı şeiri səciyyəvidir:

بخت بد کرد وطن در شیشه
مانده جان در تن و تن در شیشه
میکند خلق رسنبازیها
ا ژدرها گشته رسن در شیشه[280]

[279] ƏYİ, B – 724, vər. 5 b.
[280] ƏYİ, B – 1294, vər. 46 a.

*(Bədbəxtliklər Şuşada məskən salmış,*
*Canım təndə, tənim şüşədə qalmış.*
*Camaat başlamış kəndirbazlığa,*
*Kəndir də Şuşada əcdaha olmuş).*

Birinci dünya müharibəsində dünyanın od içində yanması, milyonlarla insanların nahaq tökülən qanları şairi bir an rahat buraxmayırdı.

Özlərini mədəni hesab edən Avropa müstəmləkəçilərinin Asiya və Afrikanın müxtəlif yerlərində apardıqları işğalçılıq siyasətinə çıxan şair yazırdı:

*İngilisə fədadı Hindustan,*
*Alciri qırdırır Firəngistan.*
*Bir tərəfdə Marakkodur pamal,*
*Farsa sahib tapılmayır əlhal.*
*Qalıb avarə dövləti-İran,*
*Dağılıb sərbəsər, qalıb viran.*
*İngilis bağlayıbdır Əfqani,*
*Tabei-əmr eyləyib xani*[281].

Vaxtilə dünya mədəniyyəti xəzinəsinə İbn Sina, Firdovsi, Nizami, Nəsirəddin Tusi, Xəyyam, Sədi və başqa dahilər bəxş etmiş Şərqin indi xaricilərə möhtac olmasına təəssüflənirdi. O, Şərqə müraciətlə yazırdı:

ای شرق، چه شد این همه فضل هنر و علم؟
ای هند، چه شد فیل تو با تخت زر و تاج؟
تو مطلع فضل هنر و علم و کمالی
اینها بکجا رفت، چرا گشته ای محتاج؟
فرمود ممایی این همه دولت علم است
علم است ستاند ز همه خلق جهان باج[282]

[281] Yenə orada, vər. 49 a.

*(Ey Şərq, necə oldu sənin ol elm ü hünərin?*
*Ey Hind, nə oldu fil bəzəyi qızıl taxt u tac?*
*Sən ki hünər ü elm ü kamal məskəni idin,*
*Bunlar hara getdi, nə üçün qalmısan möhtac?*
*Məmai deyir, hamısı elmin dövlətidir,*
*Dünya xəlayiqi cümləsindən elm alar bac).*

Getdikcə maarifçilər zümrəsinə yaxınlaşan şair vaxtilə şahlar «nişiməni» olan Hindistanın qərblilər tərəfindən işğal edilməsinin elm sayəsində mümkün olduğunu düşünürdü. Yer üzünü qana qəltan edən, neçə-neçə şəhərləri xarabazara döndərən müharibələrə qarşı çıxan şair bir qitəsində yazırdı:

امروز همه روی زمین پرخون است
از خون ابن بشر گلگون است
افتاده بروی خاك مليون جانها
ويرانه شهرها ز حد افضون است
مخلوق همه به يكديگر در جنگند
بر كشتن يكديگر ممنون است
عقل از همه مردمان عالم رفته
يا رب، همه جهان مجنون است[283]

*(Bu gün yer üzü dolu qan olubdur,*
*Zəmin qandan gültək əlvan olubdur.*
*Milyon canlar düşübdür torpaq üstə,*
*Həddən çox şəhərlər viran olubdur.*
*Hərb edir bir-biriylə cəmi məxluq,*
*Hamı öldürməkdən şadman olubdur.*
*Ağıl tərk edibdir cümlə cahanı,*
*Ya Rəbb, insan əqli talan olubdur).*

---

[282] ƏYİ, B – 1294, vər. 16 b.
[283] ƏYİ, B – 1294, vər.  16 b.

Məmaini düşündürən, narahat edən məsələlərdən biri də azərbaycanlılarla ermənilər arasında meydana gələn milli ədavət idi. O, bir müxəmməsində Şuşada baş vermiş qırğına, tökülən qanlara, dağıdılan evlərə acıyır, dönə-dönə əfsuslar edir:

*Düşdü yadıma keçən günlərim, əfsus olsun,*
*Bizi məyus edəni dəhrdə məyus olsun!*[284]

Məmai hesab edirdi ki, həmin fitnə-fəsadı törədənlər «Rumdan» (Türkiyədən – N.Q.) gələn erməni daşnaklarıdır. «Vətən dərdi çəkən ağıllı bir nəfərin» olmadığı, «bu işlərə bir tədbir tökülmədiyi», «dumadakıların isə heç bir əncam görmədiyi» bir zamanda şair xalqı birləşib, «zağ u zəğənləri vətən gülşənindən qovmağa» çağırırdı.

Məmai bir neçə dəfə bu mövzu üzərinə qayıtmış, farsca yazdığı şeirlərində də bu məsələyə toxunmuşdur:

ای چرخ، چه شعبده برپا نموده
آفاق پر ز فتنه و قوعا نموده
این شهر شیشه که بسای بهشت بود
آتش زده خراب سرا پا نموده

*(Ey fələk, nə fəsad bərpa eylədün,*
*Aləmi fitnəvü-qovğa eylədün.*
*Bu cənnət Şuşanı xərabə qoydun,*
*Onu atəşə mübtəla eylədün).*

Əlində imtiyazı olanlardan əziyyət, etinasızlıq, hiylə və riyadan başqa bir şey görməyən şair qəzəllərindən birində yaşadığı mühiti belə xarakterizə olurdu:

---

[284] ЯЙИ, Б-1478, вярягляр нюмрялянмяйиб, пяракяндядир.

*Vəh, necə gərdiş eylər çərxi-kəc, rəftar kəc*
*Əsr kəcdir, dövr kəc, dövrani-bədkirdar kəc.*

*Doğruluq olubdur mərdümə afaqdən,*
*Qövl kəcdir, fel kəc, kirdar kəc, götar kəc.*

*Qalmayıb dadü sitəd əhlində əsla düz əməl,*
*Müştəri kəc, sud kəcdir, taciri-bazar kəc*[285].

Məmai elə bir cəmiyyətdə yaşayırdı ki, sədaqət, rəhm, mürüvvət, insaf əvəzinə hər addımda xəyanət, zülm, haqsızlıq, qətl-qarətə rast gəlirdi. O belə insanlarla yaşamaqdansa, vəhşilərlə yoldaş olmağı üstün tuturdu. Şair bir şikayətnaməsində yaşadığı zəmanəni ittiham edərək yazmışdı:

*Ey zəmanə, ey zəman, ey dövr, dövri-hiyləbaf,*
*Ruzigar, ey ruzigar, ey əsr, əsri-ixtilaf!*

*Hübbi-qövmü ittihadi xəlqdən mədum edib,*
*Ehtiramü izzətü namusidən qıldın məaf.*

*Əhli-fəzlü elmi xamuş eylədin afaqdə,*
*Cahilü nadanü nakəslər edər lafü kəzaf.*

*Bu nə ölməkdir, nə öldürmək, nə qan tökmədi bu?!*
*Bu nə cəng, nə cədəldir, bu nə qovğa, nə məsaf?!*

*Qan ilə ləbriz olub Qafqazü Elburz ilə Qaf,*
*Hər şəhərdən qətlü qarətdir gəlir bir telqraf.*

*Gecələr cəngü cədəldir, sübh sülhü aşti,*
*Gör nə bazi eyləyir nərradi-çərxi-hiyləbaf*[286].

---

[285] ƏYİ, B – 1294, vər. 7 a.
[286] ƏYİ, B – 1293, vər. 21 a.

Məmai M.P.Vaqifin «Bax» rədifli müxəmməsinə bənzətmə olaraq M.R.Fənaya yazdığı bir qitəsində zəmanədəki qarışıqlığı, nahaq qanlara bais olan fitnə-fəsad əhlini, dünya malından ötrü bir-birinin canına qəsd edənləri tənqid edərək yazırdı ki, ortaya bir əhli-ürfan çıxdıqda, bir savadlı, elmli yetişdikdə fitnə-fəsad əhli dərhal onun qətlinə fitva verir. Vay o gündən ki, ərbablar bir yerə toplaşsınlar. Onlar şəxsi-qərəzlik və mənasız söhbətlərdən başqa bir şey bilməzlər. Bu şəxsi-qərəzlik isə milləti pamal eləmişdir.

*Alim əfsad eyləsə aləm fəsad ilə dolar,*
*Düzdü rəhzənlər geyinmiş cameyi-əlayə bax.*

*Pişvalər düzdlər olmuş, müxənnətlər rəis,*
*Karbari-qövmü gör, əlayə bax, ədnayə bax.*

*İttihadü ittifaqə cümlə aləm səy edər,*
*Bir-birilə Şişədə xəlq etdiyi qovğayə bax*[287].

Məmai cəmiyyətin bir sıra eyiblərini düzgün təsvir və tənqid etsə də, o, bəlaların əsl səbəbkarı mövcud ictimai quruluşun özü olduğunu dərk edə bilməyirdi.

Məmai yaradıcılığının əsas hissəsini aşiqanə qəzəllər təşkil edir. Sadə və anlaşıqlı dildə yazılmış bu qəzəllərdə nə qədər orijinal fikir və ifadələr varsa, o qədər də Füzulinin təsiri aydın görünməkdədir.

“Məclisi-üns»ün dağılması, əlçatmaz gənclik itllərinin həsrəti, şeir-sənət dostlarının çoxunun həyatdan getməsi bir zaman vaxtını ariflər məclisində ruhani söhbətlərlə keçirən şairə ömrünün qoca çağlarında ağır təsir bağışlayır. Belə bir vaxtda

---

[287] ƏYİ, B – 1293, vər. 10 a.

onun «nə bir yanına gələn var, nə bir halını soran. «Bir guşeyi-bağ içrə bikəs və tənha» qalan şair keçən günlərini xatırlayaraq yazırdı:

*Bir bikəsi-zarəm vətənimdə, vətənim yox,*
*Bir bülbüli-bibalü pərəm, vay, çəmənim yox.*

*Mən sahibi-hər məcməi, hər əncümən oldum,*
*Əfsus nə bir cəm, nə bir əncümənim yox.*

*Viranə qalıb «Məhfili-üns»üm, dağılıbdır,*
*Nə yar, nə qəmxar, nə bir həmsüxənim yox.*

*Bir guşeyi-bağ içrə qalıb bikəsü tənha,*
*Nə bir soran əhvalımı, nə bir gələnim yox...*

*Göz ilə qulaqdan çəkərəm zəhməti-bihədd,*
*Ruhani-əziyyətlər üçün tabü tənim yox*[288].

Məmai 1918-ci ildə təxminən 76 yaşında vəfat etmişdir. Lakin B.Məmmədov yanlış olaraq onun 1892-ci ildə vəfat etdiyini yazır[289].

Təəssüf ki, bu maraqlı şairin bütün əsərləri əldə edilməmişdir.

---

[288] ƏYİ, B – 724, vər. 34 a.
[289] Bax: "Azərbaycan gəncləri" qəzeti, 1965, 1 avqust, N 91.

## VII Fəsil

## «MƏCLİSİ-FƏRAMUŞAN»

“Məclisi-üns» Qarabağda xüsusən Şuşada yaşayan şairlərin hamısını əhatə etmirdi. Ondan bir qədər sonra kənarda qalıb «fəramuş olanlar» (unudulanlar) da xüsusi bir məclis təsis etməyi qərar alır. İlk dəfə Abdulla bəy Asi, Əbülhəsən Şəhid, Mirzə Əbdül Şahin, Fatma xanım Kəminə, Həsənəli xan Qaradaği və qeyriləri Mir Möhsün Nəvvabın hücrəsinə toplaşıb[290], onun rəhbərliyi altında fəaliyyət göstərirlər. Beləliklə də, təxminən 1872-ci ildə Şuşada ikinci bir ədəbi məclis – “Məclisi-fəramuşan» təşkil olunur.

Nəvvab və Müctəhidzadənin təzkirələrində “Məclisi-üns»lə yanaşı, bu məclisin də adına rast gəlirik. F.Köçərli və H.Zeynallı da Qarabağ şairlərindən danışarkən onların iştirak etdikləri hər iki məclisin adlarını çəkmişlər. “Məclisi-üns»ün təşkilatçılarından biri olan M.R.Fəna öz xatiratında “Məclisi-fəramuşan»ın fəaliyyəti haqqında yazır: “Məclisi-üns»ə müqabil məscid hövzəsində bir məclisi-şüəra dəxi tərtib tapdı. Nəvvab Mir Möhsün ağa, Həsənəli xan Qaradaği, Məşədi Əyyub Baki məclisə daxil olmuş və son zamanlar şüəra Ağa Mirzə Cəlal, Səməd bəy, Bəhram bəy Fədai Vəzirov, Mirzə Əbdül Şahin, Həsən Qara Hadi, Mirzə İbrahim Tahir, Mirzə Fatı xanım Kəminə»[291].

---

[290] ƏYİ, Arx. 26, inv. 316, vər. 54 a; M.R.Fənanın “Məclisi-üns” adlı xatiratı. ƏYİ, 14, Q – 1 (3), 7068.
[291] Yenə orada.

Məmmədəli Tərbiyət də Seyid Əzimdən bəhs edərkən «Beytüs-Səfa» ilə yanaşı, “Məclisi-fəramuşan»ın adını çəkmiş, bu məclislər arasında məktublaşma olduğunu göstərmişdir[292].

«Azərbaycan tarixi» kitabında XIX əsrin ikinci yarısında poeziyadan bəhs edilərkən həmin dövrdə yaranan məclislər sırasında “Məclisi-fəramuşan»ın da adı çəkilir.

Mərhum H.Səmədzadənin arxivində saxlanılan bir sənəddə belə bir qeyd vardır: «… 1872-ci ildə Şuşa şəhərində «Məhfili-üns» adlı ədəbi cəmiyyət təşkil edilmişdi[293]. Həmin illərdə Mir Möhsün Nəvvab tərəfindən yenə Şuşada “Məclisi-fəramuşan» adlı ikinci ədəbi cəmiyyət təşkil olunmuşdu. “Məclisi-üns»ə aristokratiyaya məxsus inteligensiya toplandığı halda, “Məclisi-fəramuşan»a aşağı təbəqənin ədəbiyyat maraqlıları yığılırdı»[294].

Heç bir mənbədə başqa məclislər kimi “Məclisi-fəramuşan»ın da bütün üzvlərinin adlarına təsadüf edilmir. Onun iştirakçılarını ancaq Şuşa şairlərinin şeirlərindən, onların digər şəhərlərdəki şairlərlə olan məktublaşmalarından və başqa qeydlərdən müəyyən etmək mümkündür. Məsələn, Nəvvab farsca divanında qeyd etmişdi ki, Məşədi Cəfərqulu Kərbəlayi İrahim oğlu, «Tarixi-Qarabağ»ın müəllif Mirzə Camalın oğlu Mehdi bəy və Hacı Məşədi Əli oğlu da “Məclisi-fəramuşan»ın üzvü olmuşlar. O, bu divanda həmin şəxslərin vəfatı münasibətilə dediyi maddeyi-tarixlərin əvvəlində yazmışdır: «Fəramuşan»da Nəvvabın dostu olan şəxslərin maddeyi-tarixləri». Bu qeyddən sonra Nəvvab şeirlərində Əbülbərəkat deyə adını çəkdiyi Məşədi Cəfərqulu Kərbalayi İbrahim oğlunun 1314 (1896), Mehdi bəy Mirzə Camal oğlunun 1305

---

[292] Məmmədəli Tərbiyət. Danişməndani – Azərbaycan. Bakı, 1987, s. 301.
[293] ƏYİ, Arx. 21, Q – 15 (345). Burada “Məclisi-üns”ün təşkil tarixi düzgün göstərilməmişdir.
[294] Yenə orada.

(1887) və Hacı Əmir Məşədi Əli oğlunun 1305 (1887-ci ildə) vəfat etdikləri tarixi nəzmlə qeyd etmişdir[295].

Müxtəlif sənədlərdən aşağıdakıların "Məclisi-fəramuşan»ın iştirakçıları olduqlarını müəyyən edə bildik:

Mir Möhsün Nəvvab (1833-1919), Abdulla bəy Asi (1841-1874), Həsənəli xan Qaradaği (1847-1929), Mirzə Əbdül Şahin (1849-1900), Məşədi Əyyub Baki (1866-1909), Fatma xanım Kəminə (1840-1898), Abdulla bəy Abış, Baxış bəy Səbur (1863-1931) və qardaşı Bəhram bəy Fədai, Mirzə Muxtar (1866-1912), Məşədi Məhəmməd Bülbül[*] (1863-1918), Molla Xəlil Şaki, Mirzə Məhəmməd Katib (1833-1889), Həsən Qara Hadi (1826-1900), Xarrat Qulu Yusifi (1823-1883), Mirzə Hüseyn Salar (?-1876), Mirzə İsmayıl Məhzun (1821-1894), Nazim, Mirzə Əli Aşiq (1846-1894), Müznib, Sabit, İbrahim bəy Azər (1836-1885), Məşədi Cəfərqulu (?-1896), Mehdi bəy (?-1887), Hacı Əmir (?-1887), Kərbəlayi Ələkbər Safi, Mirzə Sadıq Lətif oğlu Hicri (təbib), Mirzə Sadıq İmanxan oğlu (xanəndə) Piran (1811-1892), Məşədi İsi, Hacı Hüsü, Sadıqcan, Mirzə Ələsgər Növrəs, Nəvvabın müəllimi Molla Abbas (1831-1880), Mirhəsən Miriş (Nəvvabın oğlu, 1871-1948), Mirzə Əli Mühərrir, Sədi Sani (1854-1879) və qeyriləri.

"Məclisi-fəramuşan»ın adı haqqında Nəvvab avtoqraf təzkirəsində belə yazmışdır: «Fəramuşan» şairlərin və zəriflərin toplandığı Nəvvabın mənzilinin adıdır»[296].

Buradan görünür ki, məclisin yığıncaqları əksər vaxt Nəvvabın mənzilində keçirilmişdir. Həm də «zəriflərin toplandığı» qeydindən aydın olur ki, orada şairlərlə yanaşı, Şuşanın incə zövqlü arif şəxsləri də iştirak edərmiş. Nəvvabın və məclisin digər üzvlərinin şeirlərində rast gəldiyimiz adlardan məlum

[295] ƏYİ, B – 5234, vər. 105 b.
[*] Bax: Məşədi Məhəmməd Bülbül. Əsərləri. Bakı, Şuşa, 2008, 360 s. **(red. - V.M)**
[296] ƏYİ, M – 67, vər. 293 b.

olur ki, belə şəxslər əsasən musiqiçi və xanəndələrdən ibarət olmuşdur.

Nəvvab məclisin məşğələ günlərini qabaqcadan müəyyənləşdirər, onun üzvlərinə məktub göndərib yığıncağa dəvət edərdi.

Əvvəllər “Məclisi-üns» ilə “Məclisi-fəramuşan» arasında cüzi sərinlik olsa da, bu münasibət sonralar aradan qalxmış və səmimi dostluq əlaqəsi yaranmışdır. Hətta məclis üzvləri bir-birilərinə qonaq getmiş, yığıncaq və müşairələrdə iştirak etmişdilər. “Məclisi-üns»ün üzvlərindən Bəhram bəy Fədai, Mirzə Ələsgər Növrəs, Mirzə Cəfər “Məclisi-fəramuşan»ın yaxın iştirakçıları olmuşdular. Nəvvab həmişə Natəvanın hal-əhvalını soruşmuş, hətta onun «səsi-sədası» gəlməyəndə xüsusi məktub yazıb səbəbini xəbər almışdır. Başqa şəhərlərdən gələn məktublar, müzakirəyə ehtiyacı olan məsələlər hər iki məclisin müzakirəsindən keçər və birgə nəticəyə gələrdilər.

“Məclisi-fəramuşan» ilə “Məclisi-üns»ün bir şəhərdə olması onların arasındakı qarşılıqlı əlaqəni çox asanlaşdırmışdı. “Məclisi-üns»ün üzvlərindən bir çoxu “Məclisi-fəramuşan»ın rəhbəri, orta əsr Şərq elmlərini gözəl bilən Nəvvabla həmişə məktublaşmış, yaxın dost və yoldaş kimi hər bir məsələdə ondan məsləhət almışlar. Onlar Nəvvaba göndərilən mənzum məktubların çoxunda eşq, sədaqət, dostluq, riya, yalan, habelə fəlsəfə, hikmət, musiqi və sairədən bəhs açırdılar ki, bunlar da dövrün ictimai məsələlərini öyrənmək üçün müəyyən əhəmiyyətə malikdir. Onu da qeyd etmək lazımdır ki, “Məclisi-üns»ün suallarının çoxuna bir qayda olaraq Nəvvab özü cavab verərdi.

Bayram günlərində hər iki məclis üzvləri bir-birilərinin evlərinə gedər, mübarəkdarlıq edərdilər. Bütün yuxarıdakılar göstərir ki, H.Zeynallının bu iki məclisi nəzərdə tutaraq, «hər

iki məclis arasında saziş olmamış» əksinə, «yersiz bir rəqabət» hökm sürmüşdür iddiası[297] yanlışdır.

Məclisin məşğələləri əsasən Nəvvabın evində getsə də, bəzən onun üzvləri növbə ilə bir-birinin evlərinə toplaşar, öz məşğələlərini orada keçirərdilər. Nəvvab H.Qaradağinin bir avtoqraf şeirini öz təzkirəsinə tikmişdir. Həmin şeirdən görünür ki, 1894-cü ilin yanvar ayında məclisin növbəti yığıncağında yeddi nəfər iştirak etmişdir. Məşğələ qurtardıqdan sonra bunlar gələcək yığıncaq üçün növbə düzəltMişlər. Birinci növbə Rzaya, ikinci məşədi Cəfərqulu Əbülbərəkata, üçüncü Hacı Məhəmmədə, dördüncü qazi Molla Hüseynə, beşinci M.Ə.Bakiyə, altıncı Nəvvaba, yeddinci H.Qaradağiyə düşmüşdür[298]. Belə məşğələlərdə bütün xərci ev sahibi çəkirdi.

Arifanə söhbətlər olan belə məclislərin əsas mövzusu ədəbiyyat, şeir və musiqi idi. Burada klassiklərə xüsusi hörmət bəslənər, onlara böyük diqqət və maraq göstərilərdi.

Məclis şairlərinin çoxunun evində Sədi, Nizami, Cami, Nasir, Xosrov və başqa şairlərin əlyazmaları ilə yanaşı, müxtəlif təzkirələr də olurdu. "Məclisi-üns»ün üzvü Məmai dostu Xudadad bəyə göndərdiyi bir şeirində onu öz evinə dəvət edərək yazmışdı:

*Meyil etsən əgər kitabi-əşar,*
*Qövli-şüərayi-rastgöftar,*
*«Şahnamə»vü «Xəmseyi-Nizami»,*
*«Külliyyeyi-Sədi», «Səbha Cami»,*
*Mənzumeyi-fəxri-mülki-Şiraz,*
*Danayi-rümuzi-kaşifi-raz,*
*Xəmseyi-kütübi-Əmir Nasir,*
*«Atəşgədeyi» - Lətif hazir*

*Gəl bir neçə gün ənisim olgil,*

[297] ƏYİ, C – 208, vər. 42.
[298] ƏYİ, M – 67, Təzkireyi-Nəvvab. Vər. 163 a-b.

*Bu bəzmdə həmcəlisim olgil*[299].

Məclisdə müşairə və ədəbiyyata dair söhbətlərlə yanaşı, laədri (yəni müəllifi məlum olmayan) bir beyt və ya qəzəlin müəllifini təyin etmək üçün qızğın mübahisələr gedərdi. Belə də olurdu ki, əvvəllər deyilmiş bir qəzəli bu və ya başqa şair özünə aid edirdi. Bu da bəzi qəzəllərin yeknəsəkliyindən, məzmunca bir-birinə oxşarlığından irəli gəlirdi. Bir dəfə "Məclisi-fəramuşan»da M.Ə.Baki ilə Mirzə Əli Aşiq arasında bu xüsusda uzun mükalimə olmuşdur. Nəvvab yazır ki, «bir gün şairlər «Fəramuşan»da toplaşmışdılar. Bir fərd üçün Məşədi Əyyub Baki ilə Mirzə Əli Aşiq uzun mükalimə etdilər. O dedi: «Mən demişəm», bu dedi: «Mən demişəm». Axırda belə qərara gəldik ki, hər biri bədahətən bir fərd yazsınlar, hansı yaxşı düşsə və mübahisə edilən fərdə oxşasa bilərik ki, həmin şeir onundur. Hər ikisi fərd yazdılar. Bakinin fərdi oxşar oldu»[300]. Bakinin dediyi fərd budur:

*Xurşidə səcdə eyləmək, ey dil, səvabdır,*
*Torpağa düş ki, yarın adı afitabdır.*

Baki bundan sonra əlavə edərək dedi:

*Aşiq qoyan təxəllüsünü bu cənabdır,*
*Yüz şivə ilə yazdığı hədyan cəvabdır.*

Mirzə Əli Aşiq isə:

*Hədyan yazmağı bacarır şairani-dəhr,*
*Dərhəm olan bu Baki pür iztirabdır.*

---

[299] ƏYİ, M – 180, vər. 4 b.
[300] ƏYİ, M – 67, vər. 500 a.

beytini deyərək cavab verdi[301].

“Məclisi-fəramuşan»da şairlər müşairə zamanı deyilən qəzəli onun bəhr və təqtisinə müvafiq olaraq oxuyar və həmin ahənglə ayaqlarını yerə vurub ona uyğun səs çıxarardılar.

Şuşaya gələn şair və alimlər oradakı məclislərə gedər, arif və alim şəxslərin görüşündə olardılar. 1868-ci ildə ərdəbilli şair Ünqa Şuşaya gələrək, Nəvvabın görüşünə getmiş və hər ikisinin arasında müşairə olmuşdur.

“Məclisi-fəramuşan» şairlərinin bir yerdə toplaşması onlar üçün böyük bir şənliyə çevrilirdi. Nəvvab farsca yazdığı bir şeirində “Məclisi-fəramuşan»ı aya və günəşə, onun üzvlərini isə ulduzlara bənzətmişdi[302].

Biz yuxarıda Şuşa, Şamaxı və Bakı ədəbi məclislərində musiqiçilərin də iştirak etdiklərini qeyd etmişdik. Bu cəhətdən “Məclisi-fəramuşan» xüsusilə fərqlənirdi. Burada məclisin rəhbəri, Şərq musiqisi və onun tarixini gözəl bilən Nəvvab, bir çox məşhur Qarabağ xanəndələrinin müəllimi olmuş Xarrat Qulu Yusifi, Sadıqcan, Hacı Hüsü, Məşədi İsi kimsi xanəndələr, tarzənlər iştirak edirdilər. Nəvvab musiqiyə dair «Vüzuül-ərqam» əsərini məclisin fəaliyyəti dövründə yazmışdır. Şərq aləmində ilk dəfə tarın simlərini və pərdələrini təkmilləşdirən Sadıqcana və başqa xanəndələrə X.Q.Yusifin və Nəvvabın böyük təsiri olmuşdur. Şuşa ədəbi məclislərinin hər ikisində iştirak edən Məşədi İsi, Hacı Hüsü və başqaları musiqi sənətini məhz onlardan öyrənmişdilər.

Musiqi və xanəndələr beşiyi Qarabağda şairlərin əksəriyyəti ya müəyyən bir musiqi alətində çala bilmiş, ya da məlahətli səsə malik olmuşlar. Onlar musiqiçiyə və ifaçıya yüksək tələblə yanaşır, onları layiqincə qiymətləndirməyi bacarırdılar.

---

301 Yenə orada, vər. 235 b.

302 ƏYİ, B – 5234, vər. 44 a.

A.Asi musiqini insan tərki-dünyalığa,guşənişinliyə, inzivaya, dünya nemətlərindən imtina etməyə çağıran zahidin ehkamlarından üstün tuturdu:

*Zahida, guşeyi-məsciddə nəyim var mənim?*
*Bərbətü çəngü dəfü tarü neyim var mənim*[303]*!*

XIX əsrdə Qarabağda Bülbül təxəllüsü ilə tanınmış üç şəxsiyyət olmuşdur ki, onlara bu ləqəbin verilməsi məhz məlahətli səsləri ilə əlaqədar idi. Bunlardan biri Qarabağın məşhur xanəndələrindən Əbdülbagi Zülalovdur ki, Bülbülcan ləqəbi ilə tanınmışdır[*]. İkincisi Şuşa ədəbi məclislərində iştirak edən zəngilanlı şair Molla Saleh Bülbüldür. Nəvvabın yazdığına görə, Molla Saleh Bülbülün 1891-ci ildə təxminən qırx yaşı olmuşdur. Gözəl səsə malik olan Bülbül bir müddət rövzəxanlıq etmişdir[304]. Üçüncüsü isə "Məclisi-fəramuşan» üzvü Məşədi Məhəmməd Kərbəlayi İsmayıl oğlu Bülbüldür. Nəvvab 1891-ci ildə onun 28 yaşı olduğunu söyləyir[305].

Gözəl səsi olan Məşədi Məhəmməd Bülbül əvvəllər xanəndəlik etmişdir. O qəzəllərinin bir neçəsini Nəvvabın təzkirəsinə avtoqraf olaraq özü yazmışdır. M.M.Bülbülün əldə etdiyimiz kiçik divanında, həmçinin bəzi cüng və fraqmentlərdə olan qəzəllərdən aydın görünür ki, o, klassik ədəbiyyata dərindən bələd olmuşdur. Onun şeirlərinin dili rəvan, sadə obrazlıdır:

*O günlər kim, gözəl nəqşin qəza nəqqaşı çəkmişlər,*
*Səni ol cümlədən, ey məh, gözəllər başı çəkmişlər.*

---

[303] ƏYİ, fraqment 831, vər. 19 a.
[*] F.Şuşinski.
[304] ƏYİ, M – 67.
[305] Yenə orada.

*Gözəllər gözlərin gözlər həmişə çün yaman gözdən,*
*Onunçün zülfi qarasa göz üstə qaşı çəkmişlər.*

*Oğrular qəmzə can nəqdin, qara zülfün edər pünhan,*
*Qara oğru yatağında qara sirdaşı çəkmişlər*[306].

Göründüyü kimi, bu beytlərdə daxili təkrir, cinas elə yerində və ustalıqla işlənmişdir ki, misralarda azacıq da olsa ağırlıq hiss edilmir. Onun ayrı bir qəzəlində obrazlı ifadələr və poetik mənalandırma xüsusilə nəzəri cəlb edir:

*Ah, dövran mənə öz yarımı yar eyləmədi,*
*Yar həm tərki-məhəbbət qılıb, ar eyləmədi*[307].

Həmin qəzəlində məşuqəsinin vəfasızlığından şikayətlənən şair deyir:

*Vədə vermişdi – könül mülkünü abad etsin,*
*Bu xərab olmuşa bir ləhzə güzar eyləmədi.*
*Nəqşi-bad ilə o, su üzrə düşən nəqş kimi,*
*Söz verib bir nəfəs üstündə qərar eyləmədi*[308].

Burada incə müşahidədən doğan qüvvətli təşbih diqqəti cəlb edir. Əhdə vəfa etməyən məşuqəsinin dönüklüyündən gileylənən şair onun əhd-peymana sədaqətsizliyini su üstündə qərar tutmayan titrək nəqşlərə bənzədir.

Yeri gəlmişkən qeyd etmək lazımdır ki, XIX əsrdə Qarabağda Aşiq və Bülbül təxəllüsü ilə olduğu kimi, Sadıq ləqəbi ilə də tanınan üç şəxsiyyət məlumdur. Bunlardan birisi Mirzə Sadıq Lətif oğludur. Təxminən 1812-ci ildə Zəngilanda anadan olmuşdur. Gənc yaşlarında Təbrizə gedərək,

---

[306] Yenə orada, vər. 465 a.
[307] ƏYİ, fraqment 1299, səh. 13.
[308] ƏYİ, fraqment 1299, səh. 13.

zəmanəsinin Ərəstunu hesab edilən Mirzə Əbülhəsən həkimbaşıdan və bir nəfər alman həkimindən təbabət elmini öyrənib Şuşaya qayıtmışdır. Bir müddət Şuşada Dövlət məktəbində dərs demiş, uşaqlar üçün dərslik yazmışdır. «Riyazül-aşiqin» və «Təzkireyi-Nəvvab»da bir neçə qəzəli vardır. Mirzə Sadıq vaxtilə Hicri təxəllüsü ilə də şeirlər yazmışdır. M.Sadıq 1901-ci ildə vəfat etmişdir.

İkinci Mirzə Sadıq İmanxan oğludur. O, 1811-ci ildə Şuşada anadan olmuşdur. Gözəl səsi və xoş söhbəti ilə yoldaşlarının hörmətini qazanmışdı. O, şairliyi ilə yanaşı, həm də mahir xanəndə olduğu üçün həmişə vaxtını Qarabağ əyanlarının yanında keçirirdi. “Məclisi-üns»də «Şahnamə»ni əzbərdən və ucadan oxuyarmış. Mirzə Sadıq 1892-ci ildə Şuşada vəfat etmişdir. Onun Müctəhidzadə və Nəvvabın təzkirələrində bir neçə aşiqanə qəzəlləri və Tiflis gözəllərinin tərifinə dair bir şeiri vardır. Mirzə Sadığın Piran imzası ilə də şeirləri olmuşdur.

Üçüncüsü isə Sadıqcan ləqəbi ilə tanınmış Mirzə Sadıq Əsəd oğludur. Mirzə Sadıq Əsəd oğlu 1846-cı ildə Şuşada anadan olmuşdur. Əvvəllər xanəndəlik edən Sadıq sonralar şuşalı Ələsgərin yanında tar çalmağı öyrənmiş, şəxsi istedadı sayəsində dövrünün məşhur tarzəni kimi şöhrət qazanmışdır. Sadıqcan tarın qoluna bir neçə pərdə və sim artırmaqla onu xeyli təkmilləşdirmişdir. Sadıqcanın Hacı Hüsü, Məşədi İsi, Qaryağdı oğlu və başqalarından ibarət təşkil etdiyi ansambl dəfələrlə Natəvanın məclisində çıxış etmişdir[309].

Bütün ədəbi məclislər kimi “Məclisi-fəramuşan»ın da coşqun fəaliyyət dövrü baharda olurdu. Belə xoş aylarda şairlər tez-tez Şuşanın səfalı yerlərinə gedər, bir guşəyə çəkilib musiqi sədaları altında əylənər, müşairələr keçirərdilər. 1981-ci ilin baharında bir dəfə Nəvvab, H.Qaradaği, M.N.Lövhi və Baki Şuşa yaxınlığındakı mağaraya toplaşırlar. Rəvayətə görə,

---

[309] Şuşinski F. Böyük tarzən // Ədəbiyyat və incəsənət qəzeti, 1961, 9 dekabr, N 48.

vaxtilə İbrahim xanın xəzinəsi gizlədilmiş bu mağara sonralar təmir edilmişdir. "Məclisi-fəramuşan» üzvləri tez-tez oraya toplaşdıqları üçün həmin yer «Nəvvab mağarası» kimi şöhrət tapmışdır[310].

"Məclisi-fəramuşan» nəzdində Nəvvab və Hacı Hüsünün rəhbərliyi altında «Xanəndələr məclisi» adlı bir musiqi məclisi də fəaliyyət göstərirdi[311]. Məşədi İsi, Kaştazlı Haşım, Hacı Hüsü, İslam Abdullayev, Mirzə Muxtar, Malıbəyli Həmid və qeyri xanəndələr həmin məclisin üzvü olmuşlar.

1892-ci ildə Nəvvab zökəm olub yatan zaman Qaradağinin ona yazdığı mənzum məktub «Musiqi məclisi»nin üzvləri və onun toplanışı haqqında müəyyən təsəvvür yaradır:

*Harda qaldı Molla Vəli, bəs Məcid,*
*Hacı Hüsü, Məşədi İsi, ol Həmid,*
*Sadıqi-xoşnəvaz, Haşimü Cəmşid,*
*Bu qədər rəğəssə olubsan, ağa[312]!*

Görünür ki, Nəvvab naxoşluğu ilə əlaqədar olaraq bir neçə gün yuxarıda adları çəkilən xanəndə və musiqiçilər onlara cəm ola bilməmişlər. "Məclisi-fəramuşan»ın üzvlərinin bəziləri, xüsusən Şuşadan uzaqda olanlar vaxtlı-vaxtında toplanışlara gələ bilmədikdə şeirlərini müzakirə üçün məclisə göndərirdilər. Baxış bəy Səbur və onun qardaşı Bəhram bəy Fədai Dizaqda olduqlarından məclisə az-az gələrdilər, 1891-ci ilin dekabrında Nəvvab məktublarından birində Fədaini «Fəramuşan» əhlinə dost, özlərini qütb adlandırırdı. Fədai isə ona yazmışdı:

*«Fəramuşan» olub ərbabi-halə qibleyi-taət,*
*Ona vacibdi səcdə eyləmək biz əkbərü-əsğər.*

---

[310] ƏYİ, B – 2721, vər. 37 a.
[311] Şuşinski F. Segah İslam // Bakı qəzeti, 1968, 15 may, N 111.
[312] ƏYİ, M – 67, vər. 299 a.

*Xoşa hali-Qaradaği, xoşa Baki, xoşa Növrəs,*
*Olurlar müstəfeyz əltafınızdan hər zaman yeksər.*

*Mənim də var çox şövqüm hüzurunda olam daim,*
*Nedim, verməz müradım bir zaman gərduni-dunpərvər.*

*Fədai gərçi qaibdir neçə müddət hüzurundan,*
*Vəli ismi-şərifindir dilində sübhü şam əzbər*[313].

1890-cı illərdə Nəvvab "Məclisi-fəramuşan»a bir çox mənzum məktublar yazmışdır ki, bunları Baki, Abış, Kəminə, Şaki, Növrəs və qeyriləri eyni qafiyə və rədiflə istiqbal etmişlər. Bu məktublarən əksəriyyətinin məzmunları məclisin ümumi ideyasını-ilahi məhəbbəti və eşqi, vəhdəti-vücud ideyasını vəsf etməkdən ibarətdir. Onlar şeirlərində ayrı-ayrı din xadimlərini tənqid etsələr də, onun ehkamlarına sadiq qalmışdılar. Bu da, şübhəsiz, dövrün tələbindən və Nəvvabın yanında öyrəndikləri dini fəlsəfədən irəli gəlirdi.

Məclis üzvlərinin müşairələrində də ziddiyyətli cəhətlər özünü göstərir. Məsələn, Nəvvab:

*Aşiq oldum nagəhan bir şuxi-bipərvayə mən,*
*Saldım axir öz-özümü bir əcəb qovğayə mən*[314]

mətləli qəzəlində bir «qəddi tubadan ötrü rizvandan» keçdiyi halda qəzəlin məqtəsində:

*Çün məcazi eşqdən çəkdim əlim Nəvvab tək,*
*Bağladım sidqi-dil ilə rəhməti-üzmayə mən*[315]

---

[313] Yenə orada, vər. 288 a.
[314] Yenə orada, s. 150.
[315] Yenə orada, sə 150.

deyərək yenə də ilahi eşqə bağlı qalır. Nəvvabın bu qəzəlini istiqbal edən Abış, Baki və Kəminənin cavabları isə tamamilə seçilir. Onların istiqbalında ancaq həqiqi məhəbbət, dünyəvi eşq, bir-birlərinə olan şəxsi münasibətlər tərənnüm edilir.

Başqa ədəbi məclislərdə olduğu kimi, "Məclisi-fəramuşan» üzvləri də ancaq klassik üslubda, əruz vəznində yazmaqla məhdudlaşmamış, heca vəznində də gözəl şeirlər yaratmışlar. "Məclisi-üns» üzvü olmasına baxmayaraq, "Məclisi-fəramuşan»la əlaqəsini kəsməyən Növrəslə Nəvvabın bir-birlərinə yazdıqları mənzum məktubların bir neçəsi heca vəznindədir. Nəvvabın 1891-ci ildə göndərdiyi:

*Növrəs, nə yatıbsan qəflət içində,*
*Ağırlaşıb gözün, qanə dönübdür*[316]

misraları ilə başlanan şeirinə Növrəs də eyni vəzn və qafiyə ilə cavab vermişdir.

Bu da göstərir ki, XIX əsr ədəbiyyatında heca vəznində şeirin güclənməsi klassik üslubda yazan ədəbi məclis şairlərinin bir çoxuna öz təsirini göstərmişdir. «Fövcül-füsəha»da M.İ.Qasirin qoşmaları, "Məcməüş-şüəra»da Ə.Cənnətinin bayatıları, "Məclisi-fəramuşan»da M.Ə.Bakinin bayatı, qoşma və şikəstələri buna misal ola bilər. "Məclisi-fəramuşan»ın neçənci ilə qədər davam etməsi haqqında heç bir sənədə rast gəlmədik.

AMEA Əlyazmalar İnstitutunda bir zərf mühafizə olunur[317]. Zərfin üstündə yazılmışdır: "Məclisi-fəramuşan»dan. Cavab gözləyirik».

Buradakı başqa bir qeyddən görünür ki, məzmununu bilmədiyimiz həmin məktub kimə isə 1315 (1897)-ci ildə Kəminənin xahişi ilə göndərilmişdir. Bu da "Məclisi-

---

[316] ƏYİ, M – 67, vər. 256 a – b.
[317] ƏYİ, fraqment N 1404 (7599).

fəramuşan»ın XIX əsrin sonlarında da fəaliyyətdə olduğunu göstərir.

“Məclisi-fəramuşan» şairlərinin əksəriyyəti Nəvvabın təsiri ilə yazmışlar. Odur ki, onların bir çoxunun şeirlərində həm ilahi, həm də dünyəvi eşqin tərənnümü kimi cəhətlər özünü göstərməkdədir. Bu şairlərin şeirlərində zəmanədən narazılıq, din xadimlərinin tənqidi kimi ictimai motivlərə rast gəlinsə də, bu, onların yaradıcılığı üçün o qədər də xarakterik olmamışdır. Onlar şəriət ehkamlarını təhrif edən, dilində dua, qəlbində riya gəzdirən, din pərdəsi altında hər cürə fırıldaq işlədən ruhaniləri tənqid edirdilər. Bu cəhət onların dindar olduqları, şəriəti, onun ehkamlarının düzgün həyata keçirilməsi tərəfdarı olmalarından irəli gəlirdi.

Yuxarıda göstərilən siyahıdan göründüyü kimi “Məclisi-fəramuşan»da otuzdan artıq şair, xanəndə, musiqi xadimi iştirak etmişdir. Lakin biz burada onların ancaq ən görkəmlilərindən bir neçəsi haqqında bəhs edəcəyik.

## Mir Möhsün Nəvvab

XIX əsrin maraqlı simalarından biri də şair, rəssam, musiqişünas, nəqqaş, xəttat, astronom, pedaqoq kimi tanınmış Mir Möhsün Nəvvabdır.

Mir Möhsün Hacı Mir Əhməd oğlu Ağamirov Nəvvab 1833-cü ildə Şuşada ruhani ailəsində anadan olmuşdur. Molla məktəbində ərəb, fars dillərini, eləcə də Şərq ədəbiyyatını mükəmməl öyrəndikdən sonra o, 34 yaşında ikən Şuşanın görkəmli alimlərindən Molla Abbas Cavanşirdən həyat, rəml və nücum elmlərini təlim almağa başlamış, beləliklə hərtərəfli, zəngin məlumat sahibi olmuşdur. İstedadı və biliyi sayəsində hələ gənc ikən böyük hörmət qazanan Nəvvabı Şuşanın yaşlı sakinləri indi də ehtiramla yad edirlər.

Şuşada şəriət dərsləri ilə yanaşı, dünyəvi elmləri tədris edən müəllimlərdən biri də Nəvvab olmuşdur. O, 1890-cı

illərdə təşkil etdiyi yeni tipli məktəbdə əsasən özünün hazırladığı dərsliklərdən istifadə edərdi. Ömrünün çoxunu müdərrislikdə keçirən Nəvvab həm də dövrünün istedadlı şairi olmuşdur. Dərsdən sonra vaxtını ya “Məclisi-fəramuşan»da, ya elmi əsərlər yazmaqda, ya da mütaliədə keçirmişdir. “Məclisi-fəramuşan»ın üzvləri, həmçinin Qarabağın görkəmli xanəndələri şeir-sənət və musiqiyə aid məsləhət və təlim almaq üçün həmişə onun yanına gələrdilər. Nəvvabın evində musiqiyə aid keçən müsahibələrdə Seyid Şuşinski, İslam Abdullayev, Məşədi Cəmil və başqa xanəndələr iştirak edər, ondan öyrənərdilər. Ümumiyyətlə, Şuşa ziyalıları, o cümlədən hər iki ədəbi məclisin üzvləri mübahisəyə səbəb olan mühüm məsələlərdə, yuxarıda deyildiyi kimi, həmişə ona müraciət edərdilər. Onun evi mədəniyyət ocağını xatırladırdı.

Nəvvab öz evində bir litoqrafiya mətbəəsi açmağa müvəffəq olmuş, hətta burada özünün bir neçə əsərini belə çap etmişdir.

Nəvvab dövrünün tanınmış şair-alimlərindən olmuş, elmin müxtəlif sahələrinə aid Azərbaycan, fars və ərəb dillərində iyirmidən artıq əsər yazmışdır. Bunlardan bir neçəsi həm özünün, həm də Bakıda Orucovlar mətbəəsində nəşr edilmişdir. İlk dəfə olduğu üçün bunların bəzilərinin qısa təsvirini verməyi və məzmunlarından müxtəsər də olsa bəhs etməyi lazım bildik.

«Ziyaül-Ənvar» - İslam dini, onun tarixi və babilər hərəkatından bəhs edir. Əsər fars dilində 1900-cü ildə yazılmış, Nəvvabın özü tərəfindən bir neçə dəfə üzü köçürülmüşdür. Bir müqəddimə və doqquz məqalədən ibarətdir[318].

«Kifayətül-ətfal» - 1899-cu ildə ərəbcə və Azərbaycanca yazılmışdır. Bir müqəddimə və on iki məqalədən ibarət olan bu əsərdə əsasən Şərq nücum elmindən bəhs olunur[319]. Əsər

---

[318] ƏYİ, B – 2929.
[319] ƏYİ, B – 735.

haqqında ilk dəfə Allahverdi Tağızadə qısa məlumat vermişdir[320].

Əsərdə dünyanın yaranması tarixindən, müxtəlif xalqlarda işlədilən təqvimlərdən, ayların adlarından bəhs etdikdən sonra müəllif orta əsr astronomiya elminə əsaslanaraq, günəş sistemi, onun quruluş və hərəkəti haqqında məlumat verir. Əsərdən məlum olur ki, müəllif onu yazarkən Şərq və Yunan alimlərinin astronomiyaya aid kitablarından istifadə etmişdir. Nəvvabın XIX əsrin sonralarında günəş və ayın tutulmasını müasir elm nöqteyi-nəzərindən düzgün izah etməsi də maraqlıdır. O Ayın tutlmasını yerin Günəşlə Ay arasına düşməsi ilə izah edilirdi.

Əsərin müvafiq məqalələrində «kürreyi-ərzin» cəhətləri və Ekvator xəttindən bəhs edilir. Yerin beş qitədən ibarət olmasını, onların adlarını göstərən müəllif bunu da əlavə edir ki, yerin cənub qütbündə həyat yoxdur.

«Məzamir» -1883-cü ildə fars dilində yazılmış bu əsər müqəddimə və on iki məqalədən ibarət olub dini məzmundadır[321].

«Şəmsül-hidayə» - Bir müqəddimə, otuz beş kiçik fəsildən ibarət olan əsər 1887-ci ildə farsca yazılmışdır[322]. Titul səhifəsi və başlığı müəllifin özü tərəfindən gözəl ornamentlərlə bəzənmişdir. Əsərdə XVI əsrdə Avropada katolik dinin parçalanması nəticəsində əmələ gələn protestanlıqdan və Lüterdən danışılır.

«Bəhrül-hüzən» və «Kənzül-mühən» - 1864-cü ildə fars dilində yazılmış hər iki əsərdə Kərbəla hadisələri təsvir edilir[323].

«Divani-farsi» - 1898-ci ildə tərtib edilmişdir[324]. Qısa müqəddimə ilə başlanan 64 vərəqlik bu divanda şairin əlliyə

---

[320] Tağızadə A. Nadir istedad (M.Nəvvab haqqında). "Azərbaycan müəllimi" qəzeti. 8 yanvar 1967, N 3 (1852).
[321] ƏYİ, B – 638; B – 2930.
[322] ƏYİ, B – 2038; B – 1846.
[323] ƏYİ, M – 147. hər iki əsər bir yerdə cildlənmişdir.

qədər qəzəli, dini məzmunlu on beş qəsidəsi və bir neçə rübaisi vardır. Divana Nəvvabın öz şeirlərindən əlavə H.Qaradağinin "Məclisi-fəramuşan»da dediyi bir neçə şeiri, Nəvvabın Mirzə Muxtara, M.Ə.Bakiyə, habelə Cənubi Azərbaycan şairi Mahmud bəyə cavabları, Füruği və Sədi Şirazi kimi şairlərin qəzəllərinə təzmini, tərbihi də daxil olunmuşdur[*].

«Batilüs-sehr» -1898-ci ildə fars dilində yazılmışdır[325]. Əsər Tiflisdəki İran konsulxanasının işçisi Rza Rüşdi Naibməqamın «Ziyayi-Qafqaziyyə» qəzetində[326] yeni əlifba məsələsinə dair dərc etdirdiyi məqaləsinə cavab olaraq yazılmışdır. Nəvvab öz əsərində mühafizəkar mövqe tutaraq, əlifba islahatı ilə razılaşmadığını bildirmiş, Naibməqamın fransız, rus, latın əlifbaları əsasında tərtib etdiyi yeni əlifbanı pisləmişdir. «İslam millətinin» geridə qalmasının əsas səbəblərindən birini də ərəb əlifbasının çətinliyində görən M.F.Axundovun və M.Şaxtaxtinskinin əleyhinə çıxaraq Nəvvab göstərirdi ki, guya ərəb əlifbasının sağdan sola yazılması yazını daha da asanlaşdırır.

«Nurül-ənvar» - 1899-cu ildə fars dilində yazılmışdır[327]. Müqəddimə, iyirmi dörd məqalə və xatimədən ibarət olan bu əsər əsasən dini-sxolastik nəsihətlərdən ibarət olsa da, əxlaq və tərbiyə nöqteyi-nəzərindən faydalıdır.

«Vüzuhül-ərqam» - 1883-cü ildə fars dilində yazılmış bu əsər 1913-cü ildə Bakıda Orucovlar mətbəəsində çap edilmişdir[328]. Əsərdə musiqinin yaranma tarixindən, muğamatın növlərindən, onun şöbə və guşələrindən, musiqi islahatlarından, muğamda olan zəngulələrdən danışılır. Müqəddimədə Nəvvab

---

[324] ƏYİ, B – 3037.

[*] Mir Möhsün Nəvvab. Divan. Bakı, Şuşa, 1999, 192 s.

[325] ƏYİ, B – 2372.

[326] "Ziyayi-Qafqaziyyə", 1898, N 5.

[327] ƏYİ, B – 1212.

[328] ƏYİ, B – 237.

musiqinin insan səhhətinə müsbət və mənfi təsirindən, onun müalicə xasiyyətindən də bəhs etmişdir*.

Bundan sonra Nəvvab məşhur filosofların musiqi haqqında söylədikləri fikirlərdən misallar gətirir və göstərir ki, musiqini ifa edən gözəl olmalı və dinləyici ilə ifaçı arasında müəyyən məsafə lazımdır ki, hava nəğmədəki «hiddəti» çəksin, qulaq asana onun saf sədası çatsın.

Nəvvab əsərində xüsusi cədvəl üzrə dörd sövt, yeddi pərdə, on iki muğam, iyirmi dörd şöbə, qırx səkkiz guşə və on beş avazə olduğunu göstərmişdi.

Burada hər bir muğamın özünəməxsus xüsusiyyətlərindən, onların bəzi şəxslər tərəfindən sıralanması qaydalarından, pərdələrdən, hər bir muğam və pərdənin insan təbiətinə təsirindən də bəhs olunmuşdur.

«Vüzuhül-ərqam»da musiqi alətlərinin növləri, adları, müəllifin zamanında işlənən nəğmələr, həmin nəğmələrin hansı muğamlar əsasında yaranması haqqında da məlumat verilir. Müxtəlif dövrlərdə ayrı-ayrı şəxslər tərəfindən müəyyən münasibətlə muğamlara verilən adlardan, habelə onların ölkə, vilayət, qövm, tayfa, adları ilə əlaqəsindən danışan müəllif göstərirdi ki, Azərbaycan, Nişapur, Zaili, Mavərənnəhr, Bağdadi, Kərküki, Kürd, Qarabaği, Şirvan və s. muğam adları məhz belə yaranmışdır. Əsərdə rast, mahur, şahnaz, rəhavi, çargah, nəva dəstgahlarının hissələri də göstərilir. Məsələn: o yazır ki, rast dəstgahı rast, pəncgah, vilayəti, mənsuriyyə, Azərbaycan, bayatı-türk, bayatı-Qacar, Mavərənnəhr, balikəbutər, Hicaz, əşiran, zəng-şotori və Kərkükidən ibarətdir[329].

Əsər yazıldıqdan sonra Fazil İrəvani Nəvvaba məktub yazaraq bildirmişdi ki, alim-zületiqad mərifətşüar, şəriətmədar alimlər musiqi elmində məharəti olan, amma özü xanəndə olmayan, müğənni-təğənnini haram bilən şəxs barəsində buyurmuşlar ki, əgər bu şəxs elmi niyyət üçün musiqini

---

* Mir Möhsün Nəvvab. Vüzuhül-ərqam. Bakı, Elm, 1989. **(red. – V.M)**
[329] ƏYİ, B – 237, vər. 14 a.

istemal edə və ya yada sala və tədris edə, onu yaza və ya çap edə, sata və ya onun surətin yaza (üzünü köçürə), öz kitabxanasında qoya caizə edir, ya yox?

Nəvvab bunun cavabında yazırdı ki, mücərrəd elmi demək və saxlamaq eyb deyil, bəlkə, vacibdir.

Musiqiyə insanı dərd-qəmdən, bədbin xəyaldan uzaqlaşdıran bir vasitə kimi baxan Nəvvab qəmli olduqda tar, tənbur, ney və s. musiqi alətlərinə, müğənniyə müraciət edər, dərdini dağıtmaq üçün onlardan nicat istəyərdi. Məsələn, o, bir şeirində dünyanın vəfasızlığı haqqında düşünür, pessimizmə qapılır, rüstəmlər, zallar və s. pəhləvan və hökmdarların torpağa döndüyünü xatırlayır, peyğəmbərlərin belə əbədi yaşamadığını yazır.

«Pəndnamə» - bu əsər 1906-cı ildə fars dilində yazılmışdır. Didaktiki, əxlaqi-təbiyəvi mövzuda olan bu əsərdə xeyirxahlıq, qonşu ilə rəftar, elmin faydası, habelə ailə və məişət, hifzisəhiyyə, dostluq, sülh, dövləti idarə məsələlərinə aid qiymətli nəsihətlər verilmişdir.

Yalan deməyin zərər və ziyanından danışan müəllifə görə, yalanın ən yaxşısı məsləhətamiz yalandır. Fitnə törədən doğru söz isə doğruçuluğun ən pisidir.

Dövrünün təbabət elmini yaxşı bilən, təmizliyə və can sağlığına xüsusi fikir verən müəllif yemək-içmək və sanitariya qaydalarına ciddi əməl olunmasını, evi, küçə-bacanı, həyəti, paltarı, əl-ayağı, dırnaqları təmiz saxlamağı, yay zamanı tez-tez bədəni yumağı, xüsusilə ağızı hər gün təmiz yaxalamağı məsləhət görürdü. Müəllif papiros çəkmək, tiryək, şərab və s. bu kimi şeylərin zərərindən ayrıca bəhs edərək yazır ki, bu şeylər insan bədənini zəiflətməkdən əlavə, onu insani keyfiyyətlərdən də uzaqlaşdırır.

Nəvvab hifzi-səhiyyədən danışarkən aşağıdakılardan pəhriz saxlamağı məsləhət görürdü: ağır xörəyi çox yeməkdən, günortadan sonra yatmaqdan, gecə yuxudan oyanıb su içməkdən, tox hamama getməkdən, xörək üstündən xörək

yeməkdən, iki hava arasında oturmaqdan, zökəm olan zaman şirin və yağlı yeməkdən. O yemək, içmək, yatmaq və oturmaqda orta həddi məsləhət görürdü.

Əsərdə dini-sxolastik mahiyyət daşıyan nəsihətlərə də təsadüf edirik. Nəsihətlərin əsas hissəsi bir çox cəhətdən indi də öz əhəmiyyətini saxlamaqdadır.

«Kəşfül-həqiqə» - üç cilddən ibarət olan bu əsər 1894-1895-ci illərdə fars dilində yazılmış, şairin özü tərəfindən bir neçə dəfə üzü köçürülmüşdür. Əsərin ikinci və üçüncü cildləri 1898-1899-cu illərdə Nəvvabın mətbəəsində çap olunmuşdur. Hər bir cild üçün müəllif ayrıca müqəddimə yazmışdır. Birinci cildin müqəddiməsində deyilir ki, aqil və arif adamlar hikmətli və mənalı əhvalatları ağıl mizanından keçirərək, ona təmsil və əfsanə paltarı geydirmiş, onları ağıllıların, ariflərin nəzərində cilvələndirib, şad və qəmli günlərində danışaraq faydalanmışlar. Belə ki, aqillər öz dərdlərini dəf edir, nadanlar isə məzhəkə kimi yad edirlər ki, ta onların təbiətinin xüsusiyyəti dəyişərək, xeyirxahlığa doğru getsinlər.

Oxuculardan bəzi səhvlərini bağışlanması xahiş edən müəllif göstərir ki, mənim bu yazılardan millətə, uşaqlara xidmətdən başqa qeyri bir məqsədim yoxdur.

Bu əsərdə şairin didaktik şeirləri, mənzum hekayələri, bir neçə qəzəl və qəsidəsi toplanılmışdır. Burada riyaziyyat, kimya, astronomiya elmlərinin faydasından və musiqidən də bəhs edilir, həmçinin bir sıra faydalı nəsihətlərlə yanaşı, qumarbazlıq, sərxoşluq, şöhrət və şəhvət düşgünləri pislənir. «Kəşfül-həqiqə»də dini məzmunlu hadisə və rəvayətlərə də müəyyən qədər yer verilmişdir. Hekayətlərin əksəriyyəti xalq rəvayət və lətifələrindən istifadə yolu ilə nəzmə çəkilmişdir. «Qoyunun qurda tapşırılması», «Hiyləgər tülkü», «Qan içən, lakin doğru danışan canavarın hekayəti» və sairədə tamahkarlıq, yırtıcılıq və hiyləgərliyi pisləyən şair hekayətlərinin sonunda ümumiləşmiş, ibrətamiz nəticələr çıxarır və faydalı nəsihətlər edir.

«Təzkireyi-Nəvvab»[*]. Nəvvabın əsərləri içərisində bu təzkirənin Azərbaycan ədəbiyyatı tarixi üçün xüsusi əhəmiyyəti vardır. Əsər 1913-cü ildə Bakıda Orucovlar mətbəəsində çap olunmuşdur. Təzkirənin daha dolğun və geniş avtoqraf nüsxəsi AMEA Əlyazmalar İnstitutunda saxlanılır[330]. Hələ çox-çox əvvəllər bu təzkirə üçün material toplayan müəllif onu 1891-ci ildə tərtib etməyə başlamışdır. Əsər iki hissədən ibarətdir; birinci hissədə təzkirə yazılan zaman vəfat etmiş, ikinci hissədə isə həyatda olan Qarabağ şairləri haqqında məlumat və əsərlərindən nümunələr verilir.

Birinci hissədəki şairlər haqqında məlumatı əldə etməkdə çətinlik çəkən müəllif çox zəhmətlərə qatlaşaraq, onların qohum-əqrəbaları ilə görüşüb, tərcümeyi-hallarına aid məlumat və əsərlərindən nümunələr toplamışdır. Nəvvab yazırdı ki, «qara torpağa baş qoyan və əlləri şairlər və zəriflər məclislərindən kütah olub qara torpaqla yeksan olan şairlər haqqında «qohum-əqrabalarından məlumat toplamışam[331]». Birinci hissədə Qarabağda yazıb-yaradan otuz bir nəfər şair haqqında məlumat verilir.

M.P.Vaqif, M.V.Vidadi, Kərbəlayi Səfi Valeh, Canı oğlu Abdulla, Qasım bəy Zakir, Məhəmməd bəy Aşiq, Abdulla bəy Asi və başqaları bu hissəyə daxildir.

Bu hissədə diqqəti cəlb edən və xüsusi tədqiqata ehtiyacı olan məsələ Nəvvabın Vidadi haqqında qeydidir. O yazır: «Mirzə Vəli Vidadi Bayram xan oğlu Baharlı Şuşa şəhərinə tabe olan kənd adıdır. Molla Pənah Vaqiflə müasir idi və tərəkəmə olmuşdur. İbrahim xana yaxın olmuş və məlum olduğu kimi, xan Vidadini mühüm bir iş üçün İran padşahı Fətəli şahın dərgahına göndərmişdir. Şahın hüzurunda kobud danışır. Bu kobud sözlərdən şahın məcazı dəyişər və sonra onu

[*] Mir Möhsün Nəvvab. Təzkireyi-Nəvvab. Bakı, Azərbaycan, 1998, 560 s. (**red. – V.M.)**

[330] ƏYİ, M – 67. avtoqraf.

[331] ƏYİ, M – 67, vər. 14 a.

top ağzına qoyub atəş açarlar ki, vücudu parçalansın. Müşarəleyh sünni idi. İndi onun nəslinin hamısı şiə məzhəbdirlər. Hərdən Vaqiflə müşairələr edərmiş. Amma mərhumun divanı yoxdur, şeirləri dağınıqdır[332]».

Doğrudan da, Vaqif İbrahim xanın sarayında baş vəzir olarkən Baharlı kəndindən olan Molla Vəli bir neçə elçi ilə bərabər İrana Fətəli şahın hüzuruna göndərilmiş və orada qətlə yetirilmişdir. T.e.n. Ə.Şükürzadənin yenidən qaldırdığı bu məsələyə f.e.d Ş.Cəmşidov cavab vermişdir. Bizcə, Nəvvab M.P.Vaqiflə müşairədə verdiyi şeirləri Baharlı Molla Vəlinin adına çıxmaqla səhvə yol vermişdir.

Təzkirənin birinci hissəsində Mirzəcanın «Bənövşə» qoşması, Aşıq Pəri ilə onun deyişməsi, Aşıq Pərinin Mirzə Həsənə yazdığı «Sənin», «Oynaşır» rədifli qoşmaları, Mirzə Həsənin ona eyni rədifli cavabları, Aşıq Pərinin Cəfərqulu xana, Bəhram bəy Fədai və Baxış bəy Səburun atası Əsəd bəyin Pəriyə həsr etdiyi  qoşmaları verilmişdir. Lakin müəllif nə Aşıq Pəri, nə Mirzəcan, nə də Əsəd bəy və bir şeirini verdiyi Əbdülməcid əfəndi haqqında heç bir məlumat verməmişdir. Bu da, görünür, müəllifin əlində onların həyatına aid mötəbər məlumat olmamasından irəli gəlmişdir.

İkinci hissədə əlli altı şair, o cümlədən Natəvan, Mehdiqulu xan Vəfa, F.Kəminə, H.Qaradaği, M.R.Fəna, M.Məmai, M.Ə.Növrəs, Mirzə Həsən Yüzbaşov və başqaları haqqında qısa məlumat verilmişdir. Nəvvab müasirlərinin şeirlərindən nümunə verdikdə onların çoxunun nə münasibətlə deyildiyini də unutmamışdır ki, bu da təzkirənin əhəmiyyətini artırır. O, imkan dairəsində şairlərin təvəllüd və vəfat tarixləri, yaxud təzkirə yazılarkən neçə yaşında olduqlarını qeyd etməklə tədqiqatçının işini bir qədər asanlaşdırmışdır. Nəvvabın bir cəhəti xüsusilə qeyd edilməlidir ki, bu da indiyədək təzkirəçilərin heç birində rast gəldiyimiz avtoqraf

---

[332] Nəvvab. Təzkirə (çap). s. 17-18.

toplamaqdadır. Təzkirəni yazarkən müəllif bir çox şairləri yanına dəvət etmiş və şeirlərini xatirə olaraq avtoqraf kimi həmin kitaba yazdırmışdır. Bu mümkün olmadıqda isə şairlərdən aldığı avtoqraf vərəqləri təzkirəsinə tikilmişdir. Hətta o, 1892-ci il aprel ayının 8-də Kəminəyə məktub yazaraq, təzkirə üçün istədiyi şeirləri gecikdirdiyindən ondan gileylənmişdir. Məktubun məzmunundan görünür ki, kimsə Kəminəyə yalnış məlumat vermiş, ona görə də şairə şeirini göndərmək istəməmişdir. Nəvvab isə məktubunda göstərir ki, mənim bu işdə bir faydam yoxdur, məqsədim budur ki, sənin şeirlərin xeyir iş kimi yadigar olaraq dünyada qalsın:

*Deyirlər bir dənizadə bəxalətlə xəbər vermiş,*
*Bəxilin zərfi-ömrü mövtilə sərşar olmazmı?*

*Mənim bu işdə nəfim yox, sizə məlumdur xahər,*
*Bunun zəhmətkeşi xəlq içrə bimiqdar olmazmı?*

*Qərəz: dünyada bu əşar bir əsardır qalsın,*
*Qamu şairlərin adı məgər asar olmazmı?*[333]

Kəminənin ikinci məktubundan görünür ki, o öz yazdıqlarını şeir hesab etmədiyi üçün şairlər yanında xəcalət çəkməsindən ehtiyat edir:

*Nə bədgudur mənə mane, nə qəflətdir, əya Nəvvab,*
*Həmişə möhnəti-hicran çəkən bimar olmazmı?*

*Qalıbdır Şişədə mey tək qamu əşar namətbu,*
*Səbəb olsan qamusu açılıb əşhar olmazmı?*

*Yazıbsan xətti-naməqbulilə əşari-namətbu,*

[333] ƏYİ, M – 67, vər. 289 b.

*Kəminə şairan yanında bimiqdar olmazmı?*[334]

1892-ci il mayın 28-də Nəvvab Kəminəyə başqa bir məktub yazaraq, şeirlərini göndərdiyi üçün ondan razılıq etmişdir.

Mirzə Yəhya Şeyda, Mirzə Hüseyn Çakər, Mirzə Zeynəlabdin Seyid Şaki Abdali, Baxış bəy Səbur, Mirzə Süleyman, Məşədi Məhəmməd Bülbül, İbrahim Tahir, Məşədi Əyyub Baki, Mirzə Əli Aşiq və başqaları Nəvvabın təzkirəsində avtoqraf şeirləri olan şairlərdəndir. Şairlərin şeirlərini təzkirəyə avtoqraf kimi yazdırmaq Azərbaycan təzkirəçiliyi tarixində ilk dəfə Mir Möhsün Nəvvaba məxsus təşəbbüsdür.

İkinci hissədə hər bir şairin başqalarından seçilən şəxsi keyfiyyət və xüsusiyyətləri də göstərilmişdir. Məsələn, burada M.Katibin hər şeyə inanan, Mahmudun özü danışıb, özü gülən, Bakinin qısaboy olması qeyd edilmişdir.

Nəvvab şairlərin peşə və  sənətləri haqqında da məlumat vermişdir. Biz bu təzkirədən öyrənirik ki, XIX əsrdə Mirzə İbrahim Səba, Kəminənin atası Bəybaba Fəna kimi gözəl xəttatlar yetişmişdir. Bundan başqa, vaxtilə Şuşada açılan rus dili məktəblərində təhsil alan məclis üzvləri haqqında da bizdə müəyyən təsəvvür yaranır. Belə ki, İbrahim bəy Azər, Bəhram bəy Fədai, Mirzə Ələsgər Növrəs, Baxış bəy Səbur, müəllifin oğlu İbrahim Mir və başqalarının ərəb-fars dilləri ilə yanaşı, rus dilində də savadlı olmaları haqqında Nəvvabın qeydi göstərir ki, hələ XIX əsrin ikinci yarısında Azərbaycanda bu dili öyrənirdilər.

Biz təzkirədən XIX əsrdə Şuşada Molla Abbas Cavanşir kimi nücum, heyət, riyaziyyat elmlərinə bələd olan, hətta bir sıra riyaziyyat kitablarına şərhlər yazan alim, Mirzə Əli Təbib, Mirzə Heydərqulu Təbib kimi xalq təbabətini gözəl bilən həkimlər, məktəb və mədrəsələrdə müdərrislik edən Mirzə Əli Aşiq, Mirzə Əhməd Sabir, Mirzə Xosrov Şaiq, Sağəri, Mirzə

---

[334] ƏYİ, M – 67, vər. 290 a.

İbrahim Səba və qeyri müəllimlərin çalışdığını öyrənirik ki, bu da öz növbəsində Azərbaycanda həmin peşələrin inkişaf tarixini öyrənmək üçün xüsusi əhəmiyyətə malikdir.

Burada adları başqa təzkirələrdə çəkilməyən Mirzə Məhəmməd Bülbül, Sağəri, Mirzə Sadıq İmanxan oğlu kimi xanəndə-şairlərə də rast gəlinir.

Nəvvab təzkirəsini 1891-ci ildə yazmağa başlayıb 1892-ci ildə qurtarmışsa da, bu işi tam şəkildə bitirməmişdi. Sonralar lazım gəldikdə ona müəyyən əlavələr etmişdi. Məsələn, o, Natəvanı ikinci hissədə – təzkirə yazılan zaman həyatda olan şairlər sırasında yazdığı məlumdur. Lakin şairə vəfat etdikdən sonra ona aid olan hissənin sonunda bu tarixi qeyd etməyi unutmamışdır. Natəvandan başqa, daha bir neçə şair haqqında da belə fakta rast gəlmək mümkündür. Ona görə də müəllif haqqında danışdığı şairlərə aid hissənin sonunda həmişə ağ vərəqlər saxlayırdı.

«Təzkireyi-Nəvvab»da «Təzkireyi-Ziyai» və «Riyazül-Aşiqin» kimi müəyyən məhəlliçilikdən uzaq deyildir. Belə ki, burada ancaq Qarabağ şairləri haqqında məlumat verilir. Buna baxmayaraq, ədəbi irsimizi öyrənmək nöqteyi-nəzərindən o, xüsusi əhəmiyyətə malikdir. Təzkirənin avtoqraf nüsxəsində çapına nisbətən daha geniş məlumat vardır. P.Makulu «Ədəbi məlumat cədvəli» adlı biblioqrafik kitabının yazarkən istifadə olunan mənbələrdən biri də «Təzkireyi-Nəvvab»dır. Lakin müəllif burada olan bir neçə şairi nəzərdən qaçırmışdır. Belə ki, Mirzə Bəybaba Fəna, Mirzə Rəhim Fəna, Abdulla bəy Abış, Məhəmməd bəy Aşiqin oğlu Əbdüssəməd bəy Aşiq və s. haqqında bu təzkirədə məlumat verildiyi halda, «Ədəbi məlumat cədvəli»nə bunların adları düşməmişdir. Daha sonra, Mirzə Məhəmməd Katib, Yusif Kosa, Yusif Xarrat Qulu, Mahmud bəyin «Riyazül-aşiq»ində olduğunu göstərən müəllif onların müvafiq qrafada «Təzkireyi-Nəvvab»da da olması haqqında heç bir qeyd etməmişdir. Halbuki «Ədəbi məlumat cədvəli»ndə hər bir şairin məhz hansı təzkirələrdə, neçənci sə-

hifədə olması, təvəllüd, vəfat tarixləri və s. haqqında müvafiq qrafalarda məlumat verilir. "Məclisi-üns»ün üzvü Məhəmməd ağa Müctəhidzadə Müştəri isə «Ədəbi məlumat cədvəli»ndə ayrı-ayrı şəxs kim iki yerdə getmişdir[335]. Həm də maraqlı cəhət budur ki, müəllif eyni şəxs olan həm Müştərinin, həm də Müctəhidzadənin «Riyazül-aşiqin» adlı təzkirəsi olduğunu, cədvəl tərtib edərkən bundan istifadə etdiyini də «hər iki şəxs» haqqında danışarkən göstərmişdir. P.Makulu «Təzkireyi-Nəvvab»dan istifadə edərkən bir çox tarixləri də təhrif etmiş və ya səhv yazmışdır. Məsələn, Natəvana aid qrafada Nəvvaba əsaslanaraq təvəllüdləri göstərən xanədə 1291 (1874)-cü ildə həyatda «varmış», vəfat tarixini göstərən xanədə isə 1315 (1891)-ci il kimi qeyd edilmişdir[336]. Halbuki, Nəvvabın təzkirəsindəki 1291-ci il tarixi heç də Natəvanın həmin ildə həyatda olmasına yox, həmin ildə onun Şuşaya su çəkdirməsinə aiddir. Şairənin vəfat tarixinə aid xanədə yazılmış hicri 1315-ci miladi tarixlə 1891-ci il yox 1897-ci ilə mütabiqdir.

Bunlardan əlavə, Cəfərqulu xan da həmin kitabda həm Arif, həm də Nəva təxəllüsü ilə yazan iki şair kimi getmişdir[337]. Nəvvaba istinad edən müəllif Cəfərqulu xanın da vəfat tarixində dolaşıqlığa yol vermişdir. Nəvvabın təzkirəsində onun vəfat tarixi açıq-aydın 1288 hicri, (1866)-cı il göstərildiyi halda, Makulu öz «Cədvəl»ində həmin tarixi 1213 hicri (1798) kimi göstərmişdir.

Nəvvab istedadlı şair, bacarıqlı pedaqoq, dərin bilikli alim olduğu kimi, həm də gözəl rəssamlıq qabiliyyətinə malik idi. XIX əsrin ikinci yarısında Azərbaycanda təsviri və qrafika sənəti yeni realist istiqamətdə inkişaf edirdi ki, bu da xalq ustalarının əməllərində qabarıq şəkildə nəzərə çarpırdı. Mirzə Qədim İrəvani və Xurşidbanu Natəvanın rəssamlıqda məharəti

---

335 Makulu P. Ədəbi məlumat cədvəli. s. 261-262.
336 Yenə orada, s. 29, 269.
337 Yenə orada, s. 29 və s. 272. Yeri gəlmişkən göstərmək lazımdır ki, Cəfərqulu xan Arif, Nəva təxəllüsləri ilə yanaşı Xan imzası da yazmışdır.

incəsənətin bu sahəsində yeni bir realist meyilin yarandığına əlamət idi. Bu cəhətdən Nəvvabın sənətkarlığı da diqqəti cəlb edir.

O, nəqqaşlıq və rəssamlığa hələ uşaq vaxtlarından maraq göstərmiş və getdikcə bu sahədə də təkmilləşmişdir. Nəvvabın rəssamlığı və rəsm əsərləri haqqında ilk dəfə sənətşünas, elmlər doktoru A.Qaziyev məlumat vermişdir.

Şərq miniatür sənətinə və üslubuna, xüsusən orta əsr Təbriz rəssamlıq məktəbinin görkəmli nümayəndələrindən Sultan Məhəmməd, Müzəffərəddin Əli və Mirzə Əli kimi sənətkarların əsərlərinə bələd olan Nəvvabın öz rəsm əsərləri içərisində şair rəssamın şəxsi təəssüratından doğan təsvirlər daha da maraqlıdır. O özünün əlyazmalarına, həmçinin şəxsi mətbəəsində nəşr etdiyi kitablara bir sıra şəkil və ornamentlər çəkmişdir. «Kəşfül-həqiqə» əsərinə rəngli boyalarla çəkilmiş qızıl gül və bülbül şəkilləri, əlyazmasının haşiyələrindəki güllər, çiçəklər, yaşıl yarpaqlar, habelə zərli ornamentlərlə bəzədilmiş başlıq xüsusilə diqqəti cəlb edir. Burada mətnin tərbiyəvi mövzusuna müvafiq olaraq çəkilmiş qurd şəklində onun yırtıcılığı, tülkünün hiyləgərliyi, sərxoş adamın miskin mənəviyyatı realist üslubda yaradılmışdır.

Nəvvab eyni zamanda kitab cildlərinin, qələmdanların və sair məişət əşyalarının da üzlərinə gözəl naxışlar çəkirdi. O öz evinin və dərs dediyi sinif otaqlarının divarlarına gül, çiçək, quş təsvirləri, «Şahnamə» əsərinin qəhrəmanlarının şəkillərin çəkmişdir. Maraqlıdır ki, Nəvvab işlətdiyi rənglərin çoxunu və mürəkkəbi özü hazırlayırdı.

Nəvvab bədii əsərlərində olduğu kimi, təsviri sənətdə də dini mövzulardan əl çəkə bilməmişdir. Onun «Bəhrül-hüzən» əsərinə çəkdiyi rəsmlərdə Kərbəla hadisələri ilə əlaqədar bəzi epizodlara rast gəlinir.

İslam dini canlı varlığın şəklini çəkməyə yol vermirdi. Buna baxmayaraq, şəriət qanunlarını çox gözəl bilən Nəvvab nəbatat və heyvanat aləmindən təsvirlər (gül, çiçək, it, qurd)

və insan surətləri («Bəhrül-hüzən»də Əzrəqin Qasımla vuruşması, «Şahnamə»dən epizodlar) çəkməklə şəriətin bu ehkamına tabe olmamışdır.

Nəvvabın bədi yaradıcılığı aşiqanə qəzəllər, müxəmməs, mürəbbe, rübai, təxmis, məsnəvi və təmsillərdən ibarətdir. Mövzu etibarilə rəngarəng olan bu şeirlərdə Kərbəla hadisələrinin təsviri, imamların mədhindən tutmuş, fırıldaqçı din xadimlərinin ifşası, dövrün beynəlxalq hadisələrinə münasibətə kimi müxtəlif məsələlər öz əksini tapmışdır.

Şəxsi-qərəzlik və subyektiv münasibətdən doğan həcv demək Nəvvabın təbiətinə müğayir idi. Bununla belə, o, min cildə girib şəriət adından müxtəlif «qanunlar» icad edən bədəməl, fırıldaqçı ruhaniləri həcv etməkdən qələmini saxlaya bilməmiş, cəmiyyətin bu tüfeyli ünsürlərini kəskin tənqid atəşinə tutmuşdur. Lakin dövrünün başqa sənətkarları kimi, bu tənqidi o, bir ateist kimi yox, insanları şəriət qanunları əsasında düz yola, yaxşı əməllərə çağırmaq məqsədi ilə etmişdi. O, İrandan axışıb gələrək «küçə və bazarlarda» imamları mədh edən, dilində Allahı, ürəyində isə şeytanı çağıran qumarbaz, tiryəkçi dərvişlər haqqında yazırdı:

*Kizbdir hər nə danışsa qamu dərvişləri,*
*Əməli cümləsinin hiyləvü məkr əstü fən əst.*

*Dildə mövlanı deyir, sinədə şeytan çağırır,*
*Əsl şeytanə bular cümləsi papaq tikən əst.*

*«Surxəlişah» deyirlər meyi-nabın adına,*
*Ham qumar oynamağın adına «cəncəl» deyən əst*[338].

Şair göstərir ki, pula ibadət edən belələri aləmə şeytanlıq toxumu səpir. Sonra o:

---

[338] ƏYİ, M – 67, vər. 317 a – 317 b.

*Var bizim şəhrdə həm bir neçə «mollayi-şərif»,*
*Biri əqva eliyən, ol biri barmaq kəsən əst,* -

deyərək, yerli molla və dərvişlərə də əl atırdı.

Öz müasirlərinin bir çoxundan gözüaçıqlığı ilə fərqlənən şair xalq içərisində təriqətçilik, məzhəb ayrı-seçkiliyi salanların əleyhinə çıxmış və onların mənsəb sahibləri tərəfindən edildiyini yaxşı başa düşmüşdü.

*Bir neçə fərd yazaq sahibi-mənsəb sözünü,*
*Dövlətü millətə gör ki xəyanət edən əst.*

*Biri babidi, biri sufi, biri əxbari,*
*Biri şeyxidi, üsuli, biri xodsər gedən əst.*

*İndi də tazə kərimxani çıxıb faşi-digər,*
*Gahi əbdan, gəhi ovtadü imamət edən əst.*

Şeirdə əsas tənqid obyekti İran, onun dövlət başçıları və ruhanilərdir. Qədim tarixə malik olan İranın keçmişi ilə indiki vəziyyətini müqayisə edən müəllif yazır ki, vaxtilə rüstəmlər, bicənlər, keykavuslar, kudərzlər, fəramərzlər və b. bacarıqlı qeyrətli dövlət başçıları olan bir məmləkətdə

*Tülkülər indi tutub şirü pələngin yerini,*
*Cayi-simürğ nə cövlangəhi-zağü zəğən əst.*

*Yoxdu namusu bu biarlərin, olsa idi,*
*Təbakudən ötəri bu nə bizənha-bizən əst…*[339]

---

[339] ƏYİ, B – 2721, vər. 10 b.

Hər şeyi bilməyə, hər yerdən xəbər tutmağa can atan Nəvvab bir çox mədəni şəhərlərlə əlaqə saxlayır, həmçinin mətbuatla maraqlanırdı. O, «Molla Nəsrəddin» curnalının daimi oxucusu olmuş, Bakıdan «Əkinçi», Tiflisdən «Ziya», «Ziyayi-Qafqaziyyə», «Kəşkül» qəzetlərini, Hindistandan «Həblülmətin» məcmuəsini almışdır. O hətta bu qəzet və məcmuələri səliqə ilə cildləyib saxlayırmış.

Nəvvab beynəlxalq aləmdə baş verən hadisələri maraqla izləyirdi. Müxtəlif yerlərdən aldığı qəzetlər ona Avropa burcuaziyasının müstəmləkiçilik xarakteri haqqında müəyyən təsəvvür əldə etmək imkanı vermişdi. Dünya hadisələrinə açıq gözlə baxan, onu düzgün qiymətləndirməyə çalışan şair M.P.Vaqifin məşhur «Bax» rədifli müxəmməsini xatırladan bir şeirində ingilis müstəmləkəçilərinin Şərq ölkələrini işğal etmək siyasətini belə təsvir edirdi:

*İngilisin dövləti bir məkr qıldı aşikar,*
*Padşahi-rusa, həm Osmanlıya iblisvar,*
*Qırdırıb bir-birinə bunları etdi tarümar,*
*Aləmi qovğayə saldı, şurüşü binayə bax*[340].

Şeirin məzmunundan görünür ki, o, 1877-1878-ci illərdə Rusiya ilə Türkiyə müharibəsi zamanı yazılmışdır. Müəllif göstərir ki, London Türkiyə ilə Rusiyanı bir-birinin canına saldıqdan sonra özü Kipr adasını tutdu, torpaqlar ələ keçirdi, çoxlu qan tökülməsinə bais oldu. Şair sonra yazır:

*Neçə il bundan əzəl etdi yenə məkkarlıq,*
*Misr şahın aldadıb etdi ona «qəmxarlıq»,*
*Ləşkərin Misr içrə doldurdu ki, etsin «yarlıq»*
*Sahib oldu mülki-Misrə, dərdə bax, «dərman»ə bax!*

---

[340] ƏYİ, B – 2721, vər. 4 b.

Müəllif şeirdə müxtəlif bəhanələrlə Sudanı, Dəbbəni, Xartumu və Afrikanın bir neçə yerini işğal edən İngiltərə hökümətinin müstəmləkəçi siyasətini ifşa edir. Hələ XIX əsrdə ərəb xalqının müstəmləkəçilik əleyhinə başlamış olduqları azadlıq hərəkatını alqışlayan müəllif şeirinin sonunda ingilis burcuaziyasını lənətləyərək yazırdı:

*İngilislər hiyləsin Nəvvab etsin intişar,*
*Məhv olsun ingilislər, puç qılsın kirdigar,*
*Londonun şəhri dağılsın, bu cahanda aşikar,*
*Misrdən bu guşuma hər dəm gələn nalanə bax!*

Biz Nəvvabın qısa tərcümeyi-halı və əsərlərindən bir neçəsinin məzmunundan müxtəsər bəhs etməklə kifayətləndik. İyirmidən yuxarı müxtəlif mövzuda əsər yazan və şair, həm müəllim-tərbiyəçi, həm də bir rəssam kimi fəaliyyət göstərən belə bir şəxsiyyətin elmi və bədii yaradıcılığının öyrədilməsi hər şeydən əvvəl XIX əsrin ikinci yarısında Azərbaycanda ictimai fikrin tədqiqi baxımından çox faydalı olardı*.

## Həsənəli xan Qaradaği

“Məclisi-fəramuşan»da, eləcə də o dövrün Qarabağ şairləri içərisində əsas simalardan biri şair və pedaqoq **Həsənəli xan Qaradağidir.** H.Qaradağinin babası Məhəmmədhəsən ağa 1806-cı ildə Cənubi Azərbaycanın Qaradağ mahalından köçüb Şuşaya gəlmiş, burada rus ordusunda qulluğa girmiş və polkovnik rütbəsinə qədər yüksəlmişdi. Məhəmmədhəsən ağa rus qoşunları ilə birlikdə Rus-İran müharibəsində iştirak etmiş və böyük şücaətlər göstərdiyinə görə 1828-ci ildə xanlıq

---

* Bax: Hacıyeva A. Mir Möhsün Nəvvabın ədəbi-bədii irsi. Bakı, Nurlan, 2004, 211 s; Mir Möhsün Nəvvab. 1905-1906-cı illərdə erməni-müsəlman davası. Bakı, Şuşa, 1993; Mir Möhsün Nəvvab. Nəsihətnamə. Bakı, Yazıçı, 1987, 80 s. **(red. – V.M.)**

tituluna və mükafata layiq görülmüşdü. Onun oğlu Həsənəli ağa da atasının yolu ilə gedərək, rus ordusunda xidmət etmişdir.

Beləliklədə ata-babası Cənubi Azərbaycanın Qaradağ mahalından olan Həsənəli xan 1847-ci ildə Şuşa şəhərində hərbi xidmətçi ailəsində anadan olmuşdur[341]. Hələ ana bətnində ikən atası vəfat etdiyi üçün atası Həsənəlinin adını ona qoymuşlar. Ailəsi və qohumları Həsənəli ağanı xatırlayaraq, həmişə onu «Balaca ağa» deyə çağırarmışlar. O, Şuşanın yaşlıları arasında həmin adla məşhur olmuşdur.

Atası vəfat edəndən sonra dünyaya göz açan Həsənəli əmisi Məhəmmədhüseyn ağanın himayəsində böyümüşdür. Rus dilini öyrənmək məqsədilə əmisi onu yeddi-səkkiz yaşlarında Şuşa qəza məktəbinə qoyur. Həsənəli burada oxuyarkən əmisi Tiflisə köçür. Anası Xatın xanım da Qubadlı rayonunun Hal kənd sakini Xancan bəyə ərə gedir. İstər əmisindən, istərsə də anasından vaxtlı-vaxtında yardım ala bilməyən Həsənəli çox çətinliklə oxuyur.

O zaman qatı dindarlar rusca oxuyanları «kafir» və «natəmiz» adlandırır, onlara həqarətlə baxırdılar. Hətta balaca Həsənəli nənəsi Hürzad xanımgilə gedəndə nənəsi onu şirin dil, xoş sifətlə qarşılasa da, yeməkdən qabaq özü uşağın ağzına su çəkər və deyərmiş ki, «sən məktəbdə rusca danışmısan, ağzın murdar olub».

Həsənəli xan Şuşa məktəbində oxuyan zaman boş vaxtlarında müstəqil olaraq mütaliə ilə məşğul olardı. O çox erkən, hələ on altı yaşında ikən Şuşada təzə məhəllədə bir ev kirayə edərək, müstəqil yaşamağa başlayır və anasının göndərdiyi pul

---

[341] Təzkireyi-Nəvvabdan istifadə edən P.Makulu "Ədəbi məlumat cədvəli"ndə (s. 403) Həsənəli xan Qaradağinin h.1220 (m.1804)-ci ildə həyatda olduğunu göstərmişdir. Halbuki, Nəvvab, həmin ildə H.Qaradağinin babası Məhəmmədhəsən xanın Qarabağa gəldiyini, təzkirəni yazan zaman isə H.Qaradağinin 45 yaşında olduğunu açıq-aydın göstərmişdir Bax: Təzkireyi-Nəvvab, s. 108. (N.Q).

ilə dolanır. Həm də Şuşa rus-tatar məktəbinin müəllimi olan Mirzə Bəşir Yusifzadənin atasından ərəb və fars dillərini öyrənir. O öz müəlliminin yanında və evdə görkəmli Şərq klassiklərinin əsərlərini mütaliə etməklə bərabər, özü də tək-tək şeir yazmağa başlayır. Səbirlə, inadla və müntəzəm çalışması sayəsində elm-bilikdə olduğu kimi, şeirdə də artıq şəhər əhalisinin hörmətini qazanır. Məhəllə Həsənəli xanın şairlik istedadını və savadını görüb, ondan uşaqlarına dərs deməyi xahiş edirlər. Beləliklə, təxminən 1868-ci ildən H.Qaradaği məktəbdarlıq etməyə başlayır. O, iyirmi nəfərə qədər uşaq götürüb, onlara özü tərtib etdiyi «vəsait» əsasında ana dilində dərs deyir, həm də «Quran» ayələri və namaz qaydalarını öyrədirdi. Qaradaği 1873-cü ilə kimi Şuşada məktəbdarlıq etmişdir.

Tiflisdə Zaqafqaziya sərdarının yanında məsul vəzifədə çalışan əmisi Məhəmmədhüseyn ağa Şuşaya gələndə Həsənəli xanın rusca, farsca və ərəbcə savadını görüb onu öz yanına aparır. Burada Həsənəli xan əmisinin Avropa, rus və Şərq ədəbiyyatı ilə zəngin kitabxanasından istifadə edir. O, Tiflisdə fransız dilini də öyrənməyə başlayır.

H.Qaradağinin oğlu, qocaman müəllim, mərhum Çingiz Qaradağinin yazdığına görə, Məhəmmədhüseyn ağa M.F.Axundovun yaxın dostu olmuşdur. Tiflisdə olan açıq fikirli şəxslər tez-tez Məhəmmədhüseyn ağanın evinə toplaşar, orada M.F.Axundovun fikirləri ətrafında müzakirələr və mübahisələr edərdilər. Əmisinin evində qalan Həsənəli də bilavasitə bu mübahisələrdə iştirak edər, onları dinləyərdi. H.Qaradağinin yazdığına görə, M.F.Axundov Həsənəli xan Qaradağini «qardaş oğlu» deyə çağırarmış. Lakin indiyə kimi başqa bir mənbədə istər şairin əmisi Məhəmmədhüseyn ağa ilə, istərsə də H.Qaradaği ilə M.F.Axundovun arasında heç bir məktublaşma, qeyd və sair fakta rast gəlinmədi.

Bir tərəfdən Zaqafqaziyanın siyasi və inzibati mərkəzi Tiflis mühiti, digər tərəfdən oradakı ziyalılarla oturub-durması

gənc Qaradağinin dünyagörüşünə müsbət təsir etməyə bilməzdi. Tiflisdə Axundovun komediyaları, onun «Kəmalüddövlə məktubları», yeni əlifba uğrunda mübarizəsi ilə Qaradaği tanış ola bilərdi.

Beş ilə yaxın Tiflisdə qalan Qaradaği 1878-ci ilin əvvəllərində Şuşaya qayıdır, yenə də məktəbdarlıqla məşğul olur. Bu dəfə o, mollaxanalarda olduğu kimi yerdə, həsir üstündə dərs keçmir; uzun bir stol və stul düzəltdirir, şagirdlərə ana dili və hesabdan dərs verir. Beləliklə də, Qaradaği Şuşada ilk dəfə stol arxasında, stulda oturub dərs oxumağı tətbiq edir. Heç bir dərslik olmadığı üçün QaRadaği axşamlar səhər deyəcəyi dərsin mətnini hazırlayardı. H.Qaradağinin yazdığına görə, ana dili dərsliklərində özü yazdığı kiçik şeirlərdən və Krılovdan tərcümə etdiyi təmsillərdən, təlimdə isə rus pedoqoqu Uşinskinin metodundan istifadə edərmiş.

XIX əsrin 80-cı illərinə kimi köhnə tipli məktəblərdə dərsliklər ərəb-fars dillərində tərtib edilmiş kitablardan ibarət idi. Azərbaycan dili müəllimləri olmadığı kimi, bu dildə, həm də sövti üsulla yazılmış dərslik də yox idi. Azərbaycan dili dərsliklərini də rus məktəblərində olduğu kimi, sövti üsulla təlim etmək məsələsini qaydaya salmaq üçün Zaqafqaziya seminariyasının inspektoru A.O.Çerniyayevski 1880-ci illərdə Tiflisə bir qrup azərbaycanlı ziyalı dəvət edir. Bu məsələdə Çernyayevskiyə yaxından kömək edənlərdən biri də H.Qaradaği olmuşdur. Məktəbdarlıq edərkən tərtib etdiyi dərsliyin bu işdə ona çox köməyi dəyir. Çernyayevskinin tərtib edəcəyi dərsliyin mənzum hissəsinin hazırlanmasını öhdəsinə götürən Qaradaği özünün əsərlərindən başqa, Krılovdan etdiyi 60-a qədər təmsildən bir neçəsini kitaba saldırır. Bir sözlə, Çernyayevskinin «Vətən dili» kitabının hazırlanmasında Qaradağinin də yaxından köməyi olmuşdur.

Qaradaği 1888-ci ildə əmisi Məhəmmədhüseynin xəstələndiyini eşidərək Tiflisə gedir. Bu zaman xəstə əmisi özünün yeganə övladı Həsənəli xana verməK istəyir. O, buna ürəkdən

razı olmasa da, əmisinin sözündən çıxa bilməyir. 1891-ci ildə Məhəmmədhüseyn ağa vəfat edir. O, əmisini Tiflisdə dəfn edir. Bundan sonra H.Qaradaği ailəliklə Şuşaya qayıdır və yenə də məktəbdarlıqla məşğul olur. Onlar Tiflisdə olduğu kimi, burada da ayrı yaşayırlar. Nəhayət, 1897-ci ildə əmisi qızının tam razılığı və təkidi ilə Qaradaği əlli yaşında ikən ikinci idəfə başqa bir qızla evlənir.

“Məclisi-fəramuşan»ın ilk üzvlərindən biri olmaqla H.Qaradağinin ədəbi fəaliyyəti əsasən həmin məclislə bağlı olmuşdur. O, Şuşada olmadığı bir neçə il nəzərə alınmazsa, həmin məclis yaranandan dağılana kimi müntəzəm olaraq onun yığıncaqlarında iştirak etmişdir. Məclisin rəhbəri M.Nəvvab Qaradağiyə xüsusi hörmət bəsləyirdi. O, Qaradağini nüktədan, arif, səmimi dost kimi qiymətləndirir, onu “Məclisi-fəramuşan»ın bəzəyi adlandırırdı. Qaradaği üzürlü bir səbəb olmadan məclisin toplanışlarından kənarda qalmazdı. Xəstə olub gələ bilmədikdə isə Nəvvab dərhal məktub göndərib məclisə gəlməməsinin səbəbini öyrənərdi.

H.Qaradaği 1920-ci illərə kimi ədəbi fəaliyyətlə yanaşı, pedaqoci işini də davam etdirmişdir. 1922-ci ildə iflic xəstəliyinə tutlan şair həkimlərin səyi nəticəsində sağalır. O, artıq müəllimlik edə bilməsə də, ədəbi fəaliyyətini davam etdirir.

Azərbaycan Xalq Maarif Komissarlığı H.Qaradağini Azərbaycan şairləri haqqında material toplamaq işinə cəlb edir, həm də uzun müddət maarif sahəsində çalışdığına görə ona xüsusi təqaüd kəsir və şair-pedaqoq ömrünün sonuna kimi həmin təqaüdü alır.

Qaradaği İ.Kaspirinski, C.Ünsizadə və C.Məmmədquluzadə kimi mühərrirlərlə dostluq etmiş, həmişə onlarla əlaqə saxlamışdır.

Maarifpərvər şair-pedaqoq 1929-cu il dekabr ayının 2-də 82 yaşında Şuşada vəfat etmişdir.

Qaradağinin ədəbi irsi qəzəl, qəsidə, müxəmməs, müstəzad, uşaqlar üçün yazılmış kiçik həcmli tərbiyəvi şeirlər, böyük rus təmsilçisi Krılovdan etdiyi tərcümələr və s. ibarətdir.

Həmin şeirlərin bir qismi AMEA Əlyazmalar İnstitutundakı, müxtəlif əlyazmaları, cüng və fraqmentlərdə mühafizə olunur. «Təzkireyi-Nəvvab»da onun bir neçə şeiri vardır ki, bunları şair yadigar olaraq oraya şəxsən öz əli ilə yazmışdır. Nəvvab təzkirəsində Qaradağidən bəhs edərkən göstərir ki, azərbaycanca və farsca hər cür şeirləri vardır, lakin dağınıqdır[342].

M.Xəzani, Cavanşir, M.Adıgözəl bəy və başqaları kimi, H.Qaradaği də Qarabağ tarixi ilə maraqlanmış, bəzi dəyişiklik və təkmillər edərək 1880-cı ildə M.Adıgözəl bəyin «Qarabağnamə»[*] əsərinin üzünü köçürmüşdür. Əsərdən aydın olur ki, o, Qarabağın Rusiya ilə birləşdirilməsinə müsbət bir hadisə kimi baxmışdır[343].

Bundan başqa, Qaradaği əsasən Qarabağ şairlərindən ibarət kiçik bir təzkirənin də müəllifidir[344]. Çox güman ki, o, bunu Azərbaycan Xalq Maarif Komissarlığının tapşırığı ilə şairlər haqqında materiallar əsasında tərtib etmişdir.

Ədəbi məclislərdə müşairələr müxtəlif cür olurdu. Bəzən bir şair bir qəzəl deyərək, oturanlardan cavab istəyirdi. Bütün məclisdəkilər həmin qəzələ cavab verirdilər. Yaxud bir nəfər qəzəlin mətləsini deyir, yerdə qalanların hər biri onun sonrakı beytlərini söyləyirdilər. Hərə bir beyt dedikdən sonra yenə beytləşmə təkrar olunurdu. Adətən qəzəl 6-7 beytdən ibarət olduğu üçün növbə ilə hər şair 6-7 beyt deyir, məqtədə öz təxəllüsünü də göstərirdi. Bəzən isə beytləşmə iki nəfərin arasında gedirdi. Bu zaman yenə də hər şair növbə ilə

---

[342] ƏYİ, M – 67, vər. 161 a.

[*] Qarabağnamələr. I kitab. Bakı, Yazıçı, 1989, 192 s. Qarabağnamələr. II kitab. Bakı, Yazıçı, 1991, 450 s. **(red. – V.M)**.

[343] История Азербайджана. II том. стр. 353-354.

[344] ƏYİ, inv. 7602.

beytləşirdi. Qaradağın Cinli kəndindən olan Sədi Sani[345] tez-tez Şuşaya gələr, "Məclisi-fəramuşan»da iştirak edərdi. O, 1870-ci ilin 22 mayında "Məclisi-fəramuşan»ın təşkilindən əvvəl dostu Qaradaği ilə aşağıdakı qaydada beytləşmişdir:

Sədi:

*Yenə üftadeyi-bir çahi-zənəxdan oldum,*
*Neylədim mən görəsən, layiqi-zindan oldum.*

Qaradaği:

*Cəm idi yengi xəyalım bu pərişanlıqdan,*
*Bir pəri zülfü xəyalilə pərişan oldum.*

Sədi:

*Görəli xalını ruyində gözüm mərdüməki,*
*Maili-müşki-xəti-nöteyi-Quran oldum.*

Qaradaği:

*Ləbi-şəhdin düşəli yadıma, zənbur evi tək,*
*Nişeyi-şövq dəlib bağrımı, şan-şan oldum.*

Sədi:

*Lalə tək ruyin ilə qan ciyərim dağlandı,*
*Qönçə təkləlin ilə çaki-giriban oldum.*

---

[345] Sədi Sani Qarabağinin həyatı, yaradıcılığı və gəzəlləri Fazil Seyidov tərəfindən tədqiq olunmuşdur və hal-hazırda AMEA Əlyazmalar İnstitutunun Elmi Arxivində mühafizə olunmaqdadır. Bax: Sədi Sani Qarabaği. Seçilmiş əsərlər.Hazırl.Fazil Seyidov. Mak.çapı 174, şifr- 44. **(red. – V.M.)**

Qaradaği:

*Ləbinə badə dedim, saldı rəqiblər bəhsi,*
*Düşdü qan, çıxdım aradan, səbəbi-qan oldum*[346]*...*

Sadə, səmimi və anlaşıqlı dildə deyilmiş beytlər və onların arasındakı məzmun bağlılığı, fikir əlaqəsi, bir-birini tamamlama göstərir ki, hər iki şair çox hazırcavab və bədahətən dərin mənalı şeir demək qabiliyyətinə malik olmuşlar. Qaradaği bir beytdə özünün divanə və ya fərzanəliyini kimsə bilmədiyi halda, eşqə düşdükdən sonra dillərdə dastan olduğunu dedikdə Sədi dərhal «divanə» və «dillərdə dastan olmaq» sözlərinin müqabilində məhz divanəliyi ucundan dillərdə dastan olan Məcnunun və Leylinin adını çəkir:
Qaradaği:

*Kim bilirdi məni divanəvü ya fərzanə,*
*Düşəli eşqə, düşüb dillərə, dastan oldum.*

Sədi:

*Hələ Məcnunu deyək Leyli biyabanə salıb,*
*Bəs nə gəldi mənə, Məcnuni-biyaban oldum?*

Sədi 1879-cu il iyulun 24-də Mirlər kəndindən məktub yazaraq Qaradağidən ildırım, yağış, qar, duman kimi təbiət hadisələrinin səbəbini soruşur. Bu zaman Qaradaği Hal kəndində anasının yanında imiş. O, bir gün sonra, iyulun 25-də Sədiyə cavab vermiş və həmin hadisələrin səbəbini müasir təbiətşünaslıq elminin göstərdiyi kimi izah etməyə çalışmışdır.

"Məclisi-üns»də M.R.Fəna kimi, "Məclisi-fəramuşan»da da H.Qaradaği 1881-ci il iyun ayının 3-də «Ağlaram» rədifli

[346] ƏYİ, B – 1486, vər. 5 a.

qəzəl yazıb, M.Ə.Növrəsə göndərir. Səməd bəy Fənaya cavab yazdığı kimi, Növrəs də Qaradağiyə «Ağlama» rədifli qəzəllə cavab vermişdir. Qaradaği Növrəsə yazmışdı:

*Yox məndə səbr firqəti-cananə, ağlaram,*
*Düşdüm nə edim bu atəşi-hermanə, ağlaram*[347].

Növrəs isə ona

*Səbr eylə cövri-firqəti-cananə, ağlama,*
*Salma özünü bu atəşi-hirmanə, ağlama*[348].

həm yuxarıdakı, həm də qəzəlin qalan beytlərindən göründüyü kimi Növrəsin cavab qəzəli çox zəifdir.

Nəvvabın təzkirəsində Qaradağinin bir neçə mənzum məktubu vardır ki, bunların hər biri müəyyən münasibətlə yazılmışdır. O, Qaradağinin bir neçə gün görmədiyi üçün darıxaraq yazırdı:

*Qəmim biyarlıqdan etdi tüğyan,*
*Yetir Xan Qaradağini, yarəb!*
*Əritdi cismü canım nari-hicran,*
*Yetir xan Qaradağini, yarəb!*[349]

Qaradaği də öz növbəsində 1891-ci il fevralın 19-da eyni rədiflə cavab yazıb onlara gələcəyini bildirmişdir. Lakin xəstələndiyi üçün gələ bilmədiyindən üzr istəyir:

*Vədə verdim gecə gəlib oturaq,*
*Naxoş oldum haman gecə, ay ağa!*
*Ondan bəri bəstəriyəm, yatıram,*

---

347 ƏYİ, B – 1486, vər. 8 a.
348 Yenə orada, vər. 8 b.
349 ƏYİ, M – 67, 288 b.

*Duan gəlir indi vecə, ay ağa*[350]*!*

O, "Məclisi-fəramuşan»ın yığıncağında iştirak edə bilmədiyi üçün yazırdı:

*Ərzi-salam o kəslərə, vardılar!*
*Sizə müxlis, bəndə üçün yardılar,*
*Müntəzir dideyi-növbahardılar,*
*Gələ bir də haman gecə, ay ağa*[351].

Bundan bir qədər sonra  isə Nəvvab xəstələnir, məclisin toplanışı yenə təxirə salınır. Bu zaman Qaradaği ona yazırdı:

*Bəs deyilmi ürəyimiz çatdadı,*
*Bu qədər bəstəri olubsan, ağa?*

*Qələt etdi zökəm sənə də dəydi,*
*Gül kimi saralıb, solubsan, ağa*[352]*!*

Yuxarıdakı şeirlərin yazılma tarixindən və çoxlu yazışmalardan aydın olur ki, "Məclisi-fəramuşan»1890-cı illərdə qızğın fəaliyyətdə olmuş, məşğələləri əsasən gecələr (xüsusilə qış aylarında) keçirilirmiş. Bu belə də olmalı idi. Çünki rəsmi olaraq müəyyən bir ədəbi cəmiyyətdə fəaliyyət göstərməyən və oradan maaş almayan şairlər gündüzlər kəsbkarlıq edir, axşamlar isə məclisə toplanırdılar.

Qaradağinin ədəbi irsinin müəyyən hissəsini dərs dediyi uşaqlar üçün yazdığı şeirlər təşkil edir. Bu şeirlərin əsas məzmunu uşaqları elm-sənət öyrənməyə çağırışdan, onları məktəbə həvəsləndirməkdən ibarət idi. Krılovdan etdiyi tərcümələrdən əlavə, o özü də həmin ruhda təmsillər yazar,

---

[350] Yenə orada, vər. 286 a.
[351] Yenə orada, vər. 286 a.
[352] ƏYİ, B – 1486, vər. 19 b.

dərs zamanı bunlardan istifadə edərdi. Bu təmsillərində Qaradaği şagirdləri mülayimliyə, sədaqətə, doğruluğa, əməksevərliyə təşviq edirdi.

Qaradağinin şeirlərini məzmununa görə üç qismə ayırmaq olar: aşiqanə, qəzəllər, məclis üzvləri ilə müəyyən münasibətlə məktublaşmalar və didaktiki-tərbiyəvi şeirlər. Orijinal qəzəllər və nəzirələrini, həmçinin məclis üzvləri ilə müşairələrin əksəriyyətini o, "Məclisi-fəramuşan»da yazmışdır.

Klassiklərdən Hafiz və Füzuli onun ən çox sevdiyi sənətkarlardan olmuşdur. Bu təsir həm onun yazdığı qəzəllərin məzmununda, həm də işlətdiyi obrazlı ifadələrdə aydın nəzərə çarpır.

Lakin Qaradağinin qəzəllərində hətta klassiklərin çox az işlətdikləri bədii ifadə vasitələrinə rast gəlinir ki, bunlar öz obrazlılığı, səmimiliyi, cazibəliliyi ilə orijinal səslənir. Onun işlətdiyi bir aforizmə diqqət verək: o, əvvəllər can bir qəlbdə, sonralar isə biganə olan sevgilisindən gileylənən aşiqin dili ilə deyir:

*Var idik bundan əzəl biz nə gözəl həmxanə,*
*İndi biganə sifət göz kimiyik həmsayə*[353]*!*

Məlum olduğu kimi, hər bir kəsin gözləri anadangəlmə birbirinə qonşudur. Lakin biganələr kimi hələ də bir-birilərini görməmişlər (güzgü vasitəsilə görmək əlbəttə şərt deyildir). Ona görə də şair deyir ki, bundan əvvəl əcəb həmxanə idik, indi isə bir-birinə qonşu olan göz kimi biganə olmuşuq. İncə müşahidə nəticəsi olaraq təbii deyilmiş bir təşbehdir.

Qaradağinin həmin qəzəlinin ilk iki beytinə fikir verək:

---

[353] ƏYİ, A – 9, vər. 12 b.

*Əbrvəş məh üzünə zülf salanda sayə,*
*Sanki bir ay tutulub, şuri düşüb dünyayə.*

*Düşsə bir tar telindən üzünə, tari bilir,*
*Ləkələr zahir edər, nəqs yetər ol ayə*[354].

Şair bu iki beytdə gözəlin sifətinin ağlığını təsvir etmişdir. Lakin o, elə-belə, «sənin üzün göyçəkdir, ağdır, yaxud aya bənzəyir» deməmiş, bunu özünəməxsus bədiiliklə, obrazlı şəkildə bildirmişdir. Yəni sənin saçların üzünə töküləndə elə bir ay tutulur, aləmə səs düşür. Birinci beytdən onun sifətinin ay kimi gözəlliyi bilinir, ikinci beytdən isə öyrənirik ki, təsvir edilən gözəlin üzü o qədər ağ və incədir ki, hörüyündən hətta bir tük belə ora düşsə, dərhal ləkələr zahir olar, ona nöqsan yetər.

Qaradağinin qəzəlləri dilinin sadəliyi, səmimiliyi və adi danışıq tərzi kimi axıcılığı ilə diqqəti cəlb edir:

*Vədə vermişdi, nədən, ol yar gəlsin, gəlmədi?*
*Tuti dilli, bir şəkkərgöftar gəlsin, gəlmədi.*

*Bu qədər təxir edər, yarəb, nə olmuş bilməzəm,*
*Gəlməmək fikri olub, ya var gəlsin, gəlmədi*[355].

Şairin əldə olan qəzəllərinin əksəriyyətində nikbin əhvali-ruhiyyə olduğu kimi, «fələyin dövründən», «dəsti-qəzadan», «çərxi-nakəsdən» şikayət motivləri də yox deyildir. Belə qəzəllərin yazılma səbəbi bizə məlum olmasa da, hər halda müəyyən münasibətlə deyilmişdir:

*Fələyin bir belə dövrü olacaqmış, nə bilim!*

---

[354] Yenə orada.
[355] ƏYİ, B – 1486, vər. 23 a.

*Saralıb bağі-gülüstan solacaqmış, nə bilim!*

*Ürəyim yarələnib, sinəmə dağlar çəkilib,*
*Gözümə qan sızılıb, yaş dolacaqmış, nə bilim!*

*Bitirib, bağ salıb, bir neçə güllər yetirdim,*
*Uzadıb dəsti-qəza kim, yolacaqmış, nə bilim!*

*Əl çəkib nakəsidən, çərx elə nakəs imiş,*
*Bir mənə cövrü cəfalər qılacaqmış, nə bilim*[356]*!*

Nəvvab, Kəminə və başqalarının da eyni rədifli qəzəlləri vardır. Kəminənin 1898-ci ildən vəfat etdiyi nəzərə alsaq, bu şeirin 1898-ci ildən əvvəl yazıldığı məlum olur. Rəvayətə görə həyatında baş verən bir hadisə ilə əlaqədar olaraq «Nə bilim» rədifli qəzəli ilk dəfə F.Kəminə yazmışdır. Sonra "Məclisi-fəramuşan» şairləri onun dərdinə şərik olmaq əlaməti kimi hər biri eyni rədifli qəzəl demişlər.

Qaradaği XIX əsrdə Zaqafqaziyada yeni məktəblərin açılmasını böyük sevinclə qarşılamış, «Zaqafqazın tərifi» şeirini də məhz münasibətlə yazmışdır. «Zaqafqaziyada müsənniflərin artmasına», müəllim və şagirdlərin çoxalmasına ürəkdən sevinən şair yazırdı:

*Mədarisü tədrisi-bəhsi-ülum,*
*Günbəgündən olmuş ziyadə fühum,*
*Müəllimü əllamü fəhamlar,*
*Tutub şərbəti-elmdən camlar*[357].

Şeirin yazılma tarixi məlum olmasa da, şairin fəxrlə;

*Qaradaği istər təfaxür qılar,*

---

[356] Yenə orada, vər. 12 b.
[357] ƏYİ, B – 1486, vər. 8 b.

*Günü-gündən olsun ziyadə bular,*
*Cahan içrə mən də vərəq çöndərib,*
*Krılovun təmsillərin döndərib*[358]*...*

deməsindən ehtimal etmək olar ki, şeir XIX əsrin 80-cı illərində şairin Krılovdan «döndərdiyi» təmsillərin çap edildiyi A.O.Çernyayevskinin «Vətən dili» kitabının ilk nəşrindən əvvəl yazılmışdır.

Qaradaği klassik şeirin qəzəl, qəsidə, məsnəvi və s. formalarından əlavə, heca vəznində də gözəl qoşmalar yazmışdır. Onun Nəvvabla olan müşairələrinin bir qismi heca vəznindədir. 1878-ci il iyul ayının 19-da Nurulla bəy Fətəlixanov Bərgüşadiyə yazdığı mənzum məktub üslüb və dilinin sadəliyi ilə diqqəti cəlb edir.

*Nurulla bəy, gəlib düşdüm Novruza,*
*Çox görünür gülüzarı Novruzun.*
*Həmdəmi yox, munisi yox, neyliyim,*
*Heç bulunmaz qəmküsarı Novruzun...*

*Çiçəklər açılıb, qalxıbdır ələf,*
*Zəvalə gəlməsin, olmasın tələf,*
*Səlsəbil tək cari olub hər tərəf,*
*Axışıllar bulaqları Novruzun.*

*Səhər, axşam çıxır hər yan dolanır,*
*Çəməndə gizlənib şehə bulanır,*
*Kənardan baxanın ağzı-sulanır,*
*Qəribədir anaşları Novruzun*[359]*.*

---

[358] Yenə orada, 9 a.
[359] ƏYİ, B – 1486, vər. 6 a.

Şeirdə Novruzlu kəndinin təbiəti real boyalarla təsvir edilir.

Qarabağinin tərbiyəvi-əxlaqi şeirlərində ədalətsiz qazilər, əliəyrilər, pul hərisləri tənqid edilir.

Bütün müasirləri kimi Qaradaği də dövrün ümumi ənənəsindən – dini məzmunlu şeirlər – növhə və mərsiyə yazmaqdan kənarda qalmamışdır. Nəvvabın tərtib etdiyi «Məzlumnamə» kitabında bir çox Bakı və Qarabağ şairlərinin əsərləri ilə yanaşı, Qaradağinin də bir neçə növhəcati vardır[360].

Qaradağinin satirik, nəsihətamiz mənzum hekayətləri XIX əsrin ikinci yarısında Azərbaycan ədəbiyyatının realist üslubda yazılmış nümunələrindən olmaq etibarilə əhəmiyyətlidir.

Təəssüflə qeyd etmək lazımdır ki, bir çox müasirləri kimi, bu maraqlı şair və pedaqoqun istər ədəbi irsi, istərsə də pedaqoci fəaliyyəti az öyrənilmişdir.

## Mirzə Məhəmməd Katib

Mirzə Məhəmməd Məşədi Bayram oğlu Katib 1833-cü ildə Şuşada yoxsul ailədə anadan olmuş və orada mollaxana təhsili almışdır.

Çox sadəlövh və təmiz qəlbə malik olan, hər deyilənə inanan, şəriətin yol vermədiyi hər şeyə laqeyd baxan, Katib yoxsul və sufiyanə bir həyat keçirmişdir. «Riyazül-aşiqin»də yazıldığına görə, «mütələbbis imiş fəqir libas ilə» və dua yazmaqla ehtiyacını təmin edərmiş[361]. Həmişə ehtiyac içində yaşasa da, çox əmin və sakit həyat sürmüşdür. O, Şuşa şairləri ilə həmməclis olsa da, Asi, Növrəs və başqaları kimi bir çox

---

[360] Nəvvab Mir Möhsün ağa Qarabaği. Məzlumnamə. Bakı, 1913.

[361] Müctəhidzadə M. Riyazül-aşiqin. s. 230.

işlərə qarışmamışdır. Hətta Natəvan onun xatirini çox istəməsinə baxmayaraq, ona həcv yazıldıqda bütün Şuşa şairləri bu işə qoşulduğu halda, Katib bitərəf qalmışdır.

Ehtiyac içində yaşaması katibin şeirlərində də öz əksini tapmışdır[*]. M.F.Axundova yazdığı məktubunun bir yerində o, vəziyyətindən şikayətlənərək yazırdı:

*Ey sərvərim, əhvalımı soruşsan,*
*Gecə-gündüz işim ahü zardır.*
*Könlüm qanə dönüb bu zəmanədən,*
*Ol səbəbdən belə biqərardır.*

*Dərdü qəmdən qəddim yayə dönübdür,*
*Rəngim sarı kəhrübayə dönübdür.*
*Vücudim bir müqəvvaya dönübdür,*
*Görən deyər surəti-divardır*[362].

Katib 1889-cu ildə 56 yaşında Şuşada vəfat etmişdir.

Şair haqqında ilk dəfə məlumat verən Nəvvab öz təzkirəsinə onun bir qəzəl, bir qoşma və bir həcvini daxil etmişdir. Bu şeirləri həmin təzkirəyə M.Katib özü yazmışdır[363]. Bundan sonra «Riyazül-aşiqin»də Katibin bir qəzəli və iki fərdi verilmişdir.[364] Qaibov Katibin şeirləri ilə maraqlanmış, onun on dörd qəzəlini və on qoşmasını öz «Məcmuə»sinə daxil etmişdir[365].

Qulam Məmmədli Katibi “Məclisi-üns»ün üzvü hesab etmişsə də[366], tədqiqat bunun əksini göstərir. Belə ki, Nəvvabın

---

[*] Bax: Mirzə Məhəmməd Katib. Şeirlər. Bakı, Şuşa, 2004, 56 s. **(red. - V.M.)**

[362] ƏYİ, M – 134, vər. 1311.

[363] ƏYİ, M – 67, vər. 121 a.

[364] Müctəhidzadə M. Riyazül-aşiqin. s. 230.

[365] ƏYİ, M – 134, s. 1296-1327.

[366] ƏYİ, Qulam Məmmədli, Təzkirə, B- 2701.

«əksər övqat mənim yanımda olardı»[367] qeydindən aydın olur ki, o, “Məclisi-fəramuşan» şairlərindən olmuşdur.

Vaxtilə görkəmli ədəbiyyat tədqiqatçısı Salman Mümtaz Katibin yaradıcılığı ilə maraqlanmış və onun bir neçə qoşmasını toplamışdır ki, bunlar Qaibovun yuxarıda göstərilən «Məcmuə»sindən götürülmüşdür.

Nəvvabın yazmasına görə, Katibin iki min beytə qədər şeiri ona məlum imiş.

Katib Mirzə Fətəli Axundovla dostluq etmiş, Tiflisdə onunla görüşmüş, hətta böyük mütəfəkkirin məclisində olmuşdur. O, «Ey sərvərim, əhvalımı soruşsən» misrası ilə başlanan mənzum məktubunda yazır:

*Oxşatmışdın məni əhli xəvacə,*
*Tiflisdə çağırdın məclisi-xasə,*
*Xəyalət istədin məndən xülasə,*
*Cənabın əşarə xiridardır*[368].

Bu məktubdan görünür ki, Katib Axundovun tapşırığı ilə öz şeirlərindən ibarət «yaxşı bir kitab» tərtib etmiş, lakin suya düşüb axdığı üçün onu dostuna göndərə bilməmişdir. Tiflisdə olarkən o, Axundovun «Təmsilat»ını oxumuş və kitab şairə çox gözəl təsir bağışlamışdı.

*Yazdığın hekayət hikmətdir təmam,*
*Olur ki, eşidə tərk edə əvam,*
*Xəlayiqdə ola misli-intizam,*
*Hər nə desək, xəlqə səzavardır*[369].

Tarixi göstərilməsə də, aşağıdakı bəndlərdən məktubun neçənci ildə yazıldığını təyin etmək mümkündür:

---

[367] ƏYİ, M – 67, vər. 121 a.
[368] ƏYİ, M – 134, s. 1311.
[369] ƏYİ, M – 134, vər. 1312.

*Məxdumzadə eşitdim etmiş səfər,*
*O səfərdə olsun onu müzəffər,*
*Könül sayəsindən necə əl çəkər,*
*Çünki kəmalinə ümidvardır.*
*Nəxli-şirin verməz acı səməri,*
*Hər şey öz əslindən əsər göstəri,*
*Arif kəsin olu arif pəsəri,*
*Yəqin elə bu söz əslkardır*[370].

Burada «Məxdumzadə eşitdim etmiş səfər», «Arif kəsin olu arif pəsəri» misraları, şübhəsiz ki, M.F.Axundovun oğlu Rəşidin təhsil üçün Avropaya getməsi ilə əlaqədar deyilmişdir. Rəşidin 1874-cü ildə Brüsselə getməsini nəzərə aldıqda məktubun da həmin ildə yazıldığı aydınlaşır.

M.Müctəhidzadənin qeyd etdiyinə görə, Katib gözəl xəttat olmuş, qübar xəttinin mahir ustası kimi tanınmışdır[371]. Katibin əldə olan qəzəl və qoşmalarında əhdinə vəfalı, sevgilisinə sədaqətli aşiqin qəlb döyüntüsü duyulmaqdadır.

O, adi təbiət hadisələrinə poetik məna verərək, təsvir etdiyi surəti obrazlı ifadələrlə oxucunun gözündə daha qabarıq canlandırmağı bacarırdı. Şairin gözündə sevgilisi misilsiz dərəcədə gözəldir. Lakin o, bunu sadəcə olaraq «sən Günəşdən də gözəlsən» deməklə kifayətlənməyir. Bunun üçün Günəşin göydə «dövr etməsindən», onun «dərü divarə düşməsindən» bir bədii vasitə kimi istifadə edərək yazır ki, səni görən Günəş sənə elə vurulmuşdur ki, göydə avaradır və Məcnun kimi başı açıq dər-divarə düşmüşdür:

*Gün səni görmək ilə çərxdə avarə düşüb,*
*Sər berəhnə o səbəbdən dərü divarə düşüb*[372].

---

[370] Yenə orada, vər. 1313.
[371] Müctəhidzadə M. Riyazül-aşiqin. s. 231.
[372] Yenə orada, s. 231.

Və yaxud həftəlik ayın yarım dairə şəklində olmasına poetik məna verərək şair deyir:

*Yerdən ol şuxi görüb çərxdə baxdım qəmərə,*
*Deyəsən, parələnib məh, yerə bir parə düşüb*[373].

Bəzən Katib müasirlərinin bir çoxu kimi dünyəvi gözəlləri tərənnüm etməklə yanaşı, təriqətçilikdən uzaqlaşa bilmir, istəyinə çatmaq üçün «Heydəri-kərrarə»[*] yalvarmaqdan başqa çarə görməyir:

*Yetişmək mətləbə istərsən, aya, Katibi-miskin,*
*Gərək ixlasilə ol Heydəri-kərrarə yalvarmaq*[374].

Onun xalq şeir üslubunda olan qoşmalarında «səhər-səhər qıya baxan», «bahar fəsli seyrə çıxan», «piyalə gözləri ilə sevgilisini məst edən» hər gün rastlaşdığı həyati gözəllər vəsf edilir. Aşıq şeirinin gözəl nümunələrindən sayıla bilən bu qoşmalar dilinin sadəliyi və səlisliyi baxımından da qəzəllərdən seçilir. Bunlar ərəb və fars tərkiblərindən uzaq, təmiz xalq dilində, anlaşıqlı tərzdə yazılmışdır:

*Sən gözəlsən bədrlənmiş ay kimi,*
*Mən aşiqəm, göz yaşım var çay kimi,*
*Əyilmişəm qaşın kimi, yay kimi,*
*Qəddimi döndərib dala gözlərin.*

*Zülfün aldı bu şikəstə könlümü,*
*Eylədi tarına bəstə könlümü,*
*Mən istəməm dəxi xəstə könlümü,*

---

[373] Yenə orada.
[*] Həzrət Əliyə **(red. - V.M.)**
[374] Nəvvab. Təzkirə (çap). s. 87.

*İndi nə var məndə, ala gözlərin?!*[375].

Dilinin səlisliyi, oynaqlığı, axıcılığı və musiqililiyi göstərir ki, bunlar Katibin ilk qoşmaları olmayıb, mükəmməl yaradıcılıq yolu keçmiş kamil bir şair qələminin məhsuludur. Katib qəzəllərinə nisbətən qoşma sahəsində daha çox müvəffəqiyyət qazanmışdır. Onun Əlyazmalar İnstitutunda müxtəlif əlyazma və fraqmentlərdə «Səni», «Sevdiyim», «Dedin, nə dedi?», «İçində», «Gözlərin», «Olsun», «Ağlasın», «Gəlməz», «Gəlməsin», «Yaraşmaz», «Arzular», «Ahu gözlər» rədifli qoşmaları və otuza yaxın qəzəli mühafizə olunmaqdadır.

Təəssüf ki, qəzəldən çox xalq şeiri üslubunda əsər yazmış bu istedadlı və məhsuldar şairin şeirlərinin çoxu itib-batmış, az bir hissəsi bizə çatmışdır.

## Abdulla bəy Asi

XIX əsrin ikinci yarısında Şuşa mühitinin yetişdirdiyi istedadlı şairlərdən biri də Abdulla bəy Asidir. Şuşa şairləri, «bütün Qarabağ ürəfa və üdəbası onun vücudilə iftixar edərdi»[376].

Qasım bəy Zakirin nəvəsi, Abdulla Əli bəy oğlu Fuladov Asi 1841-ci ildə Şuşada anadan olmuşdur. O, təlim-tərbiyəsini Şuşada almış, ərəb, fars, rus dillərindən başqa, Ə.Nəvinin əsərlərini mütaliə etməklə cığatay dilini də öyrənmişdi. Asi xüsusi istedada və təbə malik şair idi. O, şeir yazmaq üçün əlinə qələm aldıqda misra, qafiyə, obrazlı ifadə üçün fikirləşmək bilməzmiş, sözləri ipə düzülmüş kimi yerli-yerində, həm də mənalı şəkildə elə işlədərmiş ki, onda qüsur tapmaq çətin olarmış. Asi az yaşamış, 1874-cü ildə vəfat etmişdir.

---

[375] Yenə orada, s. 88.
[376] Köçərli F. Materiallar. II c., I hissə, s. 146.

Asi dərin məzmunlu qəzəlləri ilə az bir zamanda nəinki yalnız Şuşa, həm də Şəki, Şirvan, Bakı, Qazax mahallarında ən müqtədir hesab edilən şairlərin belə hüsn-rəğbətini qazanmışdı.

Təxminən beş ilə qədər "Məclisi-fəramuşan»da iştirak edən Asi bu müddətdə M.Nəvvabdan sonra məclisin ən qabil, məhsuldar, istedadlı və nüfuzlu üzvlərindən biri olmuşdur. O həmin məclisin canı, ruhu hesab olunurdu. Bir çox ədəbi və elmi mübahisələrdə ona müraciət edər, onun fikri ilə razılaşdılar. Təsadüfi deyildir ki, Qafqaz şüərasının öndəri hesab edilən Seyid Əzim kimi bir şəxsin iştirakı ilə Şamaxı şairləri nəzirə yazdıqları qəzələ qiymət qoyulmaq üçün onu "Məclisi-fəramuşan»a, məhz Asinin üstünə göndərmişdilər. «Riyazül-aşiqin» müəllifi M.Müctəhidzadə isə onu «mərifət dəryasının qəvvası» adlandırmışdı[377].

Asi haqqında ilk məlumata, biz, M.Nəvvab və M.Müctəhidzadənin təzkirələrində rast gəlirik. Nəvvab təzkirə yazarkən Asinin şeir dəftəri onun əlində olmuşdur. Burada min dörd yüz fərd, növhə, müxəmməs, tərcibənd, təcnis, qəzəl olduğunu təxmin edən müəllif onlardan təzkirənin əlyazmasına on beş şeir, çap nüsxəsinə isə dörd qəzəl daxil etmişdir. M.Müctəhidzadə isə «Riyazül-aşiqin»də onun «Beytüs-Səfa»nın üzvü M.Bixuda yazdığı mənzum cavabını qarabağlı şair Mahmuda həsr edilmiş iki müxəmməsini, on səkkiz qəzəlini, bir şeirini, iki bəhri-təvilini və bir növhəsini vermişdir ki, bunlardan dörd qəzəl və bir şeir fars dilindədir. Asinin AMEA Əlyazmalar İnstitutunda mühafizə olunan bir dəftərdə[378] isə 28 şeiri vardır ki, bunlardan S.Əzimə yazdığı məktub və on qəzəl yuxarıda göstərilən təzkirələrdə yoxdur.

---

[377] Müctəhidzadə M. Riyazül-aşiqin. s. 178.
[378] ƏYİ, fraqment 831.

Daha bir neçə cüng və fraqmentlərdə də onun bir neçə şeiri vardır[*].

Şərq ədəbiyyatını gözəl bilən və klassik poeziyanın bütün incəliklərinə bələd olan Asinin ədəbi irsi əsasən lirik, məhəbbət qəzəllərindən ibarətdir. Onun qəzəllərindəki bədii ifadə formalarına, təkrir və təşbehlərə heyran olmamaq mümkün deyildir.

Yaradıcılığın ilk illərində «cami-meyi», «nayü neyi» və dünyəvi gözəlləri tərənnüm edən Asi bir qədər sonra Şuşa dindarlarının təhriki ilə şərabdan əl çəkmiş, şeirlərində vəhdəti-vücud ideyasını, insanı axirətə qovuşduran ilahi meyi tərənnüm etmişdir. Bir zamanlar o:

*Zahida, guşeyi-məsciddə nəyim var mənim?*
*Bərbətü çəngü dəfü nayü neyim var mənim.*

*Kövsəri vədə edərsən mənə gərçi nisyə,*
*Nəqd dəstimdə bu gün cami-meyim var mənim*[379].

deyirdisə, sonralar, Füzuliyə nəzirə olaraq yazdığı qəzəlində

*Fəna mülkünə aşiq girməyincə nəfsi ram olmaz,*
*Məqami-liməallah sirri anınçün təmam olmaz.*
*Könül, piri-muğanın feyzü lütfi gör ola şamil,*
*Meyi-vəhdət əyağın al ələ, bu mey həram olmaz*[380].

deyərək vəhdəti-vücud təriqəti mövqeyinə qayıdır.

Asinin bu qəzəlini «məna və fəsahətinə» görə yüksək qiymətləndirən Köçərli onu «əsl hürriyyətpərəst olub, azadə əfkar

---

[*] Kərimov R. Abdulla bəy Asinin həyat və yaradıcılığı. Bakı, Nurlan, 2009, 210 +83 s. **(red. – V.M.)**
[379] ƏYİ, yenə orada, vər. 19 a.
[380] Yenə orada, vər. 13 a.

və hürriyyəti-din və etiqad» sahibi kimi səciyyələndirmiş və göstərmişdi ki, şair üçün məscid, kilsə və deyr arasında əsla fərq yoxdur[381]. Bizcə, müəyyən bir dövr və müəyyən mənada bu fikir bir qədər doğru olsa da, təkcə dini fərqləri nəzərə almamaqla heç də tam mənasında hürriyyətpərəst olmaq mümkün deyildir.

Asinin yaradıcılığına klassik Şərq ədəbiyyatının, xüsusən özbək şairi Əlişir Nəvainin güclü təsiri olmuş, hətta Azərbaycan və fars dillərində olduğu kimi, o, cığatay dilində də gözəl şeirlər yazmışdır. Lakin bu istedadlı şair Şuşanın bəzi təəssübkeşlərinin təhriki ilə Xasay xan Usmiyevdən sonra sadə bir adama ərə getdiyi üçün 1864-cü ildə Natəvanı həcv etmişdi. Məlum olduğu kimi, bu xəbəri eşitdikdə Şamaxıdan S.Əzim, Gəncədən M.M.Naci, Qazaxdan İsgəndər ağa Şair və başqaları Şuşaya – Asinin üstünə töhmətamiz cavablar yazaraq, Natəvanı müdafiəyə qalxmışdılar. O, açıq fikirli, incə zövqlü bir qadını həcv etdiyi üçün sonra peşman olmuşdu.

F.Köçərlinin qeyd etdiyi kimi, bu cavablar içərisində öyüd-nəsihətinə və tutarlı dəlillərə əsaslanan töhmətinə görə Seyid Əzimin şeiri xüsusi ilə fərqlənirdi. Nacinin və İ.Şairin həcvlərində nalayiq sözlər olduğu halda, dostu Asinin sənətkarlıq qüvvəsini, şairlik qüdrətini təqdir, elm və kamalını tərif edən Seyid Əzimi təəccüb və heyrət götürürdü ki, belə qüvvətli zəka və gözəl qələm sahibi nə üçün bacarıq və qüdrətini bir qadını həcv etməkdə sınasın:

*Şaira, həcv deməк izzətə bir mayə deyil,*
*Həcvə adət eləmək şairə bir payə deyil*[382]*...*

deyən S.Əzim Natəvanı «əlli min oğlana deyən» qadın kimi səciyyələndirmişdi.

---

[381] Köçərli F. Materiallar. II c. I hissə. s. 150.
[382] Seyid Əzim Şirvani. Əsərləri. II c. s. 159.

Asinin qəzəl, bəhri-təvil və digər şeirlərində rast gəlinən qüvvətli təşbih, dərin fikirlər yerli-yerində işlənən ifadə, istiarə və daxili cinaslar göstərir ki, o, klassik poeziyanın incəliklərinə bələd olmuşdur. Bu cəhətdən şairin aşağıdakı qəzəlində işlətdiyi cinasa diqqət edək:

*Rəhm qıl, dəymə, səba, zülfi-kəci-dildarə,*
*Nə rəva kim, düşə vüsətdə ikən dil darə.*

*Eşqi-ruyində urub lafi-ənəlhəq guya,*
*Çəkilib zülfdə Mənsursifət dil darə.*

*Hər xədəngin səfi-mücganidə gər kəm bulsa,*
*Kimsəyə etmə güman, zülfün ara, dildarə**.

*Qoyma kim, şanə deyə zülfə, özün məhrəmsən,*
*Şərhə-şərhə ol anın tək, anı, ey dil, darə.*

*Asiya, çini-səri-zülfdə kim buldu könül,*
*Zülməti-şəb tanımaq qüdrəti yox dildarə*[383].

Bu qəzəldə işlədilən birinci dildar – ürək çəkən (gözəl), ikinci – ürəyin dara, sıxıntıya düşməsi, üçüncü – dar ağacına çəkilmək, mənasındadır. Dördüncü – aramaq, axtarmaq deməkdir; burada şair deyir ki, kipriyinin cərgəsindən bir tük əskik olsa, heç kəsə gümanın gəlməsin («mal bir yana gedər, güman min yana» məsəlini yada salmaq), onu sənin zülfünün arasında olan bu qəlbimdə, ürəyimdə axtar. Beşincidə deyilir ki, ey könül, sən yarın zülfünə məhrəm olduğun halda, qoyma ona daraq toxunsun, özün dara. Sonuncu beytdə Asi demək istəyirdi ki, zülmət gecədə adamı görmək, tanımaq mümkün

---

* Dildə ara, axtar mənasındadır. Şeirin vəzninə görə belə işlənmişdir (N.Q).
[383] ƏYİ, B – 2248, s. 2.

olmadığı kimi, dildar da qara hörüklərinin arasında giriftar olan könülləri tapıb tanıya bilməz.

Çox təəssüf ki, müasirlərinin bir çoxu kimi bu qüdrətli və məhsuldar şairin də əsərlərinin çoxu itib-batmış, ancaq cüzi bir hissəsi bizə çatmışdır.

## Fatma xanım Kəminə

Şuşa ədəbi mühitinin Natəvanla yanaşı yetişdirdiyi ikinci qadın şair Fatma xanım Kəminədir. Natəvan kimi, Kəminə də hələ sağlığında Azərbaycan şairləri arasında öz istedad və biliyi ilə şöhrət qazanmışdır.

Fatma xanım 1841-ci ildə Şuşada anadan olmuşdur. Şairənin atası Fəna təxəllüsü ilə şeirlər yazan Mirzə Bəybaba[*] əslən Cənubi Azərbaycanın Gərmərud qəsəbəsindəndir. Vaxtilə babası iyirmi yaşında köçüb Şuşaya gəlmiş, Cəfərqulu xanın atası Məhəmmədhəsən xanın sarayında mirzəlik etmişdir.

Təlim-tərbiyəsini Şuşada alan Kəminənin ədəbiyyata olan marağı və şəxsi mütaliəsi onda erkən şeir yazmağa həvəs oyatmış, hələ gənc yaşlarında Azərbaycan və fars dillərində yazdığı qəzəlləri ilə Şuşa ziyalılarının diqqətini cəlb etmişdir. M.Müctəhidzadə onun haqqında yazır ki, əgər Kəminə «qeyri bir məmləkətdə olsaydı, hər ayinə zivəri-təbi üns məcalisinin mərtəbəsi olurdu. Və şahbazi-büləndpərvaz xəyalı tacüd-dövlə kimi soltanüş-şüəranın başlarında dolanırdı»[384]. Kəminənin istedadını, fəsahətli qələmini Şərqin bir çox qadın şairləri ilə müqayisə edən təzkirə müəllifi Sözünə davam edərək, onu belə səciyyələndirmişdir: «…Mərifəti sayəsində Məhsəti və

---

[*] Qeyd: P.Makulunun "Ədəbi məlumat cədvəli"ndə şairənin atası Mirzə Bəybaba Fəna kimi verilmişdir (Bax: Göstərilən əsər, s. 193). Mirzə Bəybaba Fəna 1787-ci ildə Şuşada anadan olmuş, 1867-ci ildə orada vəfat etmişdir. O, bir şair kimi "Təzkireyi-Nəvvab"da və "Riyazül-aşiqin"də olduğu halda P.Makulunun cədvəlinə düşməmişdir (N.Q).

[384] M.Müctəhidzadə. Riyazül-aşiqin. s. 176.

Nigar xanım və Nurcahan və Ayişə və Teyyibə kimi zənan isrə fəxriyyəsi oluban çün gül və lalə xatunların sərində gəzərdi»[385].

İstedadlı şairə 1898-ci ildə Şuşada vəfat etmişdir[*].

Kəminə haqqında ilk məlumata hələ şairənin öz sağlığında yazılmış «Təzkireyi-Ziyai»də rast gəlinir. Burada Qarabağ şairlərindən Mirzə Rəhim Fəna, Əbülhəsən Şəhid və Mirzə Ələsgər Növrəslə bərabər, Fatma xanım Kəminə haqqında da məlumat verən müəllif başqa şairlərə nisbətən ondan bir qədər geniş bəhs etmişdir. Burada yazıldığına görə, Kəminə cavanlığında ərə getmiş, üç-dörd il keçdikdən sonra əri vəfat etmişdir. O, ilk məhəbbətinə sadiq qalaraq başqası ilə ailə qurmamışdır. Təzkirədə məhərrəm ayında Kəminənin təkyə məclisi düzəltməsindən, Fənanın onu keyf məclisi adlandırıb, şairəni həcv etməsindən, bunun üstündə onların arasında baş verən inciklikdən, Kəminənin onun həcvinə cavab yazmasından və nəhayət, Şirvan şairlərinin Fənanı məzəmmət etmələrindən də bəhs edilir[386].

Fənanın Kəminəni yersiz həcv etməsi xəbəri tezliklə bütün Azərbaycana yayılmış, yerbəyerdən onu müdafiyə qalxmışlar. Vaxtilə Natəvana həcv yazdığı üçün A.Asini töhmətləndirən S.Əzim bu dəfə də həmin xəbəri eşitcək dərhal:

*Agah ol, ey Fənayi-təbəhkarü pürhəvəs,*
*İqdam etməyib sən edən karə hiç kəs*[387]

---

[385] Yenə orada.
[*] Fatma xanım Kəminə. Seçilmiş şeirlər. Bakı, Gənclik, 1971, 97 s. (**red. – V.M.)**
[386] ƏYİ, D – 269, vər. 80 a. AMEA Əlyazmalar İnstitutunda mühafizə olunan bir cüngdə göstərildiyinə görə M.Fəna həmin həcvi 1880-cı ilin məhərrəm ayında yazmışdır. Burada qeyd edilir ki, Seyid Əzim Fənaya məktubunu poçt ilə göndərmişdir (Bax: ƏYİ, B – 236, vər. 74 b).
[387] S.Ə.Şirvani. Əsərləri. II c. s. 170.

beytilə başlanan mənzum məktub göndərərək, Fənanı məzəmmət etmişdir. Bundan sonra Gəncədən Fani, Qazaxdan Molla Abbas Sabit məsələyə qarışaraq, Fənanın həcvi ilə Kəminənin ona verdiyi cavabı müqayisə edib, hər cəhətdən üstünlüyü ikinciyə vermişlər[388]. Xüsusilə Mirzə Sadıq Fani Kəminənin cavabını yüksək qiymətləndirərək yazmışdır:

*Yazmış Kəminə şeiri-Fənayə əcəb cavab,*
*Verməz cavab şeirilə bu növ hiç kəs*[389].

Kəminənin ədəbi irsi tamamilə toplanmamışdır. Nəvvab onun dörd yüz fərdə yaxın şeiri olduğunu qeyd edir. Nəvvabın yazdığına görə, Kəminənin divanı olmamışdır. Lakin İ.Rüstəmbəyovun qeyd etdiyinə görə, Kəminə hələ 1883-cü ildə öz divanını «oxuyub feyzyab olmaq üçün bəylərə göndərmiş», mütaliədən sonra Süleyman bəy də onların tapşırığı ilə aşağıda bir neçə beytini verdiyimiz qəzəli yazıb, şairəyə öz təşəkkürlərini bildirmişlər:

*Ey şairə, ərbabi-süxən, ismi Kəminə,*
*Fəxrüş-şüərasən, sənə yox burda qərinə.*

*Əşari-şəkərbari-ləzizin yenə salmış,*
*Ey bəh! Nə əcəb qülqülə bu çərxü zəminə!*

*Gördüm neçə əşarını çox töhfədir, əlhəq,*
*Həqqi ki, deyər hər biri min dürri-səminə*[390].

Qəzəlin sonrakı beytlərindən görünür ki, Kəminənin şeirlərini və gözəlliyini vəsf edən bəylər onunla həmməclis olmaq arzusundaymışlar. Kəminə də öz növbəsində eyni bəhr

---

[388] F.Köçərli. Materiallar. II c. I hissə. s. 224.
[389] Yenə orada, s. 223.
[390] ƏYİ, B – 236, vər. 74 b.

və qafiyədə giley-güzar dolu bir qəzəl yazıb onlara göndərmişdir.

M.Müctəhidzadə də Kəminənin divanı olduğunu, hətta onu gördüyünü qeyd edir və təəssüflə yazır ki, «özü kimi divanı da gözdən məxfidir»[391].

Şairənin ədəbi irsindən «Riyazül-aşiqin»də, B-236 şifrəli cüngdə, müxtəlif əlyazma və fraqmentlərdə, həmçinin Köçərlinin «Materialları»nda iyirmiyə yaxın qəzəli məlumdur.

Vaxtilə M.R.Fənanın izhari-məhəbbət olaraq Natəvana yazdığı «Ağlaram» rədifli qəzəlinə cavab verənlərdən biri də Kəminə olmuşdur. Maraqlıdır ki, başqa şairlər Fənaya «Ağlama» rədifli qəzəllə cavab verdikləri halda, Kəminə də Natəvan kimi öz cavab-qəzəlini «Ağlasın» rədifi ilə yazmışdır[392].

Nəvvab təzkirəsinə yazmaq üçün başqa şairlərdən olduğu kimi, Kəminədən də şeir istədikdə o, şeirini təzkirəyə layiq bilməyib təvazökarlıqla yazmışdı.

*Təfəxxür eylərəm kim, qabili-dəftər olub şeirim,*
*Mənim də yazdığım sözlər ki, əşarə qərindir*[393].

Yusif Vəzir Çəmənzəminli xatirələrində yazırdı: «…Atam şairə Fatı xanım Kəminəni qonaq çağırmışdı. O axşam yadımdadı, uzun-uzadı münaqişə oldu. Böyük qardaşı İran şahlarının əleyhinə danışır, Kəminə onları müdafiə edirdi. Kəminə çarşıb örtər, amma üzünü gizləməzdi. Şairlər və ədəbiyyat maraqlıları onun evinə toplanardılar. Yadımdadır, bir xüsusiyyəti vardı: turş şeyləri çox sevərdi, atam bunu bilir və Ağdamdan bir-iki dəfə ona güleyşə nar göndərmişdi»[394].

---

391 M.Müctəhidzadə. Riyazül aşiqin. İstanbul, 1910, s. 176.
392 ƏYİ, B – 236, vər. 75 a.
393 ƏYİ, M – 67, vər. 259 a.
394 ƏYİ, Arx. 26, 316 (19766), vər. 42; Y.V.Çəmənzəminli. Bir cavanın dəftəri. Bakı, 1966, s. 98.

Bəzən Kəminənin “Məclisi-üns»ün üzvü olduğunu[395], bəzən də “Məclisi-fəramuşan»da şəxsən iştirak etməyib, ancaq şeirlərini göndərdiyini iddia edirlər. Lakin 1894-cü ildə Kəminənin Xorasan ziyarətindən qayıtması münasibətilə Nəvvabın yazdığı bir şeirdən görünür ki, o, “Məclisi-fəramuşan»ın üzvü olmuş və məclisin yığıncaqlarında şəxsən iştirak etmişdir. Nəvvab şeirin bir yerində yazmışdır:

اهل خاموشان بودی مبهوت همچو روزه دار
بهر ایشان عید شد چون ماه تابان آمده

روزگاری بود فراموشان ما خاموش بود
همچو بلبل بهر گل جمله غزلخان آمده
خان قراداغی و آبش، باکی و نورس مدام
شادمان بر بزم اشرت پایکوبان آمده
همچو گل شکفته یکسر آن چنان گشتند شاد
بهر اسکندر تو گویی آب حیوان آمده
از غم دوران پر از غم بود نواب هزین
شادمان شد چون کمینه شاد خندان آمده[396]

*(«Əhli-xamuşan» oruc adamlar tək şaşqın idi,*
*Onlara bayram oldu, çünki mahi-taban gəlib.*
*Vaxt var idi ki, «Fəramuşan»ımız xamuş idi,*
*Gül sevən bülbül kimi cümləsi qəzəlxan gəlib.*
*Xan Qaradaği və Abış, Baki və Növrəs müdam,*
*Addım-addım bu izzət bəzminə şadiman gəlib.*
*Açılmış güllər kimi hamısı yeksər şənlənib,*
*Üzgün İsgəndər üçün sanki abi-heyvan gəlib.*
*Dövran qəmi ilə dolmuş idi bu həzin Nəvvab,*
*Şadiman oldu, çünki Kəminə şad-xəndan gəlib).*

---

[395] Bax: Məmmədov B. Fatma xanım Kəminə, “Elm və həyat”, 1966, N 12.
[396] ƏYİ, M – 67, vər. 238 b; B – 5234, vər. 81 a – 81 b. Бу шеирин там филолоъи тяржцмяси цчцн бах: Mir Möhsün Nəvvab. Təzkirə. Bakı, 1998, s. 246-247.

Şairənin əldə olan şeirlərində azad sevgi, ülvi məhəbbət tərənnüm edilir. Bu qəzəllərdə sevgilisi yolunda min əzab, iztirab çəkən, vüsala can atan vəfalı aşiqin ürək çırpıntısı duyulur. Lakin şeirlərini ümumi ruhundan anlaşılır ki, onun müəllifi həmişə dərd-qəm əlində giriftardır. Bu da əbəs deyildir. Gəncliyinin ən gözəl çağında sevimli ərini vaxtsız itirən şair qəlbli bir qadının ömür bağçasına acı səmum küləyli əsdi. 23-24 yaşlarından şairənin həyatında silinməz iz buraxan bu ağır itginin yarası əbədi bir sızıltıya çevrilərək, ömrünün sonuna kimi onun sənət rübabında yanıqlı nəğmə kimi səslənmişdir.

Ərinin vəfatından iyirmi il keçməsinə baxmayaraq, 1883-cü ildə yazdığı şeirlərindən birində o, qəlbinin köhnə yaralarına işarə edərək yazmışdı:

*...İnsaf deyil bikəsin üstə dil uzatmaq,*
*Mən qalmamışam kimsənin xeyrü şərinə*[397].

Kəminənin əldə olan qəzəllərindən görünür ki, o, məclis üzvlərinin əksəriyyəti kimi nəzirələr yazsa da, həmişə yeni yol, yeni üslub axtarmışdır. Şairənin bir qəzəlindəki qafiyələrin orijinallığı bu cəhətdən səciyyəvidir:

*Saqiya, mey ver ki, mən meyxanədə küllənmişəm,*
*Qəm hücumundan qaçıb bir guşədə gizlənmişəm.*

*Qan olub könlüm mənim bu bideyi-səhba kimi,*
*Dərdi-mey tək şişədə çoxdan qalıb lillənmişəm.*

*Bir sənubər qamətü gülpeykərü Leyliväşin*
*Valehü heyraniyəm, Məcnunsifət çəllənmişəm.*

---

[397] ƏYİ, B – 236, vər. 75 a.

*Sordum ol limuyi-pəstanidən niyə pəcmürdəsən?*
*Səngdillərdən şikayət etdi kim, əllənmişəm.*

*Hər yetən bir böylə məcruh edibdir sinəmi,*
*Zəxm zəxm üstən dəyib, çoxdur yaram, illənmişəm.*

*Ey Kəminə, saqi ər yar olsa, yarə ərz elə,*
*Saqiya, mey ver ki, mən meyxanədə küllənmişəm*[398].

Bu qəzəldəki «küllənmişəm», «gizlənmişəm», «lillənmişəm», «çəllənmişəm», «əllənmişəm», «illənmişəm» qafiyələri şeirimizdə az təsadüf edilməklə bərabər, şairə tərəfindən hər bir beytin ümumi məzmununa uyğun surətdə məharətlə işlənmişdir.

## Məşədi Əyyub Baki

"Məclisi-fəramuşan»ın istedadlı üzvlərindən biri də şair Məşədi Nəsir Lövhənin kiçik qardaşı Məşədi Əyyub Hacı Sadıq oğlu Bakidir. Onun haqqında bizə ilk məlumatı M.Nəvvab verir. Bakinin zahiri əlamətlərini və xasiyyətini təsvir edərək Nəvvab yazmışdı ki, bədəncə zəif, pikazə əhval, xoş sifət, xoş danışan, zarafatcıl bir şəxsdir[399]. Burada qeyd edildiyinə görə, hicri tarixlə 1309 (1891)-cu ildə Bakinin iyirmi beş yaşı olmuşdur. Buna əsasən təxmin etmək olur ki, o, 1866-cı ildə Şuşa şəhərində doğulmuşdur. Baki mollaxana təhsilindən sonra Şuşanın tanınmış alimlərindən hesab edilən Mirzə Kərimdən xüsusi təhsil almış, klassik Şərq ədəbiyyatı ilə yaxından tanış olmuşdur. O özünün «Riyazül-məhəbbət»

[398] ƏYİ, M – 237, vər. 57 b.
[399] ƏYİ, M – 67, vər. 353 a.

(«Məhəbbət bağı») adlı divanının[*] müqəddiməsində yazır: «…mən yeddi il aliməqam Mirzə Kərim İbn Hacı Məhəmməd bəy Qarabağidən – Qarabağ ədəb evində təhsil almışam»[400].

Baki hələ Mirzə Kərimin yanında oxuyarkən bədii yaradıcılığa maraq göstərmiş, hətta bu barədə müəllimi ilə mübahisəyə də girişmişdi. Şair divanının müqəddiməsində yazır ki, «mən onunla şairlik məsələlərində bəzi mübahisələr etsəm də, bunu zövq müxtəlifliyi hesab edirəm. Məncə, şairin əsl mahiyyəti məhəbbətdir»[401].

Nəvvabdan sonra Baki haqqında yazan M.Müctəhidzadə bu itedadlı şairin sənətkarlığını yüksək qiymətləndirərək göstərir ki, onu təbi rəvan və uzun, ömrü isə boyu kimi qısa olmuşdur. Doğrudan da, Baki cəmi qırx üç il ömür sürmüş, 1909-cu il avqust ayının 5-də vəfat etmişdir.

M.Ə.Bakinin əlimizdə olan ədəbi irsi əsasən onun yuxarıda adı çəkilən divanından ibarətdir. Doxsan vərəqlik bu divan sondan naqisdir, ya tamamlanmamış, ya da son vərəqləri cırılıb düşmüşdür. Şair bu divanın tərtibi haqqında belə yazır: «Yüksək məqamlı, paklıq və nəcabət sahibi şuşalı Mir Möhsün ağa Nəvvab… xahiş etdi ki, dostlara yadigar olmaq üçün mən öz əsərlərimi bir yerə toplayım»[402]. Beləliklə, o, Nəvvabın xahişi ilə pərakəndə halda olan şeirlərini bir yerə toplayıb iyirmi beş yaşında ikən 1891-ci ildə həmin divanı tərtib etmişdir. Təvazökar şair sonra yazır: «Oxuyanlardan xahiş edirəm ki, bu şeir məcmuəmə açıq gözlə baxıb, onda buraxılan nöqsanları islaha çalışsınlar». Divanda şairin iki min beytə qədər Azərbaycan və fars dillərində qəzəl, qəsidə, təxmis, tərcibənd, rübai, bayatı, şikəstə və fərdləri toplanmışdır. Lakin

---

[*] Həmin divan haqqında ilk dəfə M.Sultanov məlumat vermişdir. Bax: "Ədəbiyyat və incəsənət" qəzeti, 1966, 19 noyabr, N 47.

[400] Fars dilində yazılmış həmin müqəddimədən gətirilən sitatlar M.Sultanovun sözügedən məqaləsindən götürülmüşdür (N.Q).

[401] ƏYİ, B – 5615, Əlyazması səhifələnməmişdir.

[402] ƏYİ, B – 5615. Əlyazması səhifələnməmişdir.

bəzi cüng, fraqment və arxiv materiallarında da Bakinin şeirlərinə rast gəlinir ki, onlar həmin divana düşməmişdir. Bu da onu göstərir ki, divan tərtib edilərkən ya bu şeirlərin bir qismi onun özündə olmamış, ya da bunları şair sonralar yazmışdır.

Nəvvabın «Təzkirə»sinə avtoqraf-xatirə yazanlardan biri də Məşədi Əyyub Bakidir. O, bu təzkirəyə özünün azərbaycanca iyirmi altı qəzəl, bir müxəmməs, bir təxmis, farsca isə on qəzəl və on rübaisini yazmışdır.

Baki yaradıcılığının əsasını ədəbi məclis üzvlərinin əksəriyyətində olduğu kimi, klassik poeziyanın qəzəl canrı təşkil edir. Əldə olan qəzəllərindən görünür ki, o, Şərq poeziyasına dərindən bələd olmuşdur. Şairin saf və təmiz məhəbbət tərənnüm edilən qəzəllərində oynaqlıq, sadəlik və dil anlaşıqlığı bir vəhdət halında birləşmişdir. Daxili qafiyə və təkrir bu qəzəllərin səciyyəvi xüsusiyyətini təşkil edir. Bu cəhətdən şairin iki qəzəlinin bir neçə beytinə fikir verək:

*Viran olu könlüm evi viranə görəndə,*
*Viranə virantər olu viranə görəndə.*

*Billahi, tutub od, yanıram şəm tək axır,*
*Hər yerdə ki, xakistəri-pərvanə görəndə*[403].

və yaxud:

*Məni eşq əhlinin divanına divanə yazmışlar,*
*Könül mülkün, əzizim, dərdi-eşqə xanə yazmışlar.*

*Könül xaki-bəladən, abi-qəmdən çün xəmir oldu,*
*Bu viran olmuşu ol vəqtdən viranə yazmışlar.*

---

[403] ƏYİ, B – 5615.

*Qədim nun, taleyim dun, həm sirişkim xun, özüm məhzun.*
*Görən dibaçeyi-ömrümdə, aya, ta nə yazmışlar[404]?*

Ədəbi məclislərdə müşairə zamanı deyilən qəzəl, rübai və yaxud fərdə eyni qafiyə və rədiflə bədahətən cavab vermək şairdən xüsusi hazırlıq, geniş məlumat və məharət tələb edirdi ki, bu cəhətdən Baki xüsusilə seçilirdi.

Nəvvab 1892-ci ildə "Məclisi-fəramuşan»da məşğələ zamanı:

*Aşiq oldum nagəhan bir şuxi-bipərvayə mən,*
*Saldım axır öz-özümü bir əcəb qovğayə mən.*

mətləli qəzəlini yazıb, oradakılardan cavab istəyir. Nəvvaba cavab olaraq, Fatma xanım Kəminə, Abdulla bəy Abış və Baki bədahətən qəzəl demişdir. Bakinin:

*Kafərəm, cana, səni etsəm bərabər ayə mən,*
*Verməzəm dırnağını, billahi, yüz dünyayə mən[405].*

beytilə başlanan qəzəli həmin münasibətlə deyilmişdir.

O, Gövhər ağanın məşhur

*Əfsus ki, yarım gecə gəldi, gecə getdi,*
*Heç bilmədim ömrüm necə gəldi, necə getdi.*

beytini tamamlamaq məqsədilə aşağıdakıları ona əlavə etmişdir:

*Könlüm aram dəxi olmadı, dönsün qanə,*
*Ta deyəm bir-bir necə gəldi, necə getdi.*

---

[404] Yenə orada.
[405] ƏYİ, Arxş 37, Q – 15 (341).

*Öldürüb hicri məni, vəslilə əhya elədi,*
*Şükr, dünyadə ki, ömrüm vecə gəldi, vecə getdi*[406].

Ədəbi məclislərin başqa üzvləri kimi, Baki də görkəmli Şərq klassiklərini sevmiş, onların irsinə hörmətlə yanaşmışdır. O, Füzulinin:

*Vəfa hər kimsədən kim, istədim, ondan cəfa gördüm.*
*Kimi kim, bivəfa dünyada gördüm, bivəfa gördüm.*

beyti ilə başlanan qəzəlinə nəzirə olaraq:

*O gündən könlümü zənciri-eşqə mübtəla gördüm,*
*Günüm dərd ilə keçdi, bəxtimi daim qara gördüm*[407].

mətləli qəzəlini yazmışdır:

Onun istər orijinal, istərsə də Nəvvab, Natəvan və başqalarının qəzəllərinə yazdığı nəzirələrində dahi şair Füzulinin təsiri açıq-aydın görünməkdədir.

Baki farsca-azərbaycanca bir müləmmə də yazmışdır. Hər beytinin birinci misrası farsca, ikinci misrası Azərbaycanca olan bu müələmmə-qəzəldən nümunə üçün iki beyt verməklə oxucuları onunla tanış edək:

*Beya ki, bi to nə girəd deləm qərar, ey dust,*
*Gecə səbahə kimi eylər ahü zar, ey dust.*

*Beya, beya ki, ze seyli-sirişki-xunin,*
*Həsari-qəleyi-ömrümdü tarümar, ey dust*[408].

Mənaca bir-birinə bağlı olduğu üçün bu misraların tərcüməsini bütünlüklə veririk: (Ey dost, gəl ki, sənsiz ürəyim

[406] ƏYİ, B – 5615.
[407] ƏYİ, M – 67, vər. 368 a.
[408] Yenə orada, vər. 365 b.

qərar tutmayır, gecələr sabaha kimi ahüzar edir. Ey dost, gəl, gəl ki, qanlı göz yaşımdan ömür qalasının hasarı tarümardır).

Bədii yaradıcılığının əsasını, yuxarıda qeyd etdiyimiz kimi, klassik poeziya təşkil etsə də, Baki başqa məclis üzvlərində az təsadüf edilən bayatı və şikəstə formasında gözəl və ahəngdar şeirlər yazmışdır. Bu şeirlər səmimiliyi və axıcılığına görə xalqın əsərlərdən bəri yaşadıb cilaladığı bayatılardan seçilməyir.

*İşim düşüb bəndə yar,*
*Canım qalıb səndə yar,*
*Məni Allah öldürsün,*
*Sən də qurtar, mən də yar.*

*Düz dağlar, əyri dağlar,*
*Düzəlməz əyri dağlar,*
*Gözün dağı düz çəkər,*
*Qaşların əyri dağlar.*

*Mən aşiqəm göz yara,*
*Könül yara, göz yara,*
*Nə xoşdur can verəydim,*
*Baxa-baxa göz yara*[409].

Şairin şikəstələrinin də dili sadə və şirindir:

*Könül, səni and verirəm Allaha,*
*Az sızılda, az yan belə, az ağla*[410].

Bakinin qəzəllərində olduğu kimi, bayatı və şikəstələrində də gözəl cinaslar, təşbeh və mübaliğələr ustalıqla işlədilmişdir.

---

[409] ƏYİ, B – 5615.
[410] Yenə orada.

## VIII Fəsil

## «MƏCMƏÜŞ-ŞÜƏRA»

XIX əsrin ortalarında, «Gülüstan», «Divani-hikmət» və "Əncümənüş-şüəra» məclislərinin zəifləmiş olduğu bir zamanda Şamaxıda «Beytüs-Səfa», Lənkəranda «Fövcül-füsəha» yeni qüvvə ilə, həvəslə fəaliyyətə başlamışdı. Bu zaman Bakıda Mirzə Bağır, Mirzə Məhəmmədəli Binəva və digər onlarca şair yaşayırdı. Bakıda bir qrup şair var idi ki, onlar çayxana və xüsusi evlərdə, yaxud toy məclislərində meyxana və bədihələr deyərək, öz «istedadlarını» yoxlamaq üçün yarışırdılar. Bədihəguluq başqa şəhərlərə nisbətən Bakıda daha çox inkişaf etsə də, şairlərin hamısı onunla məhdudlaşmırdılar. Başqa bir qrup şair də yetişirdi ki, onlar Azərbaycanda şöhrət tapmış ədəbi məclislərin təsiri ilə Məhəmməd ağa Cürminin mənzilində, bilavasitə onun rəhbərliyi altında özlərinin xüsusi məclislərini – "Məcməüş-şüəra»nı («Şairlər məclisi»ni) yaratmışdılar.

Prof. F.Qasımzadə "Məcməüş-şüəra»nın 1880-ci illərdə yarandığını göstərir[411]. Müəllifi məlum olmayan bir əlyazmada isə onun 1860-cı ildə təşkil olunduğu qeyd edilmişdir[412]. H.Zeynallı da "Məcməüş-şüəra»nın 1860-cı ildə təşkil edildiyini söyləyir[413]. «Şairlər məclisi» məcmuəsində isə "Məcməüş-şüəra»nın adı 1860-1870-ci illərdə təşkil edilən məclislər sırasında çəkilir[414].

---

[411] Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. s. 285.
[412] ƏYİ, B – 1620, vər. 1 a.
[413] ƏYİ, C – 218, s. 14.
[414] "Şairlər məclisi" məcmuə. Təbriz, 1945, s. 385.

Lakin "Məcməüş-şüəra»nın əsas üzvlərinin təvəllüd tarixləri göstərir ki, onlar 1860-ci illərdə ədəbi məclis təşkil edə biləcək dərəcədə yetkin olmamışlar. Bizcə, "Məcməüş-şüəra» XIX əsrin 70-ci illərində fəaliyyətə başlamış olsa da, o, yığıncaqlarının gedişi və məzmunu cəhətdən yalnız 1880-cı illərdə yetkin bir şəkil almışdır*.

Təşkil edildiyi ilk vaxtlarda beş-on nəfər üzvü olan "Məcməüş-şüəra»nın sonralar otuzdan artıq iştirakçısı olmuşdur. Fəaliyyətinin müxtəlif dövrlərində aşağıda adları göstərilənlər həmin məclisdə iştirak etmişlər: Məhəmməd ağa Cürmi (sədr), Ağadadaş Sürəyya (1850-1900), Mirzəağa Dilxun (1870-1912), İbrahim Zülali, Vəhab Vahib, Mirzə Rzaqulu Həzarə, Mirzə Mehdi, Əlabbas Müştaq, Mirzə Məhəmməd Müsəvvir (1855-1901), Mirzə Əbdülxalıq Yusif (1853-1924), Mikayıl Seydi (1862-1916), Mirzə Əbdülxalıq Cənnəti (1855-1931), Ağadadaş Müniri (1863-1940), Mirzə Hadi Sabit, Hüseyn bəy Vəhdəti, Əbülhəsən Vaqif (1845-1914), Ağakərim Salik (1849-1910), Haşım bəy Saqib (1870-1931), Seyid Zərgər (1880-1920), Məşədi Azər Buzovnalı (1870-1951), Şahin Nardarani (1862-1909), Mirzə Məhəmmədəli Binəva (1822-1892), Məhəmməd İsmayıl Asi Buzovnalı, Nüsrət, Hacı Muxtar Müznib Zabrati, Mirzə Həsib Qüdsi** (1828-1908), Balasadıq, Ahi, Qail, Qızxanım, Müztər, Mirzə Yusifi, Xürrəmi, Rahil, Sadıq Həsənzadə, Mirzə Bağır (1810-1882), Mina və başqaları***.

---

* Qeyd: Məclisin yaranma tarixi ilə bağlı N.Qarayev ilə Sona Xəyalın fikirləri üst-üstə düşmür. Bax: Sona Xəyal. Əliabbas Müznib Bakı və Bakılı şairlər haqqında. Bakı, Nurlan, 2003, s. 31 **(red. – V.M.)**

** Mirzə Həsib Qüdsi. Mehriban qardaş tək ülfət eyləyək. Bakı, Nurlan, 2004, 82 s. **(red. – V.M.)**

*** Bax: Sona Xəyal. Əlli yaşlı xəzinədən əlli məqalə. Bakı, Ünsiyyət, 2000, 144 s. **(red. – V.M)**

Məclisin rəhbəri M.Cürmi idi, Sonralar Ağadadaş Sürəyya[****] məclisin katibi seçilmişdir. “Məcməüş-şüəra»da yazılan bütün qəzəl, qəsidə, məktublar, müşairələr və qeyri yazışmaları o, toplayıb saxlayırmış. Deyilənə görə, bu sənədlərin çoxu vaxtilə onun evində olmuş, sonra qardaşı Kərbalayi Rəsulun əlinə keçmişdir. Lakin onların taleyi hələ də məlum deyildir.

AMEA Əlyazmalar İnstitutunda Bakı şairlərindən Məhəmməd İsmayıl Asinin qəsidə və növhəcatı, Müznibin mənzumələri, M.H.Qüdsinin dini mənzumələrdən ibarət «Gülşəni-Qüds» məcmuəsi və «Gülşəni-vəhdət» adlı farsca divanı, Sadıq Sidqinin müxtəlif şeirləri, A.Sürəyyanın avtoqraf divanı, Cənnətinin Azərbaycan və fars dillərində yazılmış əsərlərinin çox hissəsi mühafizə olunur. Bunlardan başqa, bəzi cüng və fraqmentlərdə də “Məcməüş-şüəra» şairlərinin əsərlərindən nümunələrə rast gəlmək olur.

Prof. F,Qasımzadə, H.Zeynallı və başqa müəlliflər XIX əsr ədəbiyyatından, onun bəzi nümayəndələrindən danışarkən ədəbi məclislərə toxunduqda Bakıda da belə bir məclisin yaranması haqqında məlumat vermişlər.

Digər ədəbi məclislər kimi, “Məcməüş-şüəra»nın da tərkibi zümrə cəhətdən müxtəlif olmuşdur. Lakin bu məclisin ən çox seçilən cəhəti onun iştirakçılarının xalqın ən aşağı təbəqəsinin nümayəndələri olmasındadır. Əgər Şuşa ədəbi məclislərinin tərkibi yoxsullaşmış bəy sinfinin və tacirlərin, Lənkəran məclisində kəndli şairlərin nümayəndələri iştirak edirdilərsə, “Məcməüş-şüəra»nın üzvlərinin əksəriyyəti xırda alverçi, müdərris, gəmi fəhləsi, rəssam və xanəndələr olmuşdur.

Başqa ədəbi məclislərdə olduğu kimi, burada da klassiklərlə yanaşı, müasir şairlərin əsərləri oxunub müzakirə edilərdi. Belə şairlərdən birisi də Bahar Şirvani idi. Ə.Cənnətinin

---

[****] Bax: Sona Xəyal. Əliabbas Müznib Bakı və Bakılı şairlər haqqında. Bakı, Nurlan, 2003, s. 31. **(red. – V.M.)**

Baharın vəfatı münasibətilə yazdığı bir şeirində onu «ədibi-xütteyi-Qafqaz», «Şəhiri-səfheyi-aləm», Şirvanı isə «əhli-zövq üçün mədrəsə» adlandırması[415] göstərir ki, Şirvan və Bakı şairləri bir-birləri ilə yaxından əlaqədə olmuşlar. Bahar Şirvaninin "Məcməüş-şüəra»da iştirak etməsi haqqında əlimizdə məlumat yoxdur və ola bilsin ki, o, həmin məclisdə iştirak etməmişdir. Lakin Ə.Cənnətinin şeirindən görünür ki, onun və başqa kamil sənətkarların əsərləri "Məcməüş-şüəra»da oxunaraq müzakirə edilərdi.

"Məcməüş-şüəra»da nəzirəçilik Qarabağ və Şamaxı şairləri arasında olduğu qədər geniş yayılmasa da, onlar bundan xilas ola bilməmiş, daha çox tənzir edilməyə layiq olan qəzəllərə yeri gəldikcə qələm qatmışlar.

Bakı şəhərində, mərkəzdə yaşamaları "Məcməüş-şüəra» şairlərinin dövri mətbuatla daha yaxından əlaqə saxlamaları üçün imkan yaradırdı[*]. XX əsrin əvvəllərində "Məcməüş-şüəra» şairlərindən Ə.Cənnəti, S.Zərgər, M.Seydi, M.Azər, M.H.Qüdsi və başqaları «Dirilik», «Babayi-Əmir», «Zənbur», «Arı» və qeyri bu kimi dövri mətbuatda çıxış etMişlər. Bunların içərisində özünün mütərəqqi, maarifçi ideyaları ilə Ə.Cənnəti xüsusilə seçilirdi.

1915-ci ildə «Dirilik» məcmuəsi Sədidən qitələr seçib tərcümə etmək üçün elan verdiyi zaman Ə.Yusif, S.Zərgər, Ə.Cənnəti, M.Azər və başqaları bu müsabiqədə fəal iştirak etmişdilər. Yeri gəlmişkən qeyd etmək lazımdır ki, "Məcməüş-şüəra»da tərcüməçiliyə xüsusi diqqət verilirdi. S.Seydi Nəvai əsərlərindən tərcümə etdiyi kimi, Müniri Firdovsinin «Şahnamə» əsərindən «Rüstəmin Səəd ibn Vəqqasa məktubu» hissəsini, Məşədi Azər yenə də «Şahnamə»nin bir neçə parçasını nəzmlə tərcümə etmişdir.

---

[415] ƏYİ, B – 1545, vər. 40 a – 40 b.

[*] Dövri mətbuatda ədəbi məclis üzvlərindən ilk dəfə "Əkinçi" qəzetində Seyid Əzim və Məxfi çıxış etmişdir.

“Məcməüş-şüəra»da şeir-sənət məsələləri ilə yanaşı hikmət, nücum, təbiət elmlərinə maraq və səy daha artıq idi. Ə.Cənnəti şeirlərinin birində məclisdə gedən məşğələ və onun məzmununa işarə edərək yazmışdı:

*Təbimiz mayildi daim çünki hikmət elminə,*
*Bu üsul ilə arardıq yol təbiət elminə,*
*Göydə yıldızlar bizə rəhbərdi heyət elminə,*
*Hər qədəm miqyas idi bizcə müsahət elminə,*
*Gah yerdən, gah göydən bəhs edərdik çün həkim,*
*Axtarardıq canibi-məqsudə rahi-müstəqim*[416].

Burada Ə.Firdovsi, Şeyx Sədi, Füzuli kimi klassiklərin əsərləri, məşhur filosof şair Ömər Xəyyamın rübailəri dərindən öyrənilirdi. Onun fəlsəfəsi məclis şairləri tərəfindən maraqla təhlil və təqdir edilirdi. Məsələn, Ə.Cənnəti Xəyyamın fəlsəfəsinə, sənətkarlıq qüdrətinə yüksək qiymət verərək yazmışdı:

*Xəyyam, sənin mislini əyyam yetirməz,*
*Bir sən kimi fərzaneyi-ba nam yetirməz,*
*Yüzlərcə Ömərlər doğurub ümmi-təbiət,*
*Şair yetirərsə yenə Xəyyam yetirməz*[417].

“Məcməüş-şüəra»da ciddi fəlsəfi fikir və mülahizələr yürüdürlər, cəmiyyət, onun insan şüurunda yaratdığı təsir və s. barədə geniş mübahisələr açılardı. Ə.Cənnətinin aşağıda verdiyimiz mülahizəsi “Məcməüş-şüəra»nın ümumi səciyyəsinə xas olmasa da, hər halda orada yetişən bir şairin ictimai quruluşun insan şüuruna təsirini dərk etməsini müəyyənləşdirmək üçün əhəmiyyətlidir: «Kəlamımdakı fəlsəfələr bir-birinə zidd göründükdə, mühitimin təsiri məcburiy-

---

[416] ƏYİ, B – 1545, vər. 85 a.
[417] Yenə orada, vər. 85 a.

yətindən naşi olduğu nəzərə alınarsa, məzuriyyətə ehtiyac qalmaz. İnsan, nə qədər olursa-olsun, yenə də zəmanə sahib-nüfuzlarının əlindən giribanın xilas etməkdə aciz olduğun fəramuş etməməli. Elm və maarif günəşi dünyaya nə qədər nurpaş olursa da, yenə də cəhalət zülmətin layiqincə məhv edə bilməmişdir. Elektrik qüvvəsi mühəyyirəl-qövl dərəcədə işlər yapıbsa da, hənuz əsarət zəncirin qırmağa qadir deyildir. Odur ki, hər əsrdə ədiblərimiz işarələr və rəmzlərlə və bəzi əyləncələr zəminində öz məramların söyləməyə məcbur olmuşlar»[418].

Şübhə yoxdur ki, Cənnətinin belə bir fikir yürütməsində "Məcməüş-şüəra»da gedən fəlsəfi mübahisələrin xüsusi təsiri olmuşdur.

"Məcməüş-şüəra»nın fəaliyyətinin son dövrlərində cəmiyyətdəki narazılıq, azadlıq meyillərinin güclənməsi, ümumiyyətlə, iqtisadi və mədəni yeniliklərlə əlaqədar olaraq, onun üzvlərinin qəzəllərində bir mövzu yeniliyi nəzərə çarpır. Artıq məclisin qabaqcıl üzvləri, eləcə də Bakıda yaşayan digər şairlərin şeirlərində tez-tez azadlıq, hürriyyət uğrunda, həmçinin istibdad əleyhinə çıxışlara mövcud üsuli-idarədən narazılıq motivlərinə rast gəlinir. Lakin onlar hələ öz sözlərini açıq deyə bilmirdilər. Ə.Cənnəti şeirlərinin birində yazmışdır:

*Zahirən mövzumuz gərçi meyi-gülfam idi,*
*«Cəm» desəydik vazeh işdir kim, rədifi cam idi,*
*Üzrümüz məlumdur: əyyami pişəyyam idi,*
*Əsl məqsəd mərdümə hürriyyəti əfham idi,*
*Yoxdu cürət kimsədə kim, söyləsin «azadəyəm»,*
*Baki yoxdur gər desəydi «məsti-cami-badəyəm»*
*Yəni ciddi sözləri həzl ilə söylərdik müdam,*
*Kim, ona yol bulmasın divanü ya fəhmi-əvam,*
*Əhlinə gizlin deyildi çünki məzmunu-kəlam,*
*Ta müruri-vəqt ilə gəlsin ələ əsli-məram,*

[418] ƏYİ, B – 1545, vər. 286 a.

*Yetsin ol gün ki, deyək: «ey dad istibdaddən»,*
*Dad istibdaddən, fəryad istibdaddən*[419].

Azərbaycanda Sovet hakimiyyəti qurulduqdan sonra yazılmış bu müsəddəsdən görünür ki, “Məcməüş-şüəra» şairləri azadlıq ideyalarını, yeni fikirləri açıq söyləyə bilmirdilər. Onu rəmzlərlə ifadə edir, ciddi sözlərini məzəli ifadələrlə əks etdirirdilər. Əgər birisi «məsti-cami-badə» olsaydı, bu, qorxusuz imiş, lakin «azadəyəm» söyləməyə kimsənin cürəti, ixtiyarı çatmazdı.

“Məcməüş-şüəra» XIX əsrdə yaranmış ədəbi məclislərin hamısından çox davam etmişdir. O, təxminən XX əsrin on beşinci illərinə qədər fəaliyyət göstərmişdir. AMEA Əlyazmalar İnstitutunda mühafizə edilən bir məramnamə çox güman ki, onun fəaliyyətinin son dövrlərində tərtib edilmişdir. «Türk səsi» adlı şairlər cəmiyyətinə mənsub olan, qara qələmlə və ərəb əlifbası ilə yazılmış bu məramnamədə onun yazılma tarixi, yaxud cəmiyyətin təşkil edildiyi il, üzvlərinin adı göstərilməmişdir. Lakin məzmunu, kağız və xətti onun 1910-illərin ortalarında yazıldığı ehtimalını doğurur. İndiyədək heç bir yerdə çap edilmədiyindən həmin məramnamənin mətnini olduğu kimi aşağıda veririk:

«Türk səsi» türk şairləri cəmiyyətinin məramnaməsi

Bakıda türk şairləri tərəfindən təsis olunan «Türk səsi» cəmiyyətinin məramnəməsi.

1. Cəmiyyətin adı «Türk səsi» türk şairləri cəmiyyəti olacaqdır.
2. Cəmiyyətin şüarı türk vətənpərvərliyidir, türklüyün qaidəsinə və türk ədəbiyyatının genişlənməsinə çalışacaqdır.
3. Cəmiyyətin heyət idarəsi beş nəfərdən ibarətdir.

---

[419] ƏYİ, B – 1545, vər. 95 a.

4. Üç nəfər heyəti-ədəbiyyə və bir xəzinədar ilə bir katib heyəti-idarəni ediyor.
5. Cəmiyyətin əsli, fəxri, adi və müxabir olmaq üzrə dörd dürlü əzası vardır:
   a) Əsli əza birinci ayın haqqı olaraq (10) on manat, sonradan hər ay (3) üç manat verəcəkdir.
   b) Bütün şairlər əsli əza sanılacaqdır.
   v) Adi əza isə birinci ay (5) beş manat, gələcək aylar hər ayda bir manat verəcəklər.
   q) Şairlərin arasında hasil olacaq mənfəət fəqət şairlərə məxsus olacaqdır. Pul vasitəsilə hüsulə gələcək faidə isə ümumi və bərabər bölünəcəkdir.
   d) Adi üzvlərə o şeydən mənfəət çatacaq ki, kənar yerdən bir əsər alınaraq, cəmiyyətin xərcilə nəşr olunmuş olsun.
6. Əzadan birisi cəmiyyətin məsləkinə müğayir hərəkətdə bulunarsa, müvəqqətən həyəti-idarənin qərarı ilə heyətdən fərd olunacaq və heyəti-ümumiyyənin ictimainə qədər baqi qalmalıdır.
7. Cəmiyyət ətrafından kənar olanlar irəlidə verdikləri pulları geri almağa salahiyyətləri yoxdur və pullarına təhsis mənfəəti qəti surətdə geri alınmayacaqdır.
8. Cəmiyyətin fəxri və əsli əzasından mürəkkəb olmaq üzrə üç ayda bir dəfə ümumi-ictimai əqd olunacaq və heyəti-idarə tərəfindən bu ümumi ictimaidə cəmiyyətin işlənməsi haqqında izahat veriləcəkdir.
9. Cəmiyyətin ümur və xüsusiyyətinin müzakirəsi üçün heyəti idarə həftədə bir ictimai verəcəkdir.
10. İcab edən yerlərdə cəmiyyətin vəkili olacaq və bu vəkil cəmiyyət ilə daimi surətdə müxabirədə bulunacaqdır.
11. Cəmiyyətin heyəti-idarəsi tərəfindən imzalanmamış övraq mötəbər sanılmayacaqdır.
12. Əzadan hər biri cəmiyyətin məslək və mənfəətinə dair bilcümlə təsəvvüratını təhrirən heyəti-idarəyə təbliğ edə bilmək haqqına malikdir.

13. Cəmiyyətin xəzinəsində (kassasında) olan pullar xəzinədar vasitəsilə banklara veriləcək və əvəzində alınan bank dəftərçəsi ilə banknot (çek) heyəti-idarəyə təslim olunacaqdır.
14. Banklara veriləcək pullar heyəti-idarənin imzası ilə olduğu kimi, pul alınarkən banknot dəxi heyyəti-idarənin imzası ilə imzalanacaqdır.
15. Cəmiyyət teatro verməyə, qiraətxanə və kitabxanə açmağa, qəzet, məcmuə və kitabça nəşr etməyə hasili-cəmiyyət məqsədinin tərvicinə çalışacaqdır.
16. Cəmiyyətin məramnaməsi (proqramması) əksəriyyət ara ilə tövsih oluna bilər.
17. Cəmiyyətin rəsmi dili türkcə olacaqdır.
18. Cəmiyyətin mərkəz idarəsi Bakıda olacaq və iqtiza edərsə icab edəcək yerlərdə şöbəsi açılacaqdır[420].

Azərbaycan şairlərinin ilk mütəşəkkil cəmiyyətini yaratmaq, ayrı-ayrı rayonlardakı ədəbi qüvvələri vahid bir təşkilatda birləşdirmək, rəsmi surətdə öz ana dilində yazıb yaramaq, Azərbaycan ədəbiyyatını inkişaf etdirmək məqsədini qarşısına qoyan bu cəmiyyət ilk təşəbbüs olmaq etibarilə müsbət bir hal idi. Məzmunundan görünür ki, bu məramnamə hələ layihə xarakterində olmuş, tam işlənib hazırlanmamışdır. Cəmiyyətin hələlik mətbu orqanı, redaksiya heyəti və s. göstərilməmişdir.

"Məcməüş-şüəra» ədəbi məclisinin toplanışı, müzakirə olunan məsələlər və sair haqqında daha aydın təsəvvür əldə etmək üçün imkan dairəsində onun bir neçə üzvləri və onların əldə edilən əsərlərinin məzmunu ilə tanış olmaq yerinə düşərdi[*].

---

[420] ƏYİ, fraqment 1015.

[*] Prof. Şahin Fazil "Məcməüş-şüəra" şairləri haqqında yazdığı təzkirədə C.Rəmziyə istinad edərək, bu ədəbi məclisin 1923-cü ildə sovet recimi tərəfindən qapadıldığını bildirmişdir. Lakin 1980-ci ildə "Məcməüş-şüəra"nın fəaliyyəti bərpa edilmişdir. Daha ətraflı bax: Şahin Fazil. Təzkireyi-Şahin. Bakı, 2006. **(red. – V.M)**

## Məhəmməd Ağa Cürmi

“Məcməüş-şüəra»nın rəhbəri Cürmi haqqında çox az məlumat vardır. Şeirlərinə isə AMEA Əlyazmalar İnstitutunda mühafizə olunan bəzi cüng və fraqmentlərdə rast gəlinir. M.Tərbiyət onun Təbrizdən olduğunu göstərir[421]. «Təzkireyi-Ziyai»də isə bakılı olduğu qeyd edilir[422]. Burada şairin:

*Məndən ahu gözlü nigarım rəmidədir,*
*Ram etmək olmaz anı ki, səyyaddidədir,* -

qəzəli getmişdir.

Cürminin Şirvan şairləri ilə yaxın əlaqəsi olmuş, ədəbiyyat tarixindən onun S.Əzimi həcv etməsi və həmin həcvə cavabı da məlumdur. Bu göstərdiyimizdən başqa onun haqqında başqa bir məlumata rast gəlmədik. “Məcməüş-şüəra»nın müşairələri, toplanışları və s. haqqında maraqlı məlumata Ağadadaş Münirinin şeirlərində rast gəlirik.

## Ağadadaş Müniri

Bakının Hövsan kəndindən olan Ağadadaş Müniri 1863-cü ildə dənizçi ailəsində doğulmuşdur. Yeddi yaşında ikən atası vəfat etmiş, anası yetim qalan iki oğlunu məhəllədə dərzilik edərək dolandırmağa məcbur olur. Bu gözüaçıq qadın öz uşaqlarının təhsilinə qayğı göstərir, onların hər ikisini məktəbə qoyur. Köhnə üsul ilə təhsil almaqla Ağadadaş eyni zamanda bir tacirin yanında şagird olur. Lakin bu, onun təhsilinə mane olduğu üçün tezliklə oradan uzaqlaşır. Hər gün dərsdən sonra başqa işlə kəsbkarlıq edən Ağadadaş vaxtını bir an boş keçirməyir. Asudə vaxtlarını mütaliəyə sərf edərək şərq

[421] Məmmədəli Tərbiyət. Danişməndani-Azərbaycan (farsca nəşri). s. 94.
[422] ƏYİ, D – 269, vər. 326 b.

klassiklərini dərindən öyrənir. Onda çox erkən şeirə güclü bir maraq oyanmışdı. Müniri bir qədər sonra kiçik bir dükan açaraq, ətir satmaqla dolanır.

O, ətir dükanında alver edərkən şeirlə məşğul ola bilməmiş, hətta ondan əl çəkmək fikrinə düşmüşdü. Lakin sevgilisinin şeir-sənətə olan marağı və təkidi nəticəsində dükanı satır, ədəbiyyatla, şeirlə məşğul olur. Bu yolla ailəsini dolandıra bilmədiyindən yenə dükanını geri qaytarır. Bu dəfə sevgilisi təkidində israr edir, dükanı ikinci dəfə satdırır. Bundan sonra onun yoldaşları ancaq Bakı şairləri olur. Onlar gecələr bir otağa toplaşır, şeirdən ədəbiyyatdan və sair dünyəvi elmlərdən söhbətlər açardılar.

Müxtəlif peşələrlə çalışan şair 1940-cı ildə Bakıda vəfat etmişdir.

"Məcməüş-şüəra»nın üzvləri və onların şəxsi xüsusiyyətləri haqqında müəyyən qədər təsəvvür əldə etmək üçün onun bir şeirindən gətirilən misralara diqqət edək:

*Birisi Yusifiydi bu əsrin,*
*Xaliqiydi o nəzmlə nəsrin.*
*Cürmsiz Cürmi idi həm birisi,*
*Vardı nəzmü nizamə çox həvəsi*
*Həm Məstur idi*[*] *birisi çün Mani,*
*Nəqş elmində Maniyi-sani.*

*Birisi Salik idi lətifənigar,*
*Pərdə içrə bu nəğmeyi-xoşgöftar.*
*Biri Sürəyya idi, biri Pərvin,*
*Fələki-nəzmdə lətifəgüzin.*
*Birisi bəndəvüz, biri Mina,*
*Hamısı əhli-zövq, əhli-səfa*[423].

---

[*] Məstur çox güman ki, Müsəvvirin təxəllüslərindəndir.
[423] ƏYİ, Münirinin arxivi, Arx. 15, Q – 2 (11), s. 8.

Burada adları çəkilən Cürmi, Yusifi, Sürəyya, Müsəvvir, Mina həmin məclisin üzvləri olmuşlar. Müniri daha sonra yazırdı:

*Gecələr bir otaqda söhbətimiz,*
*Bir-birə mehrimiz, məhəbbətimiz.*
*Dəyişirdik bədahətən əşar,*
*Məclisi-eyşimizdi bi-əğyar*[424].

O, kimin evinə toplaşdıqlarını yazmırsa da, məlum olur ki, belə məclislərdə bədahətən şeir demək əsas məharət hesab edilirdi. Yığıncaqlar həmişə bir yerdə, bir evdə olmayırdı. Şairlər bəzən Bayıla, Bibiheybətə gedir, gözdən uzaq yerlərdə məclis qurardılar. Tez-tez Bakıya gələn S.Əzim də "Məcməüş-şüəra»da iştirak edərdi. Müniri həmin məclislərdən birini belə təsvir edir:

*Gəldi Bakuya Hacı Seyid Əzim,*
*Cəddi tək vardı onda xülqi-əzim.*
*Gecə gündüz o mədəni-ürfan,*
*Neçə gün qaldı Bakidə mehman.*
*Xoş deyib, xoş keçirdik əyyami,*
*Meyü sağərlə səbah ilə şami*[425].

Şeirin məzmunundan görünür ki, Bakıda bir neçə gün qonaq qalan S.Əzim bütün vaxtını şairlərlə söhbətdə keçirmişdir. S.Əzim hətta onlarla birlikdə bakılı İsgəndər Cabbar oğlunun toyuna də getmişdir. Bu zaman yoldaşları səfərə getməli olan Müniriyə mane olmuş, bu yolda olan hicran və çətinlikdən danışaraq, bu səfərin bir neçə gün yubadılmasına nail olmuşlar. Toydan sonra Yusif, Cürmi, Səməndər, Salik, Müştaq, Rahili, Cənnəti, Dilxun, Saqib, Seyid Zərgər,

---

424 Yenə orada, s. 16.
425 ƏYİ, Arx. 15, Q – 2 (11), s. 16.

Müsəvvir, Xürrəmi, Yusifi (bu başqa Yusifdir) və başqaları Bibiheybətə gedərək, gecəni orda keçirirlər. Lakin S.Əzim onlarla getməyərək şəhərdə qalır.

Məclisdə müşairələr müxtəlif olurdu. Onlar bədahətən bir beyt və yaxud bir neçə beyt qəzəl dedikləri kimi, klassik bir şairin, daha çox isə Füzulinin divanını açaraq, ilk dəfə rast gəldikləri bir qəzələ nəzirə yazardılar. Bu nəzirələr çox vaxt bədahətən deyilirdi. Nəzirəni kim tez qurtarsaydı gözləməli idi ki, o biri şairlər də sözlərini tamamlasınlar. Məclisin qanununa görə, tez qurtaran qalib hesab edilsə də, əsərini hamıdan sonra, axırda qurtaran yazdığını əvvəl oxumalı idi. Əlbəttə, burada nəzirənin məzmunu ilə yanaşı, sənətkarlıq cəhəti də nəzərə alınırdı. Şairlər Bibiheybətdə ikən Füzuli divanını açır, onun

*Nə görər əhli-cəfa məndə vəfadan qeyri,*
*Nə bulur şəm yaxan kimsə ziyadən qeyri,* -

mətləli qəzəli rast gəlir və ona nəzirə yazırlar. Yusif hamıdan əvvəl, Müştaq isə hamıdan sonra öz qəzəllərini oxuyurlar.

Yusifin nəzirəsi aşağıdakı beytlərlə başlanır:

*Kim görüb səndə vəfa cövrü cəfadan qeyri,*
*Kim görüb məndə ona mehrü vəfadən qeyri*[426]*?*

Mirzə Müştaq hamıdan əvvəl qurtardığı kimi, hamıdan əvvəl də oxumaq istəyir. Bunun üstündə məclisdə qızğın mübahisə gedir. Bu zaman Mirzə Səməndər, Dilxun, Salik və başqaları mübahisə edir və məclisdə bir sərinlik yaranır. Həmişə olduğu kimi, Cürmi işə qarışır və mübahisəyə son qoyulur. Cürmi onlara müraciətlə: «bir sözü deməmişdən onun dalını qanın, Hacı Seyid Əzimdən utanın, bu söz mənə də, ona da toxunur», deyərək, onları sakit edir.

---

[426] ƏYİ, Arx. 15, Q – 2 (11).

Şairlər Bibiheybətdən qayıdıb yenə toy məclisinə gedərkən Müniri onlardan ayrılıb, səfər üçün tədarük görməyə başlayır. Lakin yoldaşları onu tək buraxmırlar. Onlar tar, dəf, xanəndə ilə dəniz körpüsünə gəlib, gəmiyə minir, orada çalıb-çağırmağa başlayırlar. Seyid Əzim və gəmi kapitanı da onlarla bərabər bütün gecəni gəmidə qalır, səhərə qədər çalıb-çağırırlar. Səhər Müniri yola düşmək vaxtı olduğunu bildirdikdə yoldaşları yenə etiraz edir. Lakin S.Əzimin xahişi ilə gəmi yola düşür:

*Durdu ərz etdi Hacı Seyid Əzim,*
*Üzrxah oldu ta ol xülqi-əzim.*
*Yarü yoldaş çıxıb paraxoddan,*
*Paraxod əzmi-rah etdi ordan*[427].

Müniririn M.Ə.Sabirin «Adəmi adəm eyliyən paradır» şeirinə eyni məzmunda yazdığı[428] nəzirədən görünür ki, böyük satirikin əsərləri də "Məcməüş-şüəra»nın son dövrlərində oxunub müzakirə edilirmiş.

A.Müniririn əldə olan əsərləri içərisində «Bakının yetmiş il bundan qabaqkı və gələcəyi» adlı şeiri xüsusilə maraqlıdır. Şairin arxivində saxlanılan bu şeir XIX əsrin ikinci yarısında Bakı mənzərəsini təsəvvür etmək üçün maraqlı sənəddir.

İnqilabdan qabaq xalqın geridə qalmasına təəssüf edən şair şeirlərində maarif və mədəniyyəti təbliğ edərək yazırdı ki, biz hünərdən xali deyilik, aysız və günəşsiz bir səmayıq, şəkərsiz qamışıq, dilimiz olduğu halda bihudə danışırıq.

**Ağa Kərim Salik**

[427] Yenə orada.
[428] Yenə orada.

“Məcməüş-şüəra»nın fəal üzvlərindən olan Ağa Kərim Salik müqtədir şair olduğu kimi, həm də öz dövrünün istedadlı xanəndə və musiqişünası idi.

Ağa Kərim Salik Rəsulov 1849-cu ildə Bakıda doğulmuşdur. Müstəqil yaradıcılığa meyil etməyə çalışan Salik Füzuli məktəbinin nümayəndələrindən olsa da, həmişə nəzirəçilikdən qaçmışdır.

Salik ədəbiyyatı, xüsusən Şərq ədəbiyyatını, klassik şeiri, onun qayda-qanunlarını gözəl bildiyi kimi, həm də məşhur musiqişünas olmuşdur. O, musiqi təhsilini həm oxumaq, həm də çalmaqda xüsusi istedada malik olan Mirzə Səttar Ərdəbilidən almışdır. Ustadından musiqinin bütün qayda və incəliklərini öyrənən Salik müqtədir və kamil bir sənətkar dərəcəsinə qədər yüksəlmiş, dövrünün məşhur xanəndəsi kimi tanınmışdır. Musiqidə çətin və mübahisəli bir məsələ olduqda müasirləri həmişə ona müraciət etmişlər.

Salik həzin ahəng və guşələr yaratmaqda xüsusi şöhrət qazanmışdı. O zaman Bakıda yaşayan xanəndə və tarzənlərin, musiqiçilərin bir qisminə Salikin güclü təsiri olmuşdur.

O, hümayun, dügah, rast dəstgahlarını daha çox sevmiş və bu muğamları «onun kimi oxuyan olmayıb»[429]. Musiqi sənətini bütün «təfərrüatına qədər təhsil və təlim edən» Salik bir çox xanəndələrin və musiqi xadimlərinin yetişməsinə xüsusi əmək sərf etmişdir. Hacı Hüsü, Sadıq, Mənsur və Süleyman kimi məşhur xanəndələr dəfələrlə Salikin məclisində olmuş, onun sənətkarlığından istifadə etmiş və öyrənmişlər[430].

“Məcməüş-şüəra»da Salik kimi şair-xanəndə ilə yanaşı, Yusifi adlı mahir tarzən də iştirak edirdi. Müniri şeirlərindən birində onun məclisdə iştirakı ilə yanaşı, xarici görkəmini, qiyafəsini təsvir etmiş, hətta atasının adını da göstərmişdir:

---

[429] Əliverdibəyov A. Musiqi tarixi. ƏYİ, B – 5007, s. 259.

[430] “Xalq ədəbiyyatı həyatdan doğar // Kommunist qəzetinin əlavəsi, N 277.

*Başqa bir Yusifi də vardı zərif,*
*Bir lətifə məqal, ba tərif.*
*Qısa boy tarzəndi, nə əcəri*
*Vardı hər bir muğamdan xəbəri,*
*Atası vardı Məşəd Ənnaqi nam,*
*Mötəbər şəxsdi cəhanda bənam*
*Öğlu Yusif geyərdi qıssa libas,*
*Barmağında qızıl üzük, almas*[431].

Həmin şeirdən anlamaq çətin deyildir ki, Salik "Məcməüş-şüəra»da özünün xüsusi dəstəsi ilə iştirak edərmiş.

Mehmannəvaz və bütün var-yoxunu musiqi sahəsində sərf edən Salik 1910-cu ildə vəfat etmişdir.

## Mirzə Bağır

"Məcməüş-şüəra»nın sənətkar-şair üzvlərindən biri də gözəl rəssam və həkim Mirzə Bağırdır. Bağır Əlimirzə oğlu 1810-cu ildə Bakıda xarrat ailəsində doğulmuşdur. O, yeddi yaşında ikən atasının itirmiş, dayısının və anasının himayəsində böyümüşdür. Zəmanəsinin məşhur təbibi olan dayısı Mirzə Abbas kiçik Bağırın tərbiyəsilə bir qədər özü məşqul olduqdan sonra bir alimin yanına qoymuşdur. Bağır burada ərəb və fars dilləri ilə yanaşı, dövrünün elmlərinə də bələd olur, dayısı isə müntəzəm olaraq ona təbabətdən dərs deyirdi.

O, 15-16 yaşlarından şeir deməyə başlamış və şeirlərini Bağır təxəllüsü ilə yazmışdır. M.Bağır 1854-cü ildə Bakı gömrük idarəsində xaricdən gələn mallar şöbəsinin ambardarlığına təyin edilmişdir. O, səkkiz il bu vəzifədə çalışmışdır.

M.Bağır 1882-ci ildə yetmiş iki yaşında ikən vəfat etmişdir.

Şairin nəvəsi Əminə Bağırzadənin yazdığına görə, ondan bir sandıq kitab qalıbmış. Evdə artıq yer tutduğuna görə

---

[431] ƏYİ, Arx. 15, Q – 2 (11), s. 18.

Böyük Vətən müharibəsindən əvvəl o, İsmayıl Səfərov adlı bir nəfərdən xahiş edir ki, yararsız kitabları atmaq üçün onları seçsin. İ.Səfərovla Əminə xanım həmin sandıqda olan pərakəndə vərəqlərdən şairin iki dəftərə qədər şeirini toplamışlar. Bunlardan başqa, şairin böyük bir avtoqraf divanı da olmuşdur ki, sonralar itib-batmışdır. Bağırın rəsm əsərləri də divanı kimi yoxa çıxmışdır*. M.Bağırın pərakəndə şeirləri köçürülmüş dəftərlər Əminə xanım tərəfindən AMEA Əlyazmalar İnstitutuna verilmişdir.

Bu dəftərlərdəki şeirlərdən göründüyü kimi, Bağır əsasən bədihə demişdir. Onun duzlu, tənqidi xarakterli bədihələri həmişə "Məcməüş-şüəra»da böyük həvəslə qarşılanarmış. Yuxarıda göstərilən dəftərlərdə onun mürəbbe, təcnis, müxəmməsləri də vardır ki, bunlar Vaqif şeiri üslubunda yazılmışdır. Ədəbiyyat kitablarında az təsadüf edildiyinə görə aşağıda Bağırın bir bədihəsini nümunə veririk:

*Bakının əhli xiridar deyil,*
*Əlverişli bizə bazar deyil.*

*Heyf, səd heyf bizimçün bu əsas,*
*Gəl edək tərk, eliyək canı xilas,*
*Şüəra şeiri ilə söhbəti-xas*
*Məclis Bakıda dərkar deyil.*

*Nə qədər şərh eliyək meyxanə?*
*Bəsdi, gəldik dəxi, vallah, canə,*
*İmdi gəl əzm eliyək Şirvanə,*
*Vəqti-nasaz bizə yar deyil.*

*Bəzi şair itirib rəsmi-rəhi,*
*Bəzisi mədh eləyir padşəhi,*

---

* Əminə xanımın xatirəsində göstərildiyinə görə, İ. Səfərov Böyük Vətən müharibəsində həlak olmuşdur (N.Q).

*Hər kəsin vardı bir ümmidgəhi,*
*Bizə bir kimsə səbəbkar deyil*[432].

Məzmunundan göründüyü kimi, şeir Bakıda şairlər məclisi ilə əlaqədar deyilmişdir. Çayxana və toy məclislərində meyxanə deyilməsini xatırlayan Bağır belə şairlərin qayda-qanunu itirməsindən, padşahı mədh etmələrindən şikayətlənir, onların cəfəngiyyat və məddahlığına qarşı çıxır.

Bağırın bir şeirində XIX əsrdə Bakı toylarının təsviri verilmişdir[433]. Həmin şeirdə toyların kəsir cəhətləri, belə məclislərdə nizam-intizam gözlənilməməsi, varlıların xəsisliyi və sairə tənqid edilir. XIX əsrdə Bakıda toy adətlərinin öyrənilməsi nöqteyi-nəzərindən bu şeirin xüsusi əhəmiyyəti vardır.

## Mirzə Məhəmməd Müsəvvir

"Məcməüş-şüəra»nın sənətkar-şairlərdən biri də dövrünün müqtədir rəssamı Müsəvvir təxəllüsü ilə şeirlər yazan Mirzə Məhəmməddir. Əsli Cənubi Azərbaycanın Qəzvin şəhərindən olan Mirzə Məhəmməd 1876-cı ildə Bakıya köçərək, ömrünün sonuna kimi burada yaşamışdır. «Təzkireyi-Ziyai»də yazıldığına görə xoşsima, xoş xasiyyət bir şəxs olan Müsəvvir nəqqaşlıq edərmiş. Müsəvvir xüsusi məktəb qurtarmasa da, şəxsi istedadı sayəsində hər bir elmdən xəbərdar, şahmat elminin ustası və mahir rəssam kimi tanınmışdır[434].

S.Əzim Bakı şairlərini mədh edərkən Müsəvvirin rəssamlığını Maniyə və Çin sənətkarlarına bərabər tutaraq yazmışdır:

*Mirzə Müsəvvirin qələmi-müşkbarına,*
*Çindi desəm midadi-siyəh müşki-tər gəlir.*

---

[432] ƏYİ, B – 1675, vər. 118 a – 119 a.
[433] Yenə orada, II dəftər, vər. 30 a – 51 a.
[434] ƏYİ, D – 269, vər. 79 a.

*Hər nəqşi-kilki Maniyi-nəqqaşi məhv edib,*
*Ayineyi-xəyalinə rəngin süvər gəlir…*[435]

Mirzə Müsəvvir 1901-ci ildə Bakıda vəfat etmişdir. Təəssüf ki, Mirzə Bağır kimi, onun da bir neçə şeiri qaldığı halda, rəsm əsərlərindən bu gün əldə bir nümunə yoxdur.

**Məşədi Azər Buzovnalı**

Məşədi Azər Məcid oğlu İmaməliyev 1870-ci ildə Bakının Buzovna kəndində anadan olmuşdur. Köhnə üsul ilə təhsil görmüş Məşədi Azər Şərq ədəbiyyatını lazımınca öyrənmiş, klassik irsə dərindən bələd olmuşdur. O, bir müddət xırda alverlə məşğul olmuş, sonralar Maxaçqala, Buynaksk, Bakıda müəllimlik etmiş, 1925-ci ildən sonra təqaüdə çıxmışdır.

Azər Bakıda yaşadığı müddətdə müntəzəm olaraq "Məcməüş-şüəra»nın yığıncaqlarında iştirak etmişdir. XX əsrin görkəmli Azərbaycan qəzəl şairi Əliağa Vahidin klassik poeziyada formalaşmasında Azərin xüsusi rolu olmuşdur.

Yaradıcılığın ilk illərində növhə, qəsidə, həcviyyat və aşiqanə qəzəllər yazan Azər, yuxarıda qeyd edildiyi kimi, «İrşad», «İqbal, «Babayi-Əmir», «Tuti», «Dirilik» kimi məcmuə və qəzetlərdə müxtəlif mövzularda çıxış etmiş, həmçinin Firdovsinin «Şahnamə» əsərindən bir neçə dastanı Azərbaycan dilinə çevirmiş, bunlardan başqa, o, «Arpa və buğda», «Altun və polad» və sair alleqorik əsərlərin müəllifidir.

«Arpa və buğda» əsərində şair insan üçün hər nemətdən vacib olan, onun həyatının mayası hesab edilən çörəyi qızıla qarşı qoyur, arpa ilə buğdanı qızıldan üstün tutur[436]. «Altun və polad»da isə sənaye əhəmiyyətinə görə poladın qızıldan üstün olduğunu göstərmişdir.

---

[435] S.Ə.Şirvani. Əsərləri. II c. s. 70.
[436] ƏYİ, B – 1217, vər. 2 a.

1919-cu ildə Azərin «Həmvətənlərimə mənzum bir xatirə» adlı kitabı nəşr edilmişdir. Bu kitabçada onun «İttihadi-miləl» və «Yatmayın» adlı şeirləri çap olunmuşdur. Hər iki şeirdə şair millətə, həmvətənlərinə müraciət edərək, onları birliyə, cəhalət yuxusundan oyanmağa çağırır.

Azərin aşinaqə qəzəllərində gözəllər vəsf edilir, yeri gəldikcə zahidlərin hiyləgər əməlləri, vaizlərin bəd niyyətləri tənqid olunur. Azər klassik formada olduğu kimi, heca vəznində də yazmışdır. Onun «İstərəm» rədifli qoşması bu səpkidə yazdığı əsərlərindəndir:

*Bu dünyada yoxdur özgə muradım,*
*Hər qəmdən özümü azad istərəm,*
*Nə bir kəsə məxdum olum, nə xadim,*
*Xəlqi bu adətə mötad istərəm.*

*Əmirlərin işin duysun xəlayiq,*
*Etsinlər onlardan qəti-əlayiq,*
*Olmasın zəifə qəvilər fayiq,*
*Ədlilər aləmin abad istərəm.*

*Hər kəs ölkəsində yaşasın sərbəst,*
*Qəflət badəsindən olmasın sərməst,*
*Acizi əzməsin bir də zəbərdəst,*
*Etsinlər bir-birə imdad, istərəm*[437].

AMEA Əlyazmalar İnstitutunda saxlanılan bir əlyazmada Azərin min üç yüz səksən iki beytdən ibarət müxtəlif mövzuda və üslubda yazılmış şeirləri toplanmışdır. Bundan başqa, şairin Əlyazmalar İnstitutunda çox da zəngin olmayan arxivi mühafizə olunur ki, burada onun orijinal şeirləri və tərcümələri vardır.

---

[437] ƏYİ, B – 1552, vər. 1 a – 3 a.

## Seyid Zərgər

1880-cı ildə Bakıdan anadan olmuşdur. Şairin ulu babası vaxtilə Cənubi Azərbaycanın Səbzəvar şəhərlərindən köçərək Bakıya gəlmiş və burada yaşamışdır.

Əlyazmalar İnstitutunda Seyid Zərgərin qısa tərcümeyi-halı yazılmış bir dəftər mühafizə olunur[438]. Burada yazıldığına görə, Mir Əbdülvahab Hacı Mir Ağazadə Mir Həsənov (Seyid Zərgər) hələ altı yaşında ikən bir qadından əlifba öyrəndikdən sonra Molla Ağa Mehdi Səlyaninin mədrəsəsinə getmiş, bir qədər orada oxuduqdan sonra Molla Ağababa və Molla Salam Badikubənin mədrəsində Sədinin «Gülüstan», Mirzə Məhəmməd Mehdi xan Astarabadinin «Tarixi-Nadiri» və qeyri əsərləri oxumuşdur. Daha sonra Molla Əli Badikubəi və Mirzə Mahmud Ərdəbilidən dövrünün bir çox elmlərini təhsil etmişdir. Lakin atası onun təhsilini yarımçıq qoymuş və gənc Əbdülvahabı ticarətə gətirmişdir. Atasının təkidi ilə Əbdülvahab, Kərbəlayi İbrahim adlı bir nəfərlə şərikli baqqal dükanında alver edir. Bir qədər sonra şəriki ilə aralarında mübahisə düşür, oradan çıxıb bir papaqçıya şagird olur. Əbdülvahab atasına nə qədər yalvarmışsa, onu təhsilini davam etməyə buraxmamışdır. Sonra o, bir nəfərin zərgər dükanında şagird olmuş və bu sənəti öyrənmişdir. Beləliklə, özü bir dükan açaraq, zərgərliklə məşğul olmuşdur. Onun Seyid Zərgər təxəllüsü də bu sənətlə əlaqədardır.

Şair 1920-ci ildə vəfat etmişdir.

Zərgərin ziddiyyətli yaradıcılığı vardır. Əsərləri əsasən sinəzən və növhələrdən ibarətdir. Lakin aşiqanə qəzəlləri də vardır. Özü dindar olsa da, din xadimlərinin bəd əməllərini görməyə gözü olmamışdır. Hətta Xorasana ziyarətə gedərkən oranın məşhur alim və xadimləri ilə mübahisədən çəkin-

---

[438] ƏYİ, B – 1453.

məmişdir. Bu mübahisə zamanı Zərgər onlara demişdir ki, «Həzrət Rza əleyhissəlamın ziyarətgahının bu qədər mədaxili ola-ola, nə üçün ondan bir məktəb, ya bir qiraətxana, yainki bir xəstəxana açmırsınız? Həzrətin ildə milyondan ziyadə mədaxilini həzmi-rabedən keçirirsiniz[439]?..» Bu zaman onlar S.Zərgəri kafir adlandırır və ondan tövbə etməsini təkid edirlər. Yenə bir gün ziyarətgah xaDimlərindən birisi bir teşt gətirərək, Zərgərdən bu teşti ziyarət etməsini təklif etdikdə o, cavabında demişdir: «Mən buraya ziyarəti-Rzaya gəlmişəm, nə ziyarəti-teştə, qazana, kəfkirə»[440]. Bu zaman onu döymək istəmişlər. S.Zərgər isə bir təhər qaçıb, başını qurtara bilmişdir.

Zərgər Həştərxan, Aşqabad, Petrovski, Rostov, Armavir, Krasnovodsk, Gəncə, Car, Balakən və sair yerlərə səyahət etmiş, gəzdiyi şəhərlərin ürəfa və şairləri ilə həmsöhbət olmuşdur. O, Sədinin didaktik-tərbiyəvi hekayətlərindən bir çoxunu Azərbaycan dilinə təbdil edərək, «Mizanül-ədalət» adı ilə qəliz və anlaşıqsız dildə nəşr etdirmişdir[441]. S.Zərgər bir faciəvi əsər də yazmışdır. Yuxarıda adı çəkilən əlyazmasında onun bu əsəri səhnədə oynanılmaq üçün senzuradan keçmişsə də, səhnə üzü görmədiyi göstərilir. Burada qeyd edildiyinə görə, onun 244 səhifəlik divanı və daha iki cild nəsr əsəri olmuşdur ki, «bəzi səbəblərə görə çap edilməmişdir»[442]. Bunlardan əlavə, şairin qardaşı Mir Cavadda 382 səhifəlik ümumi dəftərdə onun şeirləri vardır. Burada qəzəllər və vaxtilə dövri mətbuatda dərc edilmiş bir sıra şeirləri, Mirzə Ələkbər Çakər Lənkərani ilə mənzum məktublaşmaları və sairə vardır. Çox təəssüf ki, qardaşı həmin dəftəri istifadə üçün verməmişdir.

Seyid Zərgər dövri mətbuatda çap etdirdiyi şeirlərinin bir qismində xalqı maarifə, təhsilə çağırır, millətin geridə qalma-

---

[439] ƏYİ, B – 1453, s. 15.
[440] Yenə orada.
[441] Bax: Sədi. Mizanül-ədalət. Bakı, "Səda" mətbəəsi. 1912.
[442] ƏYİ, B – 1453, s. 15.

sını Sabiranə tənqid edirdi. «İrşad» qəzetindən başlamış bir çox mətbuatda mütərəqqi ideyalarla çıxış etdiyi üçün camaat arasında ləkələnir və «Kimyagər», «Qızılçı», «Daruşgənə», «Mehtər Nəim» («Məzəli», «Babayi-Əmir»), «Əbülbəşər» («Arı») kimi gizli imzalarla çıxış etməyə məcbur olur.

Seyid Zərgər Mirzə Ələkbər Çakər Təbibqulubəyov Lənkərani ilə yaxın dost olmuşdur. Qatı dindarlar Çakəri dinsizlikdə təqsirləndirib cana doydurduqları zaman evini satıb Bakıdan köçmək istərkən Zərgər ona mane olub demişdi: «Avam camaat içindən bilikli adamın çıxıb getməsi, rəyimcə, ən xainlik, məsləksizlik, bəlkə, şəcəri-tərəqqiyi-ismalı abü nəmək ilə qurutmaq deməkdir»[443]. Çakər 1911-ci ildə vəfat etmişdir.

S.Zərgər burcua məfkurəsi ilə demokratik məfkurə arasında tərəddüd edən romantik ziyalılardan idi. O, bir tərəfdən «Babayi-Əmir» və «Arı»da demokratik ideyalı, xalqı maarif və mədəniyyətə çağıran şeirlərlə çıxış edir, digər tərəfdən «tərki-dünya», vəhdəti-vücud ideyasına bağlı qalır, həyata bədbin, ümidsiz nəzərlə baxırdı. Xorasanda xüddamları tənqid və maarifi, elm-sənət öyrənməyi təbliğ etsə də, bir çox məsələlərdə zamanla, yeni həyatla ayaqlaşa bilməyirdi. Şeirlərinin çoxunda «islam milləti», «islam dini» kimi ideyaların təbliğatçısına çevrilirdi.

## Məşədixanım Leyli

Seyid Zərgər üç dəfə evlənmişdir. Onun birinci yoldaşı çox cavan ikən vəfat etdiyi üçün şair ikinci dəfə evlənir. Lakin xasiyyətləri uyğun gəlmədiyi üçün tezliklə ikinci arvadından ayrılır. Üçüncü dəfə Məşədi Mirzağa adlı bir nəfərin qızı Məşədixanımı almışdır. Məşədi xanım 1892-ci ildə Bakıda anadan olmuşdur. Hələ evdə qız ikən köhnə üsulla savad öyrənmiş, şeir və ədəbiyyata xüsusi maraq göstərmişdir. Seyid

---

443 ƏYİ, B – 1453, s. 15.

Zərgər Məşədixanımla evləndikdən sonra onda savad və şairlik təbi olduğunu görüb, təlim və tərbiyəsi ilə xüsusi məşğul olmuşdur. Məşədixanıma «Leyli» təxəllüsünü də o vermişdir. Şairə heç zaman Xorasana getməmişdir. «Məşədixanım» onun valideynləri tərəfindən qoyulmuş adıdır.

Onun 1907-ci ildə bir qızı dünyaya gəlmiş, bundan sonra o xəstələnmiş və şairənin xəstəliyi beş il çəkmişdir. Nəhayət, Məşədixanım çox cavan ikən və yaradıcılığının ən gözəl çağlarında, 1912-ci il aprel ayının 30-da 20 yaşında vəfat etmişdir.

Məşədixanımla Seyid Zərgər bir-birlərini elə böyük məhəbbətlə sevmişlər ki, hətta bir günlük ayrılığa belə dözə bilməmişlər. Şairənin həyatı haqqında olan məlumatda deyilir: «Necə ki, Seyid Zərgəri üç gün yoldaşları bağa mehman edib apardıqda müfariqətə davam etmədiyinə görə müşarileyhə bu atidə yazılan qəzəli Seyid Zərgərə, bağa, yazıb göndərmişdir:

*Edim, yarəb, nə çarə, məndən ol cananım ayrıldı,*
*Bu hicrandidə canımdan o şirin canım ayrıldı.*

*Gedib seyr etməyə əğyarlərlə bağə, bostanə,*
*Günah etməm, desəm, məndən əgər yəzdanım ayrıldı.*

*Əgər küsmüb, əgər xişm etmiyib, incinmiyib, ey dil,*
*Gülündən bəs nə üçün bülbüli-xoşxanım ayrıldı?*

*Nə noi səbr edim hicranına Məcnunun, ey Leyli?!*
*Həyatım, ruhum ayrıldı, şəhim, soltanım ayrıldı*[444].

Məktub Seyid Zərgərə axşam üstü çatdığına görə fayton olmamış, o, təcili bir at tapıb, gecə ikən özünü şəhərə çatdırmışdır.

[444] ƏYİ, B – 1453, vər. 12 b – 13 a

Məşədixanımın hələlik əldə olan digər əsəri onun «Ölürəm» rədifli qəzəlidir. Şairənin bu qəzəlinin də nə münasibətlə yazılması yuxarıdakı sənəddə aydın göstərilmişdir. Artıq ölümünü düşünən Leyli xəstə yatdığı otağı xəlvət görüb, ərini yanına çağırmışdır. Aşağıdakı qəzəli ağlaya-ağlaya Seyid Zərgərə söyləmiş, o da göz yaşı axıda-axıda yazmışdır:

*Həlal qıl məni, ey şairi-fikar, ölürəm,*
*Edib daha məni gorgi-əcəl şikar, ölürəm.*

*Zəmanə qoymadı bir dəm deyim, gülüm, danışım.*
*Gözümü qoydu mənim səndə intizar, ölürəm.*

*Bahari-ömrümü dövrani-dun xəzan etdi,*
*Olundu işrətimin rəxti tarümar, ölürəm.*

*O ağlayan gözlərüvə gözlərim fəda olsun,*
*Dayanma, al kəfənim, hazır et məzar, ölürəm.*

*Məni bağışlagilən, çox xəcalətəm səndən,*
*Cəfamı çəkmisən, əfsus səd həzar, ölürəm.*

*Nişanə qalmadı məndən, qızım da öldü mənim,*
*Gözümə oldu əcəb tirə ruzigar, ölürəm.*

*Qızımla mən sənə, ey aşiqim, fəda olduq,*
*Bu bir qəzəl sənə məndəndü yadigar, ölürəm.*

*Həlal qılgilən, ey Qeys, xəstə Leylini,*
*Görüm ola sənə pərvərdigar yar, ölürəm*[445].

[445] Yenə orada, vər. 14 a.

Seyid Zərgər aşağıdakı beyti şairənin qəbir daşına həkk etdirmişdir:

*Almısan ağuşə bir gül üzlünü ey xak,*
*Kim bəslənirdi mahü salü ruzü şəb ağuşdə*[446].

Bundan başqa, o, Leylinin vəfatı münasibətilə ürək dağlayan bir müxəmməs və

*Qisseyi-mövtünlə, yara, dilfikarəm doğrusu,*
*Min qəmə, min dərdə, min cövrə düçarəm doğrusu*[447]

mətləli qəzəlini yazmışdır.

Hələlik əlimizdə olan bu iki qəzəlindən görünür ki, Məşədixanım Leyli çox gənc ikən Azərbaycan klassik ədəbiyyatına bələd olmuşdur. Şeirlərinin sənətkarlıq cəhətdən mükəmməl olması sübut edir ki, onun başqa qəzəlləri də olmuşdur. Yuxarıdakı iki qəzəl heç də şairənin qələminin ilk məhsulu ola bilməzdi. Ümid etmək olar ki, Məşədixanım Leylinin hələlik məlum olmayan şeirləri tapılıb aşkar ediləcəkdir.

“Məcməüş-şüəra»da Qızxanım adlı bir şairənin iştirak etdiyini söyləyirlər. Deyilənə görə, savadsız olmasına baxmayaraq, Qızxanım rəvan təbə malik bir şairə imiş, lakin hələlik onun haqqında məlumat və əsərlərindən bir nümunə əldə etmək mümkün olmadı.

## Mirzə Əbdülxalıq Yusif

“Məcməüş-şüəra»nın istedadlı üzvlərindən olan Əbdülxalıq Yaqub oğlu 1853-cü ildə Bakıda anadan olmuşdur. Hələ mollaxanada təhsil alarkən ədəbiyyatla maraqlanan Əbdülxalıq aşiqanə qəzəlləri ilə diqqəti cəlb edir. Atası onun şairlik

---

[446] Yenə orada.
[447] Yenə orada.

istedadını görüb, öz adı Yaqub[*] olduğu üçün oğluna Yusif təxəllüsü vermişdir. Əbdülxalıq dörd il mollaxana təhsilindən sonra bir ustadan zərgərlik sənətin öyrənmişsə də, onu işlətməyərək, ticarətlə məşğul olmuşdur. Bir müddət Aşqabadda dükan açaraq, orada alver etmişdir. Salman Mümtaz onunla hələ Aşqabadda tanış olmuş və kiçik bir «Divan»ı haqqında məlumat verərək, oradakı şeirlərin əksəriyyətinin dini məzmunda olduğunu qeyd edir[448]. Bakıda yaşadığı illərdə Yusif "Məcməüş-şüəra»nın fəal üzvlərindən biri kimi müntəzəm olaraq onun yığıncaqlarında iştirak etmişdir. Yusif dəfələrlə Seyid Əzim, Mirzə Səməndər, Cənnəti və başqaları ilə müşairədə olmuşdur. Məşədi Azər, Müniri, Şahin onun haqqında gözəl tariflər demişlər:

Azər:

*Ey verən varlığı rütbeyi-əşarə şərəf,*
*Bəhri-mənadə vücudi gövhəri-nəzmə sədəf.*

Müniri:

*Verir ecazi-şeirin mürdə cismə tazə can, Yusif,*
*Olub məzmuni-əbyatın Məsihayi-zəman, Yusif.*

Şahin isə:

*Ey olan məmləkəti-nəzmdə soltan, Yusif,*
*Vey qulami-hərəmi nəşrdə loğman Yusif*[449].

deyərək hər biri onun istedadını, bədahətən şeir demək qabiliyyətini vəsf etmişlər.

---

[*] Yaqub peyğəmbərin oğlu Yusifə işarə olaraq (N.Q).
[448] ƏYİ, Arx. 38, Q – 8 (189).
[449] ƏYİ, B – 1620, vər. 1 a.

Yusif bəzi ələbaxım, məclislərdə ancaq öz nəfsini güdərək ona-buna mədhlər deyən şairlərdən olmamışdır. Lakin yeri gəldikcə həcv deməkdən də özünü saxlamamışdır. Müasirlərindən Cənnəti, Müsəvvir, Cürmi və Rzanı həcv etmişdir. Hətta Cürmini həcv etdiyi üçün S.Ə.Şirvani yazırdı:

*Niyə həcv eyləmisən Cürmini, ey can Yusif,*
*Dilü canım sənə qurban ola, canan Yusif*[450].

Yusif ticarət məqsədilə bir çox şəhərlərdə olmuşdur. Bir dəfə Gəncədə ikən Sərdar bağında oranın ariflərindən biri Yusifə rast gəlib soruşur:

- Haralısan? Yusif: «Bakılıyam», - deyə cavab verir. Müsahibi: «Nə işin sahibisən?», - deyə soruşduqda Yusif şair olduğunu bildirmişdir. O isə eşitcək heyrət ilə demişdir: «Lailahə illəllah! Bakıdan şair? Çox qəribə işdir». Sonra Yusif bu münasibətlə:

*Şəhri-Gəncədə bir gün seyr edəndə mən, nagah,*
*Gəncə şəhri bağında tuş olub mənə bir mah...*[451]

beytilə başlanan şeirini yazmışdır.

Əbdülxalıq Yusif 1924-cü il noyabr ayının 2-də böyrək xəstəliyindən vəfat etmişdir.

Onun əsərlərindən ancaq 26 vərəqlik kiçik bir avtoqrafı qalmaqdadır. Buradakı şeirlər əsasən dini məzmundadır. Lakin şairin qısa tərcümeyi-halı verilmiş B-1620 şifrəli əlyazmasında o, «həlavətdə Xətai, səlasətdə Şahi, mətanətdə Əmani qədər qüvvətlidir» deyə səciyyələndirir[*].

---

[450] S.Ə.Şirvani. Əsərləri. II c. s. 135.
[451] ƏYİ, B – 1620, vər. 1 a.
[*] Bax: Sona Xəyal. Mirzə Əbdülxalıq Yusif (həyat və yaradıcılığı). Bakı, Örnək, 2000, 126 s; Mirzə Əbdülxalıq Yusif. Diriltdi aləmi eşqin nidası.../ haz. Sona Xəyal. Bakı, Nurlan, 2002, 128 s. **(red. – V.M)**

## Əbülhəsən Vaqif

Əbülhəsən Məhəmmədhəsən oğlu Vaqif 1845-ci ildə Salyanda anadan olmuşdur. Orada molla məktəbinə daxil olmuş, lakin ailə vəziyyətinin ağırlığı nəinki ona təhsilini davam etdirməyə imkan verməmiş, hətta adi molla məktəbini belə yarımçıq qoymağa məcbur etmişdir. Çox kiçik yaşlarından zəhmətə qatlaşan Əbülhəsən atasının yanında qayıq duzəltməklə əmək fəaliyyətinə başlamış, sonralar Bakı dövlətlilərinin təsərrüfatında muzdurluq etmişdir.

Ə.Vaqif yarımçıq təhsil almasına baxmayaraq, şəxsi mütaliəsi sayəsində Şərq klassiklərinin əsərlərini oxumuş, həmişə ariflər məclisinə can atmışdır. Bu maraq onda şeir və ədəbiyyata həvəs oyatmış və kiçik yaşlarından şeir yazmağa başlamışdır.

Gənc yaşlarından aşiqanə qəzəllərlə yanaşı, bir sıra şeirlərində din xadimlərini tənqid edən Əbülhəsən ruhanilərin təqib və töhmətinə məruz qalmışdır. Bir dəfə onu kafir adlandıran axund öz ulağına minib bazara gedərkən yolda şairə rast gəlinir. Əbülhəsən də bədahətən ona belə demişdir:

*Bir zahidi gördüm kim, heyvanə süvar olmuş,*
*Xəlq içrə durub guya Dəccal xər üstündə*[452].

Dini dinara satanları, şəriət pərdəsi arxasında avam camaatı tovlayanları:

*Dəri-meyxanədə gördükdə əlimdə şişə,*
*Dustlar, zahidi-bədkiş mənə oldu ədu.*
*Vaqifa, moizeyi-vaizə aldanma daha,*
*Neçə yüz məscidi viranə qoyub ol bayqu*[453].

---

[452] “Qızıl qələm” məcmuəsi. 1924, N 4.
[453] Yenə orada.

deyərək damğalanması Salyan kimi kiçik bir yerdə onun düşmənlərini daha da artırırdı. Ə.Vaqifi hər yerdə, hər məclisdə töhmətləndirirdilər. O isə ruhaniləri sancmaqdan əl çəkməyir, belə töhmətcillərə deyirdi:

*Məlamət etməyi adət edibsən aşiqə, ey zahid,*
*Yaman adətdi bu adət, utan zalım, bu adətdən*[454].

Nəhayət, yerli ruhanilərin töhmət və danlağı, üstəlik məişətinin ağır keçməsi onu Bakıya köçməyə məcbur edir. Əbülhəsən 1888-ci ildə Bakıya gəlir, bir gəmidə fəhləlik edərək ailəsini dolandırır. Bu zaman fəaliyyət göstərən "Məcməüşşüəra» şairləri ilə dostlaşır və tezliklə həmin məclisin fəal üzvlərindən birinə çevrilir.

Füzuli məktəbinin nümayəndələrindən olan aşiqanə qəzəllər müəllifi Vaqifin işlətdiyi ifadə və təşbehlərdə onun təsiri açıq görünsə də, özünəməxsus axıcı dilə, orijinal üsluba malik olmuşdur. Orta əsr qəzəl şairlərindən fərqli olaraq, XIX əsr şairlərinin əksəriyyətində olduğu kimi, Vaqifin də dilində ərəb-fars tərkiblərinə az təsadüf edilir.

*Bir qəba geymiş idi əyninə yar atəşrəng,*
*Məni yandırdı səməndər kimi ol şuxi-qəşəng.*

*Ayinə aldı ələ ruyi-müsəffası kimi,*
*Zülfünü tökdü üzə, tutdu iki ayinə cəng.*

*Qönçə tək ağzını heç açmadı, hər çi sordum,*
*Varü yoxdan demədi söz, elədi könlümü təng*[455].

Şairin rəvan və ahəngdar dilinə misal olaraq bir qəzəlindən iki beytə diqqət yetirək:

---

[454] Yenə orada.
[455] Yenə orada.

*Dilbəra, cövrü cəfadən sən usandırma məni,*
*Bu qədər atəşi-hicranına yandırma məni.*

*Demədimmi sənə, ey zülfü kimi üzi qara,*
*Vədeyi-vəsl verib, başda dolandırma məni*[456].

Vaqif 1914-cü ildə Bakıda vəfat etmişdir.
Vaqifin divanı olub-olmadığı bizə məlum deyildir. Onun haqqında ancaq Müznibin «Qızıl qələm» məcmuəsində verdiyi müxtəsər məlumatdan başqa, qeyri bir qeydə rast gəlmədik.

## Mikayıl Seydi

Mikayıl Mirzə oğlu Seydi 1862-ci ildə Bakıda anadan olmuşdur. Mirzə Həsib Qüdsinin məktəbində təhsilə başlamış, lakin anadan vaxsız yetim qaldığına görə məktəbi yarımçıq qoyub, kiçik yaşlarından ticarətlə məşğul olur. Hələ məktəbdə ikən ədəbiyyata maraq göstərən Mikayıl asudə vaxtlarında "Məcməüş-şüəra»nın yığıncaqlarına gedər, özündən yaşlı şairlərin söhbətlərinə qulaq asardı. Beləliklə, getdikcə onda şeirə həvəs artır, həm Bakı şairəlrinin, həm də klassiklərin əsərlərini mütaliə etməklə poeziyanın qanun-qaydalarına bələd olmuşdur. Şairlər məclisində müntəzəm iştirakı onun ümumi biliyinin artmasına da kömək etmişdir[*].

Seydi 1916-cı ildə Bakıda vəfat etmişdir. Şairin vəfatı münasibətilə «Babayi-Əmir», «Dirilik» və «İqbal», «Tərcüman» məcmuə və qəzetləri xüsusi məqalələr vermişlər ki, burada o, istedadlı şair kimi səciyyələndirilir.

---

[456] Yenə orada.
[*] Bax: Sona Xəyal. Əliabbas Müznib Bakı və bakılı şairlər haqqında. Bakı, 2003, s. 37-45. **(red. – V. M)**

Seydinin mükəmməl təhsili olmasa da, dövrünün mühüm məsələlərindən baş çıxara bilmişdir. Ömrünün son illərində tez-tez «Babayi-Əmir» və «Tərcüman»da çıxış edərək, duzlu şeirləri ilə oxucuların rəğbətini qazanmışdı. Şairin şeirləri və söhbətləri elə şirin və məzəli imiş ki, hər kəs onu dinləməkdən doymazmış. «Babayi-Əmir» curnalı onun vəfatı münasibətilə buraxdığı məqaləsində yazırdı: «Həmişə məhəlli qəzetlərdə və məcmuələrdə ciddi əşar və təxmislər yazıb gülməkdə idi. Hətta mətbuatda iştirak etmək fikrini zəif vəqtində doğulması üçün daimül-övqat təəssüf edərdi»[457].

Mikayıl Seydi yoxsul olmağına baxmayaraq, hər bir məclisdə özünü varlılarla bərabər tutardı. İmkanı olduqca o, heç nəyini əsirgəməz, fəqir-füqəraya əl tutardı. «Babayi-Əmir» curnalında onun haqqında yazılmış bir şeirdə şairin mətbu əsərləri belə səciyyələndirilmişdir:

*Gahi ciddi yazıb, gahi gülgü,*
*Birini şir edib, birin tülkü,*
*Gahi zülfi-nigarı vəsf etdi,*
*Qara xal, gülüzarı vəsf etdi,*
*Zahidin etdi xanəsin bərbad,*
*Vaizi qıldı daima naşad*
*Hacının açdı hiyləsin yeksər,*
*Bəylərə etdi xaməsin xəncər.*
*Oğrunu, qatili edib tənbih,*
*Eylədi içgiçiləri təfzih*[458].

O, «Dirilik» və «İqbal»da açıq, «Babayi-Əmir»də Şəbrəng əyar, Əqrəb kimi gizli imzalarla çıxış etmişdir. Seydi qadın azadlığının fəal tərəfdarlarından biri idi. Xüsusilə qızların təhsil almalarına var qüvvəsilə çalışar, tanışlarının qızlarını həmişə məktəbə təşviq edərdi. Hətta bir-iki kasıbın qızlarını

---

[457] "Babayi-Əmir", 1916, N 32, s. 6.
[458] Yenə orada.

məktəbə göndərməyə müvəffəq olmuş və onların təhsil xərcini də öz öhdəsinə almışdı. Şair bu işdə nümunə olaraq öz qızını məktəbə göndərmişdir.

Bakıya Şollar suyu çəkilməsini alqışlayan şair bu münasibətlə:

*Dərdimə dərman səni sandım, a Şollar suyu,*
*Noldu gəlib yetmədin, yandım, a Şollar suyu? -*

misraları ilə başlanan şeirini yazmışdır.

Onun şeirləri içərisində M.Ə.Sabirə yazdığı nəzirələri xüsusilə maraqlıdır. Bu cəhətdən şairin «Bu boyda, bu boyda» şeiri daha səciyyəvidir. Bu şeirdə xalqın tədricən oyandığı, artıq öz haqqını başa düşdüyü, mədəniyyətə doğru açılan cığırla səbr və inamla irəlilədiyi bir zamanda keçmiş hörməti, calalı, ixtiyarı bir-bir əlindən getdiyini başa düşən müzürr ünsürlər tənqid edilir:

*İlahi, könlümü tutdu vərəm bu boyda, bu boyda,*
*Hücum edibdi mənə dərdü qəm, bu boyda, bu boyda.*

*Hanı o gün ki, olardılar cəm başımıza,*
*Papağı, saqqalı, bığları həm bu boyda, bu boyda?*[459]

M.Seydi «…Əlişir Nəvainin qəzəllərini dəxi Azərbaycan şivəsinə çevirmişdir. Müharibə zamanı olduğundan təbi qeyri-mümkün olmuşdur. Əgər o kitab təb olunarsa, şeir maraqlılarına Füzulidən ziyadə fayda verəcəyi təbiidir»[460]. M.Seydi Nəvainin təkcə qəzəllərini yox, iri həcmli əsərlərini də ana dilinə tərcümə etmək fikrində olmuş, lakin əcəl onun bu arzusunu yarımçıq qoymuşdur.

---

[459] "Dirilik", 1916, N 11.
[460] Yenə orada.

Təəssüf olsun ki, Mikayıl Seydinin əsərlərindən yuxarıda göstərilən məcmuələrdəkindən başqa bir nümunə əldə edə bilmədik.

### Əbdülxalıq Cənnəti

“Məcməüş-şüəra»nın daha fəal və məhsuldar, həm də ədəbi irsi nisbətən toplu halda bizə çatan üzvlərindən biri Əbdülxalıq Cənnətidir.

Ə.Cənnəti ədəbi məclislərin Azərbaycan ədəbiyyatı antologiyasına daxil ola biləcək üzvlərindəndir.

Əbdülxalıq Qafarzadə Cənnəti 1855-ci ildə Bakıda daşyonan ailəsində anadan olmuşdur. Şairin babası vaxtilə Bakı xanının yanında şikarisərdar kimi rütbə tutmuş, atası isə daş karxanasında fəhləlik etmişdir. Əbdülxalıq cəmi iki-üç il mollaxana təhsili görmüşdür. Ehtiyac onun müstəqil təhsil almasına imkan verməmişdir. Təhsilini yarımçıq qoyan Əbdülxalıq müxtəlif sənət ustalarının yanında şagirdlik etmişdir.

Əvvəlcə bir dəllək dükanında şeir həvəskarı ilə tanış olan gənc Əbdülxalıq atasından xahiş edərək, tez-tez oraya gəlir, şairlərin söhbətlərinə qulaq asır, şeir-sənətə olan həvəsi onu şairlər məclisinə gətirir, beləliklə də, o, “Məcməüş-şüəra»nın fəal üzvlərindən birinə çevrilir.

Cənnətinin həyatı və yaradıcılığı haqqında ilk məlumatı prof. M.C.Paşayev vermişdir[461]. Bundan və prof. C.X.Hacıyevin məqaləsindən[462] başqa, şairin bədii yaradıcılığı haqqında heç bir yazılı mənbə yoxdur*.

---

[461] Mir Cəlal. Əbdülxalıq Cənnəti // Azərb. EA Nizami adına Ədəbiyyat İnstitutunun əsərləri, I c. Bakı, 1946.

[462] Cəfər Xəndan. Cənnəti. “Ədəbiyyat və incəsənət qəzeti, 1956, N 24.

* Bax: Əbdülxalıq Cənnəti. Vətən təranəsi. Toplayanı: Ə.Müznib. Bakı, Nurlan, 2006, 92 s.; Əsgərov A. Əbdülxaliq Cənnətinin lirikası. Namizədlik dissertasiyası. Bakı, 1991. **(red. – V.M.)**

Cənnəti yaradıcılığa 18 yaşlarından başlamışdır. Bütün asudə vaxtlarını mütaliəyə sərf edən şair şərqin Firdovsi, Nizami, Mövlana Cəlaləddin Rumi, Cami, Sədi, Xəyyam, Füzuli və başqa sənətkarlarının əsərləri vasitəsilə klassik poeziyanın qanun-qaydalarına dərindən bələd olmuşdur. O, fars dilini də mütaliə yolu ilə öyrənmiş, hətta bu dildə çoxlu qəzəllər yazmışdır.

O, qəzəllərini Cənnəti, Vasifi, Əttar, Daşkəsən oğlu təxəllüsü ilə, bəzən də dövrünün ictimai quruluşu, ayrı-ayrı yüksək mənsəb sahibləri və din xadimləri əleyhinə olan ciddi şeirlərini isə gizli imza ilə yazmışdır. Şair özü bu haqda belə yazır:

*Sərf-övqat eyləyib bir türfə divan yazmışam,*
*Cənnətikən Vasifi, Əttari ünvan yazmışam.*

*Daşkəsənoğlu dəxi imzalarımdandır mənim,*
*Gahi yanşaq da edib imzamı, pünhan yazmışam*[463].

Ə.Cənnəti 1931-ci ildə 76 yaşında Bakıda vəfat etmişdir.

AMEA Əlyazmalar İnstitutunda Cənnətinin avtoqrafları saxlanılır. B-1545 şifrəli ümumi dəftərdə şairin ictimai xarakter daşıyan şeirləri toplanmışdır. B-2700 şifrəli avtoqraf Azərbaycan və fars dillərində yazılmış aşiqanə qəzəllərindən ibarətdir. Şairin «Qız qalası», «Qılınc və qələm» poemaları, «Qurd və tülkü» təmsilli, «Bülbül», «Kəhər at» və başqa bu kimi iri həcmli əsərləri B-1199 şifrəli dəftərdədir. Yaradıcılığının ilk dövrlərində əsasən Vasifi təxəllüsü ilə yazdığı Azərbaycan və fars dillərində olan qəzəlləri isə M-152 şifrəli ümumi dəftərdə toplanmışdır.

Yaradıcılığının ilk çağlarında aşiqanə qəzəl, mərsiyələr yazan şair tədricən köhnə, sxolastik ədəbiyyatdan uzaqlaşır, zülm, istibad əleyhinə şeirlər yazır, maarif, elm və mədə-

---

[463] ƏYİ, B – 1545, vər. 106 a.

niyyət, azadlıq ideyalarını tərənnüm etməyə başlayır. Bir sözlə, onun yaradıcılığında ictimai motivlər getdikcə güclənir. Xüsusilə Bakıda genişlənməkdə olan inqilabi hərəkət şairə də öz təsirini göstərir və yaradıcılığında azadlıq mövzusu daha mühüm yer tutur.

Vaxtilə Bakıda xalq hərəkatını yatırmaq istəyən çar hökumətinin silah işlətməsinə qarşı çıxan şair yazırdı:

*Silah ilə çətindir mərdümün islahı, huşyar ol,*
*Qızıl qan birlə səhranı gülüstan eyləmək olmaz*[464].

O inanırdı ki, xalq uzun əsrlər boyu qəlbində bəslədiyi, yolunda canını fəda etdiyi əsl azadlığı bir gün əldə edəcək, zəmanə, təbiət öz hökmünü verəcəkdir:

*Mürur ilə təbiət hər məramın cabəca eylər,*
*Min ilin viranəsin bir gündə imran eyləmək olmaz*[465].

Şeirlərinin birində azadlıq uğrunda mübarizədə bütün millətləri birliyə dəvət edərək yazırdı:

*Cümlə nəsraniyü yəhudü məcu,*
*Rum vü özbəkü firəngiyü rus,*
*Əcəmü nemsü ingilisü ərəb*
*Türkü tacik olsalar mənus,*
*Dari-dünya olar behişti-bərin*[466].

Birinci dünya müharibəsinin dəhşətlərini görən Cənnəti yazırdı ki, «müharibə gəlini» gündə min işvə satıb, xalqı qırğına verir. Əfsus ki, hələ insan öz qədrini bilmir. Bəşərin qüvvəsini hələ nə Əflatun bilib, nə də Calinus. Lakin əlində günəş

---

[464] ƏYİ, B – 1545, vər. 80 b.
[465] Yenə orada, 81 a.
[466] Yenə orada, 52 a.

kimi «fanus» olan qeyrət sahibləri təbiətin bu Qanunu ilə mübarizədə qalib gəlmək üçün dövran, fürsət axtarırlar. Çünki:

*Olmasa gər cahanda əmnü aman,*
*Fikrdən mərdümi basar kabus*[467].

Müharibə əleyhinə çıxan şair şeirlərində dövlət başçılarını sülh, əmin-amanlıq yaratmağa səsləyirdi. Dünyada daim baş verən müharibələr, insanları bezar edən qanlı qırğınlar şairi həmişə düşündürən məsələlərdən idi:

*Qovğadır dünyada, daim savaşdır,*
*Xalqın məgər bağrı, dəmirdir, daşdır*[468]*?!*

O, müharibə əleyhinə yazdığı «Bax» rədifli şeirində cavanların günahsız tökülən qanlarına etiraz edir. Ərləri döyüş meydanlarında həlak olan dul qadınların ah-naləsinə biganə qala bilməyən şair müharibə törədənləri mürüvvətsiz, qaniçən, həyasız adlandırır və inanır ki, bir gün bu canilərin özləri qan dəryasında boğulacaqlar:

*Bimürüvvət, bihəya, biabrü, vay halına!*
*Ərzsiz arvadlar qılan əfğanü vaveylaya bax*[469]*!*

Cənnəti hələ o zaman tərksilah məsələsinə də böyük əhəmiyyət verirdi. O, bu münasibətlə bir şeirində yazmışdır:

*Hökumətlər etməzsə tərki-silah,*
*Bularmı cahan əhli fövzü fəlah?*
*Silah ilə islah olunmaz bəşər,*
*Qılıncdan nə hasil olur, qeyri-şər*[470]*?*

---

[467] ƏYİ, B – 1545, vər. 52 a.
[468] Yenə orada, vər. 51 b.
[469] Yenə orada, s. 132 a.
[470] ƏYİ, B – 2700, vər. 73 a.

Şair başqa bir şeirində bu məsələdən bəhs edərək göstərir ki, əgər dünyada sülh olarsa, insanlar arasında sədaqət, inam da artar. O, bütün millətləri birləşərək müharibə əleyhinə mübarizə etməyə çağırırdı. Cənnətin fikrincə, bu cür müharibənin qarşısını alar və:

*Nə əsgər gərəkməz, nə alati-cəng,*
*Nə də ərsə olmaz bu məxluqə təng*[471].

Şair təəssüflə qeyd edirdi ki, dünyada nahaq qan tökənləri «fatehi-kişvər», «hünərmənd», «dilavər», sülh axtaranları isə «bihünər» adlandırırlar.

Şair zülm, əsarət dünyasının əleyhinə çıxsa da, ictimai-siyasi dünyagörüşü cəhətdən dövrün tələblərindən geri qalırdı. O, mübarizənin ön sırasında gedən fəhlə sinfinin qüdrət və qüvvəsini görə bilmirdi. Odur ki, fəhlə sinfinin mübarizəsi onun şeirlərində öz əksini tapa bilməmişdir.

Cənnətinin yaradıcılığında mühüm yer tutan motivlərdən biri də vətənpərvərlikdir. O, şeirlərində vətəni satanları şərəfsiz, irzü namusunu satan adlandırırdı. Şair yazırdı ki, əhli-qeyrət əcdadının torpağını satmaz. Bir gün gələcək ki, ana torpağı həqir sayanları qəzəb tutacaqdır:

*Ümmü əbin həqir sanan bədgühərləri,*
*Bişəkkü şübhə bir gün olar kim, tutar qəzəb.*
*Kim yer satırsa, irzini, namusunu satır,*
*İstər tatarü türk ola, ya fars, ya ərəb*[472].

Vətən torpağının hər qarışını vətəndaşın namus və şərəfi hesab edən Cənnəti «yersatan irzini, namusunu satır» dedikdə ölkədə xarici kapitalistlərin hökmranlığına imkan yaradan,

---

[471] ƏYİ, B – 1199, vər. 73 a.
[472] ƏYİ, B – 2700, vər. 69 a.

təbii sərvətləri onların ixtiyarına verən yerli hakimiyyəti nəzərdə tuturdu.

Cənnəti dindən uzaqlaşmasa da, demokratik mətbuatın, xüsusən «Molla Nəsrəddin» curnalının təsiri altında din xadimlərini ifşa edən bir çox şeirlər yazmışdır.

Zəhmətlə qazanılan duz-çörəyi hər nemətdən üstün tutan şair göstərirdi ki, zəhmət çəkməyib naz-nemət içində yaşayanlar bunun ləzzətini bilməzlər.

Daşyonan oğlu təxəllüsü ilə yazdığı qəzəllərindən birində halal zəhmətə yüksək qiymət verən şair yazırdı:

*Zəhmətin ləzzətini Daşyonan oğlundan sor,*
*Nemət əhli nə bilir ləzzətini duz-çörəyin*[473]*!*

Şeirlərindən birində şair özü kimi minlərlə sadə adamların həyatını, zillət və məşəqqətli güzəranını belə təsvir edirdi:

*Göstərir əşkim dəmadəm kim, hübab üstən hübab,*
*Bildirir ki, qəhtdən çox xaniman olmuş xərab.*

*Mərdümün səbri qurtarmışdır sirişki-çeşm tək,*
*Arzuyi-movt edər sidqilə hər bir şeyxu şab.*

*Möhtəkirlər buğdanı anbarə urmuş, leyk xəlq,*
*Buğda asa sinəçək olmuş, çörək tək dilkəbab*[474]*.*

Şair

*Cavanlar, ya çocuqlar bir də mövhumata aldanmaz,*
*Xurafata, sönük bir fikrə iman eyləmək olmaz,* -

deyəndə ruhanilər;

---

[473] ƏYİ, B – 1545, vər. 103 a.
[474] Yenə orada, vər. 128 a.

*Torpaq satanın çeşminə olsun qara torpaq*

deyəndə yerli acgöz sahib-mənsəblər;

*Möhtəkirlər buğdanı anbara urmuş, leyk xəlq,*
*Buğda asa sinəçak, çörək tək dilkəbab*

deyəndə isə təbii fəlakət nəticəsində yaranan qıtlığı bir qədər də çətinləşdirən möhtəkirlər onu rahat buraxmazdılar.

Dövrünün mühüm ictimai məsələləri ilə maraqlanan şair qadın azadlığı, qadın hüququ məsələlərinə də biganə qalmır, onları azad, cəmiyyətin bərabər hüquqlu bir üzvü hesab edirdi:

*Nuri-çeşmim, cismə candır, canə canandır qadın,*
*Afitabi-ruzdir, şəmi-şəbistandır qadın.*

*Bibəsirətlər ünasə kəc baxırlar kur tək,*
*Mərdümi-bina gözündə eyni insandır qadın*[475].

O, «Sual-cavab» adlı şeirində «Qadın nədir, iş nədir, bağça gərək, bağ gərək» deyən əhli-kefləri tənqid edərək, qadınları ictimai işlərdə, əmək cəbhəsində görmək istəyirdi. Cənnəti bayatı və zərbül-məsəllər də yazmışdır. O burada da qadının hüququ, təhsili məsələsinə toxunmuşdur:

*Dağlarda çiçək olur,*
*Ağ üzdə birçək olur,*
*Gözəl qız oxuyarsa,*
*Daha da göyçək olur*[476].

---

[475] ƏYİ, B – 1545, vər. 99 b.
[476] Yenə orada, vər. 62 a.

Sovet hakimiyyəti dövründə elm və texnikanın inkişafından, onun təsərrüfat və məişətdəki rolundan bəhs edən «Dəmir və tərəqqi» adlı şeirində şair elmin gələcəkdə xarüqələr yaradacağını qabaqcadan görə bilirdi.

*Düşdüm bu fikrə mərdüm edə seyri-asiman,*
*Mərrixə atmaq istəyir elm əhli risman.*

*Nail olar bu məqsədinə xəlq bigüman,*
*Çoxdur ümidimiz ki, müsaid olar zaman.*

*Əshabi-elm himmət edib göstərər səbat,*
*İnsan nə olduğun düşünər onda kainat*[477].

Göründüyü kimi, şair insanların kosmosu fəth etmək, planetlərə uçmaq fikrinə hələ 1930-cu ildən əvvəl bir həqiqət kimi baxır və buna inanırdı.

Cənnətin avtoqraflarından məlum olur ki, o, qələmini klassik şeirin bütün formalarında işlətmişdir. Əsasən əruz vəznində yazan şairin heca vəznində də şeirləri vardır. Bu cəhətdən onun bayatıları olduqca maraqlıdır.

Məlumdur ki, bayatılarda eşqdən, məhəbbətdən, bu yolda olan hicran və müsibətlərdən daha çox bəhs edilir. Cənnətin bayatıları ilə tamamilə yeni xarakterdədir. O öz bayatılarına da ictimai məzmun vermişdir. Şairin bayatılarında elm, maarif, məktəb, qadın təhsili və s. məsələlərdən bəhs edilir:

*Gülüstanda gül olur,*
*Gül olur, bülbül olur,*
*Məktəbə gedən çocuq,*
*Oxur, şirindil olur.*

*Qanacaq bir nemətdir,*

---

[477] ƏYİ, B – 1545, vər. 36 b.

*Qanmazlıq müsibətdir,*
*Nadan bağrın çatlasın,*
*Dünya bizə cənnətdir*[478].

Cənnətinin başqa şeirlərində fars-ərəb tərkib və ifadələri olduğu halda, bayatıları sadə xalq dilində yazılmışdır.

Şair zəngin həyat təcrübəsi, çoxlu mütaliəsi nəticəsində xalq yaradıcılığının təsiri ilə bir sıra faydalı və ibrətamiz zərbülməsəllər də yazmışdır («Nəsəbə arxalanan qabağa getməz», «Düz dolan, düzəltməsinlər, əyri gəzmə, güdməsinlər», «İnsanın qursağı gen gərək, nə bağırsağı», «İt çörəyi itirməz, insan əməyi», «İtin toxu qurd vurar, adamın acı», «Qurddan çoban olmaz, oğrudan pisaban», «Qadın hər şeyə qadirdir, iczinə bais çadirdir», «Ağzının əyriliyinə baxma, sözünün düzlüyünə bax», «Düyündə ağlayan nə gündə gülər?», «Oğruya oğul olmaqdansa, doğruya qul olmalı», «Əsir olub xəz geyməkdənsə, azad olub bez geyməli», «Qara qaşın vəsməyə ehtiyacı yoxdur, qara gözün sürməyə» və s.).

Cənnətinin bir şeirindən görünür ki, o, S.Ə.Şirvani, A.Səhhət, M.Ə.Sabir kimi şairlərlə yaxından dostluq etmiş, dəfələrlə onlarla bir məclisdə oluş, şeirlərinə qulaq asmışdır:

*Bir zaman Sabir ü Səhhət mənimlə yar idi,*
*Hər biri şirinsüxən, hər fərdi xoşgöftar idi.*

*Zövq alırdım sözlərindən ta ki, onlar var idi,*
*Tutiasa xamənin münqari şəkkərbar idi.*

*Zikr edərdi başqa tərz ilə olar mənzurimi,*
*Onların şirin kəlamı artırırdı şurimi*[479].

Daha sonra:

---

[478] ƏYİ, B – 1545, vər. 62 a.
[479] ƏYİ, B – 1545, vər. 43 b.

*Şairi-şəhri-Şamaxı, Qasir-i kamiləyar,*
*Seyyidi-alinəsəb Seyid Əzim-i namdar…*[480]

Ədəbi məclislərin başqa üzvlərində olduğu kimi, Cənnətinin yaradıcılığında da Füzulinin təsiri aydın görünməkdədir. İfadə tərzi, mübaliğə, cinas və başqa sənətkarlıq xüsusiyyətləri göstərir ki, Cənnəti Füzulini çox sevmiş və onu mükəmməl öyrənmişdir. Cənnətinin Füzuli, Hafiz, Nabi və başqa şairlərin qəzəllərinə bir çox nəzirə və təxmisləri vardır.

Qəzəllərindən göründüyü kimi, şair şeirin bu növünə bütün incəliklərinə qədər mükəmməl bələd olmuşdur. Onun qəzəllərinin demək olar hamısında orijinal, yeni, maraqlı fikir və ifadələr tapmaq mümkündür. Cənnəti klassik şeirimizin, xüsusilə Füzuli ədəbi məktəbinin son nümayəndələrindəndir. O da müasirləri kimi, ədəbi fəaliyyətə mərsiyə, növhəcat, dini məzmunlu şeirlərlə başlamışdır. Lakin həyatı dərindən dərk etməsi və dövrünün ictimai xarakteri onu bu yoldan uzaqlaşdırmış, beləliklə də, maarifçi bir şair dərəcəsinə qalxma bilmişdir. O, imkanı dairəsində bütün fəaliyyətini xalqına sərf etmək istəyirdi. Şeirlərinin birində şair belə yazırdı:

*Noleydi cüzi maaşım oleydi, ta nəfəsim var,*
*Həmişə pişəvü şüğlüm ümumə xidmət oleydi*[481].

Ə. Cənnəti «Təkamül», «İqbal», «Həyat», «Füyuzat», «Tuti», «Babayi-əmir», «İrşad» kimi qəzet və curnallarda xalqı maarifə səsləyən, sovet dövründə isə «Maarif və mədəniyyət» məcmuəsində yeni quruluşu tərənnüm edən şeirlər ilə iştirak etmişdir.

XIX əsrin sonu, XX əsrin 30-cu illərinə kimi fəaliyyət göstərən və öz yaradıcılığını "Məcməüş-şüəra»da təkmilləşdi-

---

480 Yenə orada, vər. 48 a.
481 ƏYİ, M – 152, vər. 171 a.

rən Əbdülxalıq Cənnəti haqqında ayrıca tədqiqat işi aparılmalı sənətkarlardandır.

## SON SÖZ

Tədqiqat göstərir ki, öz ətrafında daha çox ədəbi qüvvə toplayan «Divani-Hikmət» (Gəncə-Tiflis), «Gülüstan» (Quba), “Əncümənüş-şüəra» (Ordubad-Naxçıvan), «Fövcül-füsəha» (Lənkəran), «Beytüs-Səfa (Şamaxı), Məcməüş-şüəra» (Bakı), “Məclisi-üns» və «Məclisi fəramuşan» (Şuşa) ədəbi məclisləri ilə yanaşı, XIX əsrdə Ərdəbil, Urmiya, Şəki, Dərbənd, Ağdaş və Qazaxda da kiçik ədəbi dərnəklər fəaliyyət göstərmişlər. İstər şairlərin poetik adlar altında tanınmış ədəbi məclisləri, istərsə də kiçik ədəbi dərnəklər XIX əsrin ictimai-siyasi və mədəni inkişafı ilə bağlı olmuş, başqa sözlə desək, dövrün tələbləri ilə yaranmış, eyni zamanda, Azərbaycan ədəbi fikrinin inkişafına müəyyən dərəcədə faydalı təsir göstərmişdir.

Bu məclislərin heç birinin məramnamə və proqramı olmamışdır. Onların əsas məqsədi Şərqin dahi söz ustalarının sənətkarlığını öyrənmək, klassik poeziyanın yaxşı ənənələrini davam etdirmək, müşairə yolu ilə ədəbi yarışlarda bədahətən şeir deməklə öz sənətkarlıqlarını təkmilləşdirmək və bir çoxu dövrün qabaqcıl ziyalısı kimi xalq arasında maarifi təbliğ etmək olmuşdur.

Azərbaycan ədəbi məclis şairlərinin əksəriyyəti millətdən, millətin savadlanmasından danışırdılar. Ölkədə ədalətli qayda-qanunun, nizam-intizamın yaradılmasının çarəsini xalqın maariflənməsində görürdülər. Onlar Azərbaycan maarifçiləri idilər. Məclis şairləri klassik ədəbi irsin ənənələrini davam etdirməklə yanaşı, özləri sənətkarlıq cəhətdən maraqlı, yeni şeir formaları da yaratmışlar.

Məlum olduğu kimi, XIX əsrdə məclis şairləri arasında nəzirəçilik xeyli güclənmişdi. Lakin Şuşa şairlərinin eyni qa-

fiyə və eyni rədifli bəzi qəzəllərini ucdantutma nəzirə adlandırmaq doğru deyildir. Həmin qəzəllərin yazılma səbəbləri ilə tanış olduqda məsələ daha da aydınlaşır. Məclislərdə qəzəl ədəbiyyatı intişar tapırdısa da, həmin şairlər klassik poeziyanın müsbət cəhətlərini davam etdirir, sevgi, məhəbbət tərənnümü ilə yanaşı, qəzəlçiliyə yeni ictimai motivlər gətirirdilər. Bu qəzəllərin içərisində milli poetikanın çox dəyərli, orijinal nümunələri vardır.

Məclislər dövründə və məclis şairləri arasında nəzirəçiliklə yanaşı, həcv də geniş yayılmışdı. Lakin onların məzmunundakı tənqid və satira ünsürləri həcvlərin özləri kimi subyektiv münasibətdən doğurdu. S.Əzimin bir neçə həcvi nəzərə alınmazsa, şairlər daha çox bir-birini həcv edirdilər. Bu həcvlərin əksəriyyətində etika gözlənilmirdi.

Klassik üslubda yazan məclis şairlərinin bir qismi sırf təqlidçilik yolu ilə getmiş, özlərindən sonra nəinki parlaq iz buraxmamış, hətta məşğələlərin canlı keçməsinə azacıq da olsa təsir göstərə bilməmişdir. Bununla belə, XIX əsrin 60-cı illərindən sonra məclis şairlərinin bir qismi təqlidçilikdən uzaqlaşmağa çalışmışlar. Bu şairlərin şeirlərində maarifçilik ideyaları, tənqidi realizm, ictimai motivlər müəyyən qədər öz əksini tapmışdır. S.Əzim, M.İ.Qasir, M.M.Nəvvab, H.Qaradaği, M.Məmai, H.Yüzbaşov, M.İ.Xəyali, M.A.Bixud, Ə.Cənnəti və başqaları bu cəhətdən xüsusilə fərqlənmişlər.

Ədəbi məclislərdə şairlərlə yanaşı, musiqiçilər də iştirak etmişlər ki, bu da Azərbaycan poeziyasının musiqi ilə, xüsusən qəzəlin muğamatla ayrılmaz surətdə bağlılığından irəli gəlirdi. Təsadüfi deyildir ki, Şuşa, Şamaxı və Bakıda şairlərin məclisi ilə yanaşı, xanəndə və sazəndələrin də xüsusi məclisləri olmuşdur. Bu şəhərlərdə çox vaxt şairlərlə musiqiçilərin məşğələləri birlikdə keçirilirdi. Xanəndələrin repertuarında Füzuli qəzəlləri ilə yanaşı, məclis şairlərnin ən yaxşı şeirləri də mühüm yer tuturdu.

Təzkirələrdəki qeydlərdən və ayrı-ayrı şairlərin şeirlərindən aydın olur ki, XIX əsr Azərbaycan ziyalıları arasında şahmat oyunu geniş yayılmış, xüsusən məclis şairləri onu poeziya qədər sevmişlər. S.Əzim, M.İ.Xəyali, M.T.Sidqi, H.Fəqir və başqaları xüsusilə seçilirdilər.

Orta əsrlərdə və XIX əsrin əvvəllərində təsadüfi hallarda zahid və vaizlərin tənqidinə rast gəlinirdisə, XIX əsrin sonlarında belə motivlər ədəbiyyatda güclənməkdə idi.

Məclis şairlərinin əksəriyyətinin yaradıcılıq mövzuları təxminən eyni olsa da, təbiidir ki, onlar sənətkarlıq cəhətdən fərqlənmişlər. Xüsusilə Gəncədə M.M.Naci, Qubada A.Bakıxanov, Ordubadda H.Fəqir, M.T.Sidqi, Lənkəranda M.İ.Qasir, Şamaxıda S.Əzim, M.A.Bixud, Bakıda M.Cürmi, Ə.Yusif, Ə.Cənnəti, Şuşada X.Natəvan, M.M.Nəvvab, A.Asi, Şəkidə, İ.Nakam həm sənətkarlıq, həm də ümumi bilik və istedadları ilə daha çox seçilirdilər. Heç də təsadüfi deyildir ki, məhz buna görə də həmin şəhərlərdə yazıb-yaradan şairlər onların ətrafında birləşərək, özlərinin ədəbi məclislərini təşkil etmişdirlər.

Ərəb-fars dillərində aldıqları mədrəsə təhsili ilə əlaqədar olaraq iki dildə – Azərbaycan və fars dillərində yazan məclis şairlərinin şeirlərində milli ruh və ana dilinə meyil getdikcə güclənirdi. Xüsusən əsrin ikinci yarısında üstünlük tamamilə ana dili tərəfində idi.

XIX əsrin ədəbi məclisləri – onların məşğələləri, müşairələrin gedişi və məzmunu, bir çox iştirakçıları ilk dəfə tədqiq edilir.

Tədqiqat göstərir ki, bu məclislərdə ümumiyyətlə yüz əllidən artıq şair, alim, xanəndə və musiqiçi iştirak etmişdir. Əlbəttə, bunların hamısından bir əsərdə bəhs etmək imkan xaricindədir. Əsərdə onların daha çox seçilən, məclislərin gedişinə ən çox təsir göstərən qırxa yaxın iştirakçısı haqqında məlumat verilir, əsərləri təhlil olunur ki, bunların bir çoxunun ədəbi şəxsiyyəti ilk dəfə aşkar edilir.

XIX əsrdə təşkil edilmiş ədəbi məclislər bir qrup Azərbaycan milli ziyalılarının yetişməsində yaradıcılıq məktəbi rolunu oynamışdır. «Azərbaycan tarixi» kitabında göstərildiyi kimi, ilk dəfə məktəb və mədrəsələrin nəzdində təşkil edilmiş XIX əsr ədəbi məclislərinin vaxtilə gənclərdə ana dilinə məhəbbət, Azərbaycan poeziyasına həvəs oyatmaqda və bir sıra gənc Azərbaycan şairlərinin yetişməsində əhəmiyyətli rolu olmuşdur.

Xalqımızın mənəvi sərvətinin bir hissəsi olan ədəbi məclis şairləri şeirlərinin bütövlükdə nəşri bu dövrün ictimai-ədəbi fikrinin inkişafını aydın təsəvvür etməyə, onu daha düzgün qiymətləndirməyə kömək edərdi.

# ƏDƏBİYYAT*

**Azərbaycan dilində**


1. Araslı H. XVII-XVIII əsrlər Azərbaycan ədəbiyyatı tarixi. Bakı, 1956.
2. *Azərbaycan Klassik Ədəbiyyatı Kitabxanası. 20 cilddə. VII cild. Tərtib edənlər: R.Qənbər qızı, M.İsmayılzadə. Bakı, "Elm" nəşriyyatı, 1988, 568 s.*
3. Azərbaycan ədəbiyyatı tarixi, I c., Bakı, 1960.
4. *Azərbaycan Milli Elmlər Akademiyası Məhəmməd Füzuli adına Əlyazmalar İnstitutunun nəşrlərinin biblioqrafiyası. Bakı, Nurlan, 2007, 34 s.*
5. *Azərbaycan qəzəlləri. Tərtib edən: Məmməd Nuruoğlu. Bakı, Yazıçı, 1991, 624 s.*
6. *Azərbaycanda məşhur olan şüəranın əşarına məcmuədir. I cild. Tərtib edəni Hüseyn əfəndi Qayıbov. Çapa hazırlayanı Cahangir Qəhrəmanov. Bakı,"Elm" nəşriyyatı, 1986, 360 s.*
7. *Bakıxanov Abbasqulu ağa. Bədii əsərlər. Tərtib edəni Məmmədağa Sultanov. Bakı, Azərbaycan Dövlət Nəşriyyatı, 1986, 360 s.*
8. *Baki Məşədi Əyyub. Riyazül-məhəbbət. Tərtibçi: Raqub Kərimov. Bakı, "Şuşa" nəşriyyatı, 2000, 192 s.*
9. *Bayram Ö. Azerbaycan sahası tezkireleri ve Seyid Azim Şirvaninin tezkiresi. Doktora tezi. Ankara, 2005, XCIX+519 s.*
10. *Bayram P. Qarabağlı Seyid Mir Həmzə Nigarinin həyatı, yaradıcılığı və türkcə divanının strukturu. Filol. elml.namiz...dissertasiyanın avtoreferatı. Bakı: 2008, 14 s.*
11. *Bülbül Məşədi Məhəmməd. Əsərləri / Tərtib edənlər R.Kərimov, F.Həsənova. Bakı, Şuşa, 2008, 360 s.*


* Ədəbiyyat siyahısında kursivlə yazılmış kitablar redaktor tərəfindən əlavə olunmuşdur. Əlyazmalar isə mətndə səhifə altında verildiyi üçün ədəbiyyat siyahısında yer almamışdır **(red. – V.M)**.

12. Cəfər Xəndan. Cənnəti. "Ədəbiyyat və incəsənət qəzeti, 1956, N 24.

13. *Cənnəti Əbdülxalıq. Vətən təranəsi. Toplayanı: Ə.Müznib. Bakı, Nurlan, 2006, 92 s.*

14. "Cənub ulduzları". Şeirlər və poemalar. Tərtib edənlər Əbülfəzl Hüseyni, Yolçu Piriyev. Bakı, "Yazıçı" nəşriyyatı, 1924, 272 s.

15. *Cənubi Azərbaycan ədəbiyyatı antologiyası. 3 cilddə, I cild. Tərtib edənlər: Mirəli Mənafı, Zahid Əkbərov, Rəfiqə Qasımova. Bakı, "Elm" nəşriyyatı, 1981, 384 s.*

16. Dadaşov M., Talışlı M. "Fövcül-füsəha" ədəbi məclisi haqqında // "Leninçi" qəzeti (Lənkəran), 1959, 9 sentyabr.

17. *"Dahilərin göz yaşı. Mərsiyələr". Tərtib edənlər: M.Əliyev, A. Ramazanov. Bakı, "Elm" nəşriyyatı, 1990, 112 s.*

18. *"Deyilən söz yadigardır". Toplayanı və tərtib edəni: Cəfər Rəmzi İsmayılzadə. Bakı, "Yazıçı" nəşriyyatı, 1981, 332 s.*

19. *"Deyilən söz yadigardır". Toplayam və tərtib edəni: Cəfər Rəmzi İsmayılzadə. Bakı, "Yazıçı" nəşriyyatı, 1987, 352 s.*

20. *Didə Mirzə Nəsrullah bəy. Bahariyyə. Çapa hazırlayan: Rəşid Qurbanbəyov. Bakı, "Azərbaycan Universiteti" nəşriyyatı, 2004, 86 s.*

21. *Didə Mirzə Nəsrulla. Kitabün-nəsayeh. Nəşrə hazır: M.Nağısoylu, T.Sadıxova. Bakı, Nurlan, 2008, 212 s.*

22. *Əsgərov A. Əbdülxaliq Cənnətinin lirikası. Namizədlik dissertasiyası. Bakı, 1991.*

23. Əsgərov M. "Beytüs-Səfa"nın yaranması və onun Azərbaycan ədəbiyyatında mövqei // "Azərbaycan məktəbi" curnalı, 1944, N 2-3, s. 27.

24. *Hacıyeva A. Mir Möhsün Nəvvabın ədəbi-bədii irsi. Bakı, Nurlan, 2004, 211 .;*

25. Heyran xanım. Seçilmiş əsərləri. Bakı, Azərbaycan Dövlət nəşriyatı. 1961, 224 s.

26. Hüseynzadə Ə. XIX əsrin ikinci yarısında Azərbaycan tarixşünaslığı. Bakı, 1968.

27. *XIX əsr Azərbaycan şeri antologiyası, Bakı, "Şərq-Qərb", 2005, 424 s.*

28. *Xəzani Mir Mehdi. Əsərləri. Tərtib edənlər; Nəcəf Quliyev, Raqub Kərimov. Bakı, Azərnəşr, 1989, 128 s.*

29. İsmayılov R. Müxtəsər Qafqaz tarixi. Tiflis, 1904.

30. *Katib Mirzə Məhəmməd. Şeirlər. Bakı, Şuşa, 2004, 56 s.*

31. Kəminə Fatma xanım. Şeirlər. Toplayanı: Əzizə Cəfərzadə. Bakı, "Gənclik" nəşriyyatı, 1971, 97 s.

32. *Kərimov R. Abdulla bəy Asinin həyat və yaradıcılığı. Bakı, Nurlan, 2009, 210 +83 s.*

33. *Köçərli Firidun bəy. Azərbaycan ədəbiyyatı. 2 cilddə. 1 cild. Transliterasiya edəni: Ruqiyyə Qənbər qızı. Bakı, "Elm" nəşriyyatı, 1978, 599 s.*

34. *Köçərli Firidun bəy. Azərbaycan ədəbiyyatı. 2 cilddə. 1ci cild. Transliterasiya edəni: Ruqiyyə Qənbər qızı. Bakı, "Elm" nəşriyyatı, 1981, 460 s.*

35. *Qarabağnamələr. I kitab. Bakı, Yazıçı, 1989, 192 s.*

36. *Qarabağnamələr. II kitab. Bakı, Yazıçı, 1991, 450 s.*

37. *Qarabaği Mirzə Həsən Yüzbaşov. Seçilmiş əsərləri. Tərtib edəni: Nəsrəddin Qarayev. Bakı, "Şuşa" nəşriyyatı, 2000, 184 s.*

38. *Qaradaği (Xan-Qaradağski) Həsənəli ağa. Fələyin bir belə dövrü olacaqmış...(şeirlər, tərcümələr, tarixi salnamə). Tərtib edən: R. Kərimov; məsləhətçi və ön sözün müəllifi: V.Qaradağlı. Bakı, «Azərbaycan Milli Ensiklopediyası» NPB, 2003, 280 s.*

39. *Qarayev N. C.Cabbarlının naməlum bir məqaləsi // "Bakı" qəzeti, 23.04.1965.*

40. *Qarayev N. Əbdülxalıq Cənnətinin əlyazmaları haqqında // Respublika Əlyazmaları Fondunun Əsərləri, II cild, Bakı, 1963, s. 131-138.*

41. *Qarayev N. Həsən Qarabaği // "Şuşa" qəzeti, 1967, 8, 12 iyul.*

42. *Qarayev N. Xalq təbabətinə aid maraqlı bir əlyazması // Azərbaycan tibb curnalı, 1967, № 3.*

43. *Qarayev N. Xurşidbanu Natəvan haqqında yeni məlumat. Natəvanın Qarayev N.Nəvvaba qeyri-mətbu mənzum məktubu // Azərbaycan, 1962, № 8, s. 218-219.*

44. *Qarayev N. Məhəmmədəli bəy Məxfi // "Şuşa" qəzeti, 1967, 26 sentyabr.*

45. *Qarayev N. Məşədi Əyyub Baki // "Şuşa" qəzeti, 1967, 26 sentyabr.*

46. *Qarayev N. Mirzə İsa Xəyali // Elm və həyat, 1973.*

47. *Qarayev N. Molla ağa Bixud // Elm və həyat, 1969, № 7, s. 24-25.*

48. *Qarayev N. Molla Cümənin yeni əlyazmaları // Azərbaycan gəncləri, 20.01.1961.*

49. *Qarayev N. Molla Mahmud Zui və onun divanı // Əlyazmalar xəzinəsində, V cild, Bakı, 1979, s. 39-44.*

50. *Qarayev N. Saleh Şirvani // Keçmişimizdən gələn səslər, II buraxılış, Bakı, 1982, s. 90-118.*

51. *Qarayev N. Şair-pedaqoq (Həsənəli xan Qaradağı haqqında) // "Şuşa" qəzeti, 23.12.1971.*

52. *Qarayev N. Şairə Məşədixanım Leyla // Azərbaycan qadını, 1962, № 8 .*

53. *Qarayev N. "Təzkireyi-Ziyai" və "Təzkireyi-Nəvvab" haqqında bəzi qeydlər // Əlyazmalar xəzinəsində, IV cild, Bakı, 1976, s. 78-87.*

54. *Qasir Mirzə İsmayıl. Şeirlər. Toplayanı: İshaq Axundov. Tərtib edənlər: T.Nurəliyeva, P.Kərimov. Bakı, "Yazıçı" nəşriyyatı, 1988, 198 s.*

55. Qasımzadə F. XIX əsr Azərbaycan ədəbiyyatı tarixi. Bakı, Maarif, 1974, 250 s.

56. *Qədimov Ə. Məhəmməd Tağı Sidqinin həyat və yaradıcılığı. Bakı, Çaşıoğlu, 2004, 151 s.*

57. *Qüdsi Mirzə Həsib. Mehriban qardaş tək ülfət eyləyək. Bakı, Nurlan, 2004, 82 s.*

58. Makulu P. Ədəbi məlumat cədvəli. Bakı, 1962.

59. *Məxfi Məhəmmədəli bəy. Qəzəllər. Tərtib edəni: R. Kərimov. Bakı, "Şuşa" nəşriyyatı, 2001, 216 s.*

60. Məmmədov B. Fatma xanım Kəminə, "Elm və həyat", 1966, N 12.

61. *Məmmədov Ə. Mirzə İsmayıl Qasir Axundovun mənzum satirik əsərləri // Keçmişimizdən gələn səslər. 1983, N 3, s. 123.*

62. Məmmədov Ə., Dadaşov M., Talışlı M. Seyid Əzim Şirvaninin müasiri Qasir // Ədəbiyyat və incəsənət qəzeti, 1959, 25 iyul, N 29.

63. Mirbağırov K. Füzuli və XIX əsr Azərbaycan ədəbiyyatı / "Azərbaycan" curnalı, 1958, N 12.

64. Mir Cəlal. Əbdülxalıq Cənnəti // Azərb. EA Nizami adına Ədəbiyyat İnstitutunun əsərləri, I c. Bakı, 1946.

65. Mirzə Məhəmmədhəsən. Nalə. Bakı, 1916, s. 3-4.

66. Mirzəzadə Y. Talış tarixinə aid qiymətli bir əlyazması // Azərb. EA Respublika əlyazmalar Fondunun əsərləri, 1961, c. 1.

67. *Müctəhidzadə Məhəmmədağa. Riyazül-aşiqin. Çapa hazırlayan: Əkrəm Bağırov. Bakı, "Azərbaycan" nəşriyyatı, 1995, 248 s.*

68. Mümtaz Salman. Nəsrullah Didə. Bakı, 1928.

69. Mümtaz S. El şairləri. Bakı, 1928.

70. *Mümtaz S. Azərbaycan ədəbiyyatı. El şairləri. Bakı, Nurlan, 2005, 462 s.*

71. *Nağısoylu M. A.Bakıxanovun "Riyazül-qüds" əsəri klassik tərcümə nümunəsi kimi. Bakı, Nurlan, 2006, 161 s.*

72. *Nakam İsmayılbəy. Məcnun və Leyli. Nəşrə hazır.: Y.Piriyev. Bakı, Nurlan, 2007, 190 s.*

73. *Natəvan Xurşidbanu. Əsərlər. Tərtib edəni: Bəylər Məmmədov. Bakı, "Yazıçı" nəşriyyatı, 1984, 100 s.*

74. *"Necə qan ağlamasın daş bu gün". Mərsiyə, qəsidə və sinəzənlər. Tərtibçi: İ.Qəribli. Bakı, "Yazıçı" nəşriyyatt, 1993, 144 s.*

75. Nemətova M. İki Gəncə həkkak-xəttatının işi haqqında // Azərb. SSR EA Xəbərləri, ictimai seriya, 1959, N 8, s. 29.

76. Nəbati Seyid Əbülqasim. Əsərləri. Tərtib edəni: Əbülfəzl Hüseyni. Bakı, Azərbaycan EA nəşriyyatı, 1968, 334 s.

77. *Nəvvab Mir Möhsün. Vüzuhül-ərqam. Bakı, Elm, 1989.*

78. *Nəvvab Mir Möhsün. Təzkireyi-Nəvvab. Çapa hazırlayanı: Əkrəm Bağırov. Bakı, "Azərbaycan" nəşriyyatı, 1998, 560 s.*

79. *Nəvvab Mir Möhsün. Divan. Çapa hazırlayanlar: Əli Məmmədbağıroğlu, Arif Ramazanov, Raqub Kərimov. Bakı, "Şuşa" nəşriyyatı, 1999, 192 s.*

80. *Nəvvab Mir Möhsün. 1905-1906-cı illərdə erməni-müsəlman davası / Nəşrə hazırlayanlar: A.Ramazanov, K.Şərifov. Bakı, Şuşa, 1993, 126 s.*

81. *Nəvvab Mir Möhsün. Nəsihətnamə (Seçilmiş parçalar) / Nəşrə hazırlayanı: M.Q.Məmmədova. Bakı, Yazıçı, 1987, 80 s.*

82. *Növrəs Mirzə Ələsgər. Şeirlər. Tərtibçilər: Şamil Cəmşidov, Növrəs Növrəsli. Bakı, "Yazıçı" nəşriyyatı, 1985, 158 s.*

83. *Ordubadi Fəqir. Ağlar qələnı əlimdə. Tərtib edəni: Əsgər Qədimov. Bakı, "Yazıçı" nəşriyyatı, 1989, 232 s.*

84. *"Poetik məclislər". Toplayanı və tərtib edəni: Nəsrəddin Qarayev. Bakı, "Yazıçı" nəşriyyatı, 1987, 528 s.*

85. Rahim M. Natəvan // "Vətən uğrunda" curnalı, 1943, N 8-9.

86. *Rəhimova A. Mirzə İsmayıl Qasir. Bakı, Nurlan, 2002, 131 s.*

87. Rüstəmov S. Lənkəran və Talış tarixi haqqında nadir bir əlyazması // Azərb EA Məruzələri, XII cild, 1956, N 3.

88. *Saqib Haşım bəy. Divan / Nəşrə haz.: Hacı Mustafa Mailoğlu. Bakı, Nurlar, 2009.*

89. *Seyid Nigari. Xaki-paynı taci-sərim. Tərtib edən: Yəhya Çələbi. Bakı, "Azərbaycan" nəşriyyatı, 2004, 336 s.*

90. Sidqi. Seçilmiş pedaqoci əsərləri. Bakı, 1967Şuşinski F. Böyük tarzən // Ədəbiyyat və incəsənət qəzeti, 1961, 9 dekabr, N 48.

91. *Sona Xəyal. Əliabbas Müznib Bakı və Bakılı şairlər haqqında. Bakı, Nurlan, 2003, s.*

92. *Sona Xəyal. Əlli yaşlı xəzinədən əlli məqalə. Bakı, Ünsiyyət, 2000, 144 s.*

93. *Şahin Fazil. Təzkireyi-Şahin. Bakı: MBM, 2006.*

94. Şərif Ə. Görkəmli şair və müəllimimiz // Şərq qapısı, 1955, 18 noyabr.

95. Şuşinski F. Segah İslam // Bakı qəzeti, 1968, 15 may, N 111.

96. Şirvani Seyid Əzim. Əsərləri. 3 cilddə. I cild. Tərtib edəni: Süleyman Rüstəmov. Bakı, Azərbaycan EA Nəşriyyatı, 1967, 742 s.

97. Şirvani Seyid Əzim. Əsərləri. 3 cilddə. III cild. Tərtib edəni: Süleyman Rüstəmov. Bakı, "Elm" nəşriyyatı, 1974, 500 s.

98. Tağızadə A. Nadir istedad (M.Nəvvab haqqında). "Azərbaycan müəllimi" qəzeti. 8 yanvar 1967, N 3 (1852).

99. *Tərbiyət Məhəmmədəli. Daneşməndani-Azərbaycan. Bakı, Azərbaycan Dövlət nəşriyyatı, 1987, 464 s.*

100. *Vaqif Əbülhəsən Kamranzadə. Şeirlər. Tərtib edəni: Cənnət Nağıyeva. Bakı, 2000, 55 s.*

101. *Vardani Mücrim Kərim. Sünbülüstan. Toplayanı və tərtib edəni: Əzizə Cəfərzadə. Bakı, "Gənclik" nəşriyyatı, 1978, 80 s.*

102. Vazeh Mirzə Şəfı. Nəğmələr. Bakı, Uşaqgəncnəşr, 1961, 126 s.

103. *Vazeh Mirzə Şəfı. Şeirlər məcmuəsi. Tərtib edəni: H.Məmmədzadə. Bakı, "Elm" nəşriyyatı, 1987, 240 s.*

104. *Yusif Mirzə Əbdülxaliq. Diriltdi aləmi eşqin nidası.../ Nəşrə haz.: Sona Xəyal. Bakı, Nurlan, 2002, 127 s.*

105. *Yusifova X. Haşım bəy Saqib və onun əlyazmaları haqqında // Elm qəzeti, 2002-ci il, 5 aprel.*

106. *Zakir Qasım bəy. Əsərləri. Tərtib edəni: S.Rüstəmov, Bakı, Azərbaycan EA nəşriyyatı, 1964, 564 s.*

107. Zeynallı H. Azərbaycanda Mirzə Fətəli əsri // İnqilab və mədəniyyət, 1928, N 3, s. 10-11.

**Rus dilində**

108. Enikolopov A. Poet Mirza Şafi. Baku, 1938.

109. Koçarlinskiy F. Literatura Azerbaydcanskix tatar. Tiflis, 1903.

110. Seidzade A. Mirza-Şafi Vazex. Baku, 1969.

**Dövri nəşrlər**

111. “Şərqi-rus” qəzeti,1904, 4 yanvar.
112.“Şərqi-rus” qəzeti,1904, 23 yanvar.
113.“Şərqi-rus” qəzeti,1904, 30 yanvar.
114.“Əkinçi” qəzeti, 1876, N 7.
115.“Əkinçi” qəzeti, 1875, 18 noyabr, N 4.
116.“Azərbaycan gəncləri” qəzeti, 1965, 1 avqust, N 91.
117.“Ziyayi-Qafqaziyyə”, 1898, N 5.
118.“Qızıl qələm” məcmuəsi. 1924, N 4.
119.“Babayi-Əmir”, 1916, N 32, s. 6.
120. “Dirilik”, 1916, N 11.

## XIX əsrdə və XX əsrin əvvəllərində eyni təxəllüslə yazan Azərbaycan şairləri və musiqiçiləri

Azər, İbrahim bəy
Azər, Məşədi Buzovnalı

Arif, Mustafa ağa
Arif, Cəfərqulu xan (Nəva, Xan)

Asi, Abdulla bəy
Asi, İbrahim Səlyani
Asi, Məhəmmədismayıl Buzovnalı

Aşiq, Əbdüssəməd bəy
Aşiq, Məhəmməd bəy
Aşiq, Mirzə Əli
Aşiq, Məhəmməd Varxiyanlı
Aşiq, Mirzə Rəhim (Fəna)

Bixud, Ağababa Lənkərani
Bixud, Molla Ağa Şirvani
Bixud, Qarabaği

Bülbül, Molla Məhəmməd Qaryağdı, şair-xanəndə
Bülbül, Molla Saleh, şair-xanəndə
Bülbül Dərbəndi
Bülbülcan, Əbdülbağı xanəndə

Vəfa, Mehdiqulu xan
Vəfa, Məhəmməd Şirvani

Qafil, Ələkbər Şirvani
Qafil, Məhəmməd Qubalı
Qafil Lənkərani

Qüdsi, Abbasqulu ağa
Qüdsi, Ağarəhim Vənəndi
Qüdsi, Şeyx İbrahim
Qüdsi, Mirzə Həsib

Zakir, Qasım bəy
Zakir, Molla Qasım Qarabaği
Zakir, Molla Qasım Şəkili
Zakir, Molla Qasım Şirvani
Zakir, Molla Məhəmməd Göyçayi

Sabir, Mirzə Ələkbər
Sabir, Mirzə Əhməd Qarabaği
Sabir, Mirzə Teymur

Sadıq, Balasadıq
Sadıq, («Sadıqcan») Əsəd bəy oğlu – tarzən
Sadıq, İman xan oğlu
Sadıq, Mirzə Lətif oğlu

Səbur, Baxış bəy Qarabaği
Səbur, Mirzə Ələkbər Qarabaği

Sədi Sani Qarabaği
Sədi Salis Göyçayi (Qantəmirin atası)

Səfa, İbrahim Qarabaği
Səfa, Məhəmməd Şirvani
Səfa, Mirzə Haqverdi Qarabaği

Sidqi, Məmmədtağı
Sidqi, Sadıq Həsənzadə

Mücrüm, kərim Vardani
Mücrüm, Məhəmməd Lənkərani

Naseh, Ağaəli bəy
Naseh, Şeyx İbrahim (Qüdsi)

Naci, Mirzə Qədir Şirvani,
Naci, Mirzə Mehdi (Təbib)

Növrəs, Mirzə Ələsgər Qarabaği
Növrəs, Mirzə Əbdüləhəd Lənkərani

Təbib, Mirzə Məhəmməd Qubalı
Təbib, Mirzə Mehdi (Naci)
Təbib, Mirzə Ələsgər Lənkərani
Təbib, Mirzə Heydərqulu Qarabaği

Fazil, Dərbəndi
Fazil, İrəvani

Faiz, Qafur Əfəndizadə (Qantəmir)
Faiz Qarabaği
Faiz, Molla Əhməd Dərbəndi

Fəna, Mirzə Bəybaba (F.Kəminənin atası)
Fəna Mirzə Rəhim

Xəyali, Mirzə İsa
Xəyali, Mirzə Möhsün

Çakər, Qasıməlm Naxçıvani
Çakər, Lənkərani
Çakər, Mirzə Hüseyn Qarabaği

Şahin, Əbdül Qarabaği
Şahin, Mirzə Abbas Nardarani

Şeyda, Qəmər bəyim
Şeyda, Əlabbas
Şeyda, Yəhya bəy Qarabaği

MÜNDƏRİCAT